**“Müasirlərim” seriyasından: Hacı Soltan Əlizadə**

SONA XƏYAL



# HACI SOLTAN ƏLİZADƏ



Nəşriyyat - Mətbəə
APOSTROF-A
Publishing & Printing
BAKI – 2021

***AMEA-nın Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun elmi şurasının 19 yanvar 2021-ci il tarixli (1 saylı) iclasının qərarı ilə çap olunur.***

Redaktor və ön söz müəllifi:
**Əzizağa Nəcəfzadə**

Rəyçilər:
**Paşa Kərimov**
filologiya üzrə elmlər doktoru
**Tahirə Həsənzadə**
tarix üzrə elmlər doktoru
**Hacı Həsən Hüseyni**
dinşünas

Sona Xəyal (Sonaxanım Hadiyeva). Hacı Soltan Əlizadə. Bakı-2021.

Sona Xəyalın “Müasirlərim” seriyasından olan 25-ci kitabı Qafqaz Müsəlmanları İdarəsinin Xəzər rayonu üzrə Qazisi, idarənin nəzdində yerləşən Elmi-dini şuranın üzvü, Buzovna Cümə məscidinin axundu, Buzovna dini icmasının başçısı, Buzovna “Əli ayağı” ziyarətgahının fəxri axundu, Azərbaycan Jurnalistlər birliyinin üzvü, Azərbaycan Yazıçılar Birliyinin üzvü, bir çox fəxri adların, mükafatların, diplomların laureatı Hacı Soltan Əlizadənin həyat və yaradıcılığından bəhs edir. Kitabda Hacı Soltanın əsərləri ilə yanaşı onun haqqında yazılmış məqalə və şeirlərdən də istifadə olunmuşdur.

## NURLU SİMA, YAXUD ZİYA BƏXŞ EDƏN İNSAN

Tələbəlik illərindən tanıdığım, Bakı Dövlət Universitetinin filologiya fakültəsində bizə böyük bacı kimi doğru istiqamət verən həmkarımız, hər zaman elmə, təhsilə can atan Sona Xəyal artıq illərdir ki, iş yoldaşımdır. 2014-cü ildən üzü bəri onun fədakar əməyi sayəsində onlarla kitab çap etdirdiyinin şahidi olmuşam. Bu kitablar içində Sona xanımın çox yüksək səviyyədə ərsəyə gətirdiyi fundamental tədqiqatları, incə ruhla qələmə aldığı bədii yaradıcılıq nümunələri və transliterasiya etdiyi, tərtib etdiyi əsərlər də var. Hər il azı beş kitab ərsəyə gətirən Sonaxanım Hadiyeva bu gün gənc ziyalılara elm fədaisi olmağın bir nümunəsidir.

Sona xanımın nəşrə hazırladığı kitablar içərisində "Müasirlərim" seriyasından olan kitablar var ki, daim məndə və mənim kimi digər elm-təhsil işçilərində maraq doğurur. Sona Xəyal bu xeyirxah əməli ilə özünü el yolunda fəda edən qiymətli ziyalıları daha geniş xalq kütləsinə tanıdır. Bu kitablar həyatda özünə ideal axtaran gənc nəslin nümayəndələri üçün çox faydalıdır.

Əziz oxucular, sizin mühakimənizə təqdim olunan bu kitab da həmin xeyirxah addımlardan biridir.

Sona Xəyal haqqında danışdığım "Hacı Soltan Əlizadə" adlı kitabını mənə təqdim edəndə sevindim. Mənə kitabın redaktoru və ön söz müəllifi olmağı təklif etdikdə isə məmnuniyyətlə razılıq verdim. Çünki Hacı Soltan Əlizadə tanıdığım insanlar içində öz yüksək mədəniyyəti və intellekti ilə

seçilən ziyalılarımızdandır. Onun haqqında oxumaq da, yazmaq da insana yalnız fərəh bəxş edir.

Qeyd edim ki, Hacı Soltanla şəxsi dostluğum yoxdur. Onunla yol yoldaşı da olmamışam. Lakin onu tanıyıram desəm də, səhv etmərəm. Tədbirlərdə, məclislərdə onun nitqlərini eşitmişəm. Hər nitqində möhkəm rabitə, dərin məntiq, hikmət və geniş auditoriyaya ünvanlana biləcək sadəlik var. Onun yaradıcı təfəkkürünün məhsulu olan nitqləri həm məzmun, həm də ifadə tərzi ilə fərqlənir. Bu onu tanımaq üçün mənə kifayət edib. Çünki belə nitqlərin müəllifi olan şəxs yalnız müsbət ideallarla yaşayan insan ola bilər. Niyyət və məqsədi ali olan şəxs heç zaman başqalarına zərər verə bilməz. Belə insandan cəmiyyət yalnız fayda görə bilər.

Onu tanımaq üçün zəkasının məhsulu olan kitablarını da oxumaq kifayətdir. Necə ki, biz dahi Nizamini, Füzulini, böyük Seyid Əzimi onların əsərləri əsasında tanıyıb, sevmişik, Hacı Soltanı da bu minval ilə tanıya, sevə bilərik. İstər onun şeirlərini, istər publisistikasını, istərsə də dini, ədəbi, tarixi mövzularda olan tədqiqatlarını oxuduqda gözümüz önündə əqidəli, dürüst insan obrazı canlanır.

Hacı Soltan Azərbaycan və Yaxın Şərq klassik ədəbiyyatı nümunələrindən böyük bir qismini əzbərdən bilir. Hacının müəllifi olduğu mənə bəlli olan otuz kitabı içində ixtisasımla sıx bağlı “Şah İsmayıl Xətai”, “Xətai və Füzuli”, “Məhəmməd Əmin Rəsulzadə və İslam”, “Həzrət Əli (ə) və dünya ədəbiyyatı” kimi araşdırmalarının nəzərimdə öz yeri, öz çəkisi var. Bu kitablar onu klassik ədəbiyyatımızın mükəmməl bilicisi kimi tanıdır. Hacı Soltan Nizamidən, Nəsimidən, dünya ədəbiyyatının klassikləri Hafizdən, Sədidən və başqa mü-

əlliflərdən ayrıca əsər qələmə almasa da, onları da tədqiq etmək iqtidarında olan bir ədəbiyyat xiridarıdır. Bunu mən Bakının Hövsan kəndində yerləşən Mirzəağa Əliyev adına Mədəniyyət Evində tanınmış ədəbiyyatşünas alim Vərağa Almasovun təşkilatçılığı ilə keçirilən tədbirlərdə dəfələrlə müşahidə etmişəm və əminliklə söyləyirəm.

Axund Hacı Soltan Hüseynqulu oğlu həm də sinədəftərdir. O, Azərbaycan və Yaxın Şərq klassik ədəbiyyatı nümunələrindən böyük bir qismini əzbərdən bilir. Gözəl bədii qiraət tərzi ilə bu qiymətli xəzinəni gənclərə sevdirə bilir. Hacı mütaliə mədəniyyəti ilə də müasir gəncliyə bir örnəkdir.

Hacı Soltan qeyd etdiyim kimi, çağdaş ədəiyyatımızda az rast gəlinən "Divan" bağlamış şairlərimizdəndir. O, yaralı aşiq könüllərinə su səpən incə ruhlu lirik və gənc nəslə hidayət yolunu göstərən didaktik şeirlərin də müəllifidir. Onun qəzəlləri, təxmisləri, rübailəri, tuyuğ və dübeytləri öz orijinallığı ilə seçilir. Hacı Soltan Hüseynqulu oğlu ənənənin davamçısı olsa da, orijinallığı ilə də fərqlənə bilib.

Hacı Soltan "Sağlam bədəndə sağlam ruh olar" şüarının aktiv təbliğatçılarındandır. Onun mənəvi-əxlaqi tərbiyə ilə yanaşı, fiziki tərbiyəyə də böyük önəm verməsi tərtib etdiyi "İslam idman antalogiyası", müəllifi olduğu "İslamda idman və boks şahı Məhəmməd Əli", məşhur güləşçi, olimpiya və dəfələrlə dünya çempionu olmuş İmaməli Həbibiyə həsr etdiyi "Mazandaran pələngi" kimi kitablarından da bəlli olur.

Hacı Soltan "Azərbaycan dərvişləri və rövzəxanları" adlı mükəmməl toplunun müəllifi olsa da, heç zaman tərki-dünya olmayıb, hər zaman xalqın arasında görünüb, el-obanın xeyir-şərində öndə gedənlərdən olub. "Yaşamaq, yaşatmaq

və yaratmaq" onun həyat devizidir desəm, əlbəttə ki, yanılmaram.

Haqqında danışdığım bu nurlu insan hər zaman xalqının, Vətəninin xidmətində durmağı özünə şərəf bilmişdir. Xeyriyyəçilik onun həyat kredosudur. O, daim xeyirxah əməllərin təşviqatçısı və təbliğatçısı kimi çıxış edir. Gənc nəsli də bu ruhda tərbiyə etməyi özünə borc bilir. Soltan Əlizadə şeirlərindən birində deyir:

Soltanam, eşqilə bu cani-həzinim doludur,
Yoxdusa canı fəda etməyin hərgah, yana dur,
Bu Vətən eşqi ki var, eyni hidayət yoludur,
Rahi-eşq, rahi-Vətən, rahi-hidayətdi mənə.

Hacı Soltan eyni zamanda bir vətənpərvərdir. Bu gün onun vətənpərvərlik mövzusunda olan şeirləri şəhidlərimizin müqəddəs ruhuna hörmət, igid oğullarımızın biləyinə qüvvət, qazilərimizin əməlinə qiymət, canlarını Vətən yolunda qurban verən həmvətənlərimizin yaxınlarına təsəllidir. Hacı Soltanın "Qarabağ azad olan gün", "Azərbaycan yaşasın", "Vətən", "Şuşa" kimi şeirləri 44 günlük Vətən müharibəsində gənc əsgər və zabitlərimizin dilinin əzbəri olmuşdur. Onun düşmənə qarşı birliyə çağırışı xalqımızı qələbəyə ruhlandırmışdır. Çünki bu səsləniş təkcə bir şairin deyil, həm də bir ruhaninin, bir din xadiminin xitabıdır. Soltan deyir:

Ey müsəlman, yetişib vaxt, gəlin əlbir olaq,
Tutaraq düşmən önündə əl-ələ zəncir olaq.
Belə əyyamdə məzhəb və təriqət nə gərək,
Birləşib əzm ilə kafər başına şəmşir olaq.

Göründüyü kimi, onun Vətən mövzulu şeirləri sadə və təsirlidir. Bunun üçün də gənclərin dilinin əzbəridir. Müəllifin "Azərbaycan bayrağı" şeirindəki aşağıdakı misralar da sadədir, amma sadə olduğu qədər də həyatidir:

Başımızın tacıdır Azərbaycan bayrağı,
Hər bayraqdan ucadır Azərbaycan bayrağı!

Fikrimi bu misralarla bitirib, Sonaxanım Hadiyevanın (Sona Xəyal) hazırladığı bu kitabı mühakimənizə təqdim edirəm. Düşünürəm ki, vətənpərvər, xeyirxah, hidayət yolunun saliki olan bir şəxs haqqında oxumaq, bu nurlu sima sahibini, ətrafına ziya bəxş edən insanı tanımaq sizə də zövq verəcəkdir.

***Əzizağa Nəcəfzadə***
***AMEA-nın Məhəmməd Füzuli adına***
***Əlyazmalar İnstitutunun elmi katibi,***
***filologiya üzrə fəlsəfə doktoru, dosent***

# HACI SOLTAN FENOMENİ

Allah-təala hər bir insanı dünyaya göndərəndə onun içində bilqüvvə şəklində bütün fəzilətləri və rəzalətləri qoymuş olur. İnsan faili-muxtar olduğu üçün seçim onundur, istər fəzilətləri qabarda5*2r, istər rəzalətləri. İnsanın inkişaf və tərbiyəsində genin, yaşadığı mühitin, şəraitin böyük rolu vardır. Bir sıra pedaqoqlar geni əsas götürürlər. Bəzən eyni valideynin övladları müxtəlif əqidədə olur. Kimi anaya, kimi ataya, kimi babaya, nənəyə oxşayır. Bəzən deyirlər ki, “Görən bu kimə oxşayıb, bizdə belə adam yoxdur”, o zaman yeddi arxa dönəninə kimi yoxlama aparmaq lazım gəlir. Gen mütləq özünü göstərir. Ətraf mühit,  tərbiyə insanı nə qədər dəyişsə də gen çox şey deməkdir. Peyğəmbərimiz (s) buyurmuşdur ki, övlad valideynin güzgüsüdür. Bəzi pedaqoqlar ətraf mühiti, şəraiti əvvəldə görürlər. Düşünürlər ki, genində rəzalətlərin çox olduğu uşaq yaxşı mühitə düşsə, fəzilət sahibi ola bilər və ya əksinə. Bəziləri isə düşünür ki, uşaq evdə, məktəbdə yaxşı tərbiyə görsə, bu onun genini dəyişə bilər...

Qafqaz Müsəlmanları İdarəsinin Xəzər rayonu üzrə Qazisi, idarənin nəzdində yerləşən Elmi-dini şuranın üzvü, Buzovna Cümə məscidinin axundu, Buzovna dini icmasının başçısı, Buzovna “Əli ayağı” ziyarətgahının fəxri axundu, Azərbaycan Jurnalistlər birliyinin üzvü, Azərbaycan Yazıçılar Birliyinin üzvü, bir çox fəxri adların, mükafatların, diplomların laureatı Hacı Soltan haqqında bu kitabı yazmağa başlayanda pedaqoqların bu haçalanmış fikirləri niyə beynimə gəldi? Onun haqqında heç onu tanımadığım vaxtlarda bir buzovnalı müəllimdən eşitmişdim ki, “məktəblə o qədər də arası olmayıb,

"amma bu qədər savad, bilik qazanıb"...

Hacı Soltan Hüseynqulu oğlu ata adından da göründüyü kimi, dindar nəslin nümayəndəsidir. O, 1958-ci il dekabrın 21-də Bakının Buzovna qəsəbəsində dünyaya göz açmışdır. Sovet dövründə uşaqlar adətən tez böyüyüb məktəbə getmək istədikləri vaxtlarda balaca Soltan məktəbə deyil, məscidə getmək istəmişdir. Uşaq yaşlarından dinə bağlı olmasını Bəsirət Nadir oğlu "O hər gün məscidə namaz qılmağa gedərdi..." adlı xatirəsində bizə belə çatdırır: "Yaxşı yadımdadır, 1965-ci il olardı. Rəhmətlik nənəmgilin qapısından hər gün günorta vaxtı başında ağ araqçın təxminən 7 yaşı olan bir oğlan keçib gedərdi. Bu mənim diqqətimi cəlb etmişdi. Maraqlandım ki, görəsən kimdir və hara gedir? Mənə dedilər ki, bu oğlan yaxınlıqda yaşayan Hüseynqulu kişinin oğlu Soltandır. O hər gün bu yol ilə "Məşhədi-Qərib" məscidinə namaz qılmağa gedir. Sovetlər dönəmində, dinin yasaq olduğu bir dövrdə 7 yaşlı bir nəfər namaz qılır, məscidə gedir, Quran oxuyur. Bir çoxlarına bu qəribə gəlirdi. Bəziləri də o vaxt buna təəccüblənirdilər. Bax, mən Hacı Soltanı o dövrlərdən tanıyıram" (sms[1]. səh.78).

Hamını təəccübləndirən balaca Soltan məktəbdə oxuduğu zamanlarda da, sovet dövrünün qadağalarına baxmayaraq, məktəbdən qaçıb məscidə gedərmiş. Balaca Soltanı məktəbdən məscidə aparan qüvvə yəqin ki, onun genindən gəlirdi. Məktəbdə keçirilən tədbirlər onun üçün maraqlı deyildi, onu çəkən məsciddəki ayinlər idi. Axunddan, molladan aldığı dini bilgilər onun beyninə daha tez işləyirdi...

---

[1] Söz mülkünün Soltanı. Bakı-2008.

Akademik Vasim Məmmədəliyev "Axund, qazi, maarifçi, şair Hacı Soltan" adlı məqaləsində yazır: "Dini mühitdə tərbiyə alıb yetişmiş Hacı Soltan uşaqlıqdan islam dininə, Qurani-Kərimə, ərəb və fars dillərinə, tariximizə, klassik ədəbiyyatımıza, əruza böyük maraq göstərmiş, geniş mütaliə sahəsində bu sahələrin hər birinə dair lazımi bilik əldə etmişdir.
Hacı Soltan əmisi Molla Həsəndən, atasının bibisi Ümmileyladan Quran oxumağı öyrənmiş, mərhum Axund Məşhədi Məzahirin yanında dini təhsil almışdır. Hacı Soltan gənclikdə dərvişliyə meyl göstərmiş, Bakının Kürdəxanı kəndindən olan ustad dərviş rəhmətlik Əlisöhbətdən bu sənətin sirlərini öyrənmişdir. Hacı Soltan gənc yaşlarından Buzovnanın və Abşeron kəndlərinin xeyir-şər məclislərində, İmam Hüseyn təziyəsində fəal iştirakı, şirin söhbətləri, xoş rəftarı və gözəl əxlaqı sayəsində Bakı camaatının hörmətini qazanmış, ağsaqqal din xadimlərindən birinə çevrilmişdir" (sms. səh.8-9).

Bəli, Hacı Soltan Axund Məşhədi Məzahirdən dini dərs alır, islam əxlaqını öyrənir. Məşhədi Məzahir isə belə deyirmiş: "...Mən öz övladlarıma vəsiyyət etmişəm ki, ədəbi, əxlaqı, ailə və cəmiyyət içərisində gözəl davranışları Soltandan öyrənsinlər. Çünki Soltan mənim ən tərbiyəli və ən hafizəli tələbələrimdəndir..." (sms.səh.155). Dərviş Əlisöhbət isə belə demişdir: "...Baxmayaraq ki, Soltan mənim oğlum yaşındadır. Amma mən onu özümə din qardaşı sayıram. Kaş belə dinə məhəbbət edən gözəl cavanlarımız çox olaydı..." (yenə orada).

Soltan Əlizadə hamı kimi dövrün qayda-qanununa uyğun, 125 saylı məktəbin səkkizinci sinfini bitirib, 55 saylı texniki-peşə məktəbinə daxil olur və qaynaqçı peşəsinə yiyələnir.

Amma Soltan qaynaqçı olurmu?.. Peşə məktəbini bitirib Uzaq Şərqə əsgəri xidmətə göndərilir. Ordudan tərxis olunandan sonra Neft Daşlarında dəmirçi-qaynaqçı kimi çalışır... Amma Hacı Soltan təkcə qaynaqçımı olur? Xeyir... 206 saylı məktəbin müəllimi Məşhədi Xırdaxanım Həsən qızı "Şeirlərini atam üçün oxuyardı" adlı məqaləsində Hacı Soltanın ömür yoluna qısa ekskursiya edir, xatirələrini oxucularla bölüşür. Müəllif yazır: "1980-ci il məşhur ərəbşünas alim professor Əliəsgər Məmmədov Buzovnada əslən keşləli olan Paşa kişinin evində qonaq olur. Təsadüfən, Soltan da bu qonaqlıqda onunla yaxından tanış olur. Mərhum Əliəsgər Məmmədov Soltan ilə həmsöhbət olub, onun Quran oxumağına, qiraətinə, fəsahətinə heyran olur və ondan harada işlədiyini xəbər alır. Eşidəndə ki, Soltan neft daşlarında fəhlə işləyir, Əliəsgər Məmmədov təəccüb ilə belə deyir: "Sən gərək bu cür istedad ilə ali-dini məktəblərdə təhsil alasan və elm ocaqlarında xidmət edəsən".

Üç gündən sonra Qafqaz Müsəlmanları idarəsinin sədri Şeyxül-islam cənabları Soltanı dini idarəyə çağıtdırıb, ondan imtahan götürüb bildirir ki: "Hörmətli Əliəsgər Məmmədov bizə zəng vurub xahiş edib ki, səni ali dini təhsil almaqdan ötrü Səmərqənd şəhərinə göndərək".

Amma çox təəssüflər olsun ki, o vaxt ali dini təhsil almaq üçün Səmərqəndə getmək arzusuna Soltanın ailə şəraiti imkan vermir..." (sms.səh. 133-134). Hacı Soltan bir müddət öz işində çalışmalı olur.

Hacı Soltan sonralar da həmin iş yerini unutmur və "Neft daşları"nın həm də din xadimi olur. Təsadüfi deyildir ki, illər sonra Hacı Soltana həmin məkandan 13 nəfər möminin

imzası ilə təşəkkür məktubu gəlir: "Bismillahir-rəhmanir-rəhim!

Hörmətli Axund Hacı Kərbəlayi Soltan cənabları!

Sizin "Neft daşları"nın ibadət evinə göstərdiyiniz təmənnasız yardımlarınıza görə Sizə dərin minnətdarlığımızı bildiririk.

"Neft daşları"nın möminləri Sizi böyük ehtiramla yad edir və hər namazda Sizin üçün dualar oxuyurlar.

Belə nəcib əməllərinizə görə Allah köməyiniz olsun.

Vəssəlamu əleykum və rəhmətullahi və bərəkatuh..." (sms. səh.146).

Dövr dəyişir, 1985-ci ildə ölkədə baş verən yenidənqurma dini qadağaları zəiflədir. Get-gedə din azadlığı əldə edən insanların qəlbindəki gizli arzular üzə çıxır. Artıq insanlar məscidə gizli getmirlər. Dini kitablar yazılır, məscidlər bir-bir bərpa olunur, dindarlar açıq fəaliyyətə keçir. Dini dəyərləri öyrənmək üçün imkanlar yaranır. İçində Əhli-beyt (ə.m.) sevgisi olan imanlı insanlar illərlə öyrəndiklərini açıq-aşkar gənc nəslə öyrətməyə səy göstərirlər, bərpa olunan məscidlərdə mədrəsələr açılır. Hər kəndin, şəhərin din xadimləri haqqında məqalələr yazılır, dini qəzetlər, jurnallar fəaliyyətə başlayır. "Əli ayağı" qədəmgahındakı mədrəsədə müəllimim olmuş Hacı Vasif Şeyx Arif oğlu "Əli (ə) şairi və Əlişünas tədqiqatçı" adlı məqaləsində yazır: "O, 1986-cı ildə və indiki Buzovnada, respublika üzrə ilk dəfə olaraq "Məşhədi-Qərib" məscidində dini mədrəsənin təməlini qoymuşdur. (Buzovnada mərkəz məscid olan bu həmin "Məşədi-Qərib" məscididir ki, bu gün "Axund" vəzifəsini icra edən bir çox dini xadimlər bu məsciddən xeyir-dua alıb, nəşvü nüma tapmışlar). Oğlan

uşaqlarına Hacı Soltan özü, qız uşaqlarına isə xanımı dərs verərdi" (sms.səh.27).

Hər işin ilkini çox çətin olur. Öncül olmaq, hələ heç kəsin cəsarət etmədiyi bir işə girişmək insandan mətanət, dəyanət tələb edir. Bunun üçün həm fiziki, həm mənəvi, həm də maddi imkanlar olmalıdır. İnsan özünə inananda Allah güc verir, imkan yaradır. Hacı Soltan da həm özünə, həm də Allahın köməyinə bel bağlayıb bu işə girişmiş, elə ona görə də müvəffəq olmuşdur. Görkəmli Azərbaycan şairi Azər Buzovnalının yadigarı Rəhimağa İmaməliyev "Müəllif haqqında bir neçə söz" adlı yazısında Hacı Soltanın dini fəaliyyəti, tədqiqatları haqqında söz açır və yazır: "Bir həqiqətdir ki, kitabın müəllifi çoxsahəli fəaliyyətlə məşğuldur. Bunu onun doğma kəndindəki "Əli ayağı" ziyarətgahında açılmış mədrəsənin rektoru olmasından, orta məktəblərimizdə klassik ədəbiyyat, islam tarixi, ilahi elmləri tədris etməsindən, tədqiqatçı, daim axtarışda olan ziyalı kimi, klassik Azərbaycan ədəbiyyatından bəhrələnib qəlb oxşayan orijinal şeirlər yazmasından, dövri mətbuat səhifələrində publisistik yazılarla çıxış etməsindən, radio-televiziyada "Qurani-Kərim"ə dair təşkil edilən tarixi, elmi-dini verilişlərdə iştirakından görmək olar. Bütün bunlar göstərir ki, onun yaradıcılığı yüksək qiymətə layiqdir. Axundun əsl, həqiqi qiymətini Şeyxül-islam Allahşükür Paşazadə, Bakı qazisi Hacı Əhməd ağa, Təbriz, Ərdəbil, Məşhəd şəhərlərinin islam biliciləri və Ayətullah Mələkuti, Ayətullah ağayi-Mürəvvic, Höccətül-islam Ocad Nejad, Höccətül-islam ağayi-Yusifpur, şair ağayi-Rəhim Münzəvi, ağayi-Davud və Səlim Müəzzinzadələr və başqaları veriblər..." (sms.səh.186-187).

Hacı Soltan din xadimləri ilə yanaşı alimlər, Əhli-beyt (ə.m.) şairləri ilə də yaxından dostluq etmişdir ki, bu da onun daha çox dini biliklərə yiyələnməsində böyük rol oynamışdır. Maştağadan Əhmədağa Əhmədov, Salavat Ağaəli, Nardarandan Hacı Mail, Hacı Hidayət, Kürdəxanıdan Əlisöhbət, Cəlilabaddan Şeyx Məhəmməd, Basqaldan Hacı Həbib və başqalarından öyrəndikləri onun yetkinləşməsinə, kamilləşməsinə kömək etmişdir. Qafqaz Müsəlmanları İdarəsinin sədri Şeyxülislam Allahşükür Paşazadə "Gözəl insan, böyük alim, nəcib  şəxsiyyət" adlı məqaləsində yazır: "Xalqın ehtiramını, el məhəbbətini qazanmaq da hər kəsə qismət olmur. Bu xoşbəxtliyə yalnız gözəl insani keyfiyyətlərə, ali dəyərlərə malik seçilmiş şəxslər nail olurlar. Alicənablığı, vətənpərvər ruhu, yüksək dəyərlərə sadiqliyi ilə seçilən Hacı Soltan mənsub olduğu xalqın, millətin başını uca, üzünü ağ edən qeyrətli, ləyaqətli Vətən oğludur. Əməlisaleh bəndə kimi Hacı Soltan Uca Yaradanın ona bəxş etdiyi iman, fəzilət nurunu, kəramət payını xalqı ilə bölüşür, bundan böyük qürur və fəxarət duyur. Xalq arasında yüksək nüfuzunu qiymətləndirərək Hacı Soltanı Qafqaz Müsəlmanları İdarəsinin Qazilər Şurasına üzv seçmiş, şərəfli Qazi adına layiq görmüşük" (sms.səh.6).

Dini, ədəbi məclislərin təşkilində böyük səy göstərən Hacı Soltan yüksək aparıcılıq qabiliyyəti, alovlu nitqi, qəlbindəki Əhli-beyt (ə.m.) sevgisi ilə insanların hörmətini qazanmış, tanınmış, məşhurlaşmışdır. Azərbaycan Tibb Universitetinin əczaçılıq kafedrasının müdiri, əczaçılıq elmləri doktoru, professor Hafiz Əliyev "Din xadimi və ədib" adlı məqaləsini belə başlayır: "Bizim doğma Buzovna kəndinin mərasimlərində dəfələrlə Axund Hacı Soltanın çıxışlarını, ayrı-ayrı

dini, tarixi hadisələri necə məharətlə şərh və təhlil etməsini, həmçinin müasir dövr üçün əhəmiyyətinə aid maraqlı mülahizələrini dinləmişəm.

Onun çıxışları mərasim iştirakçıları tərəfindən diqqətlə dinlənilir, o söylədiklərini ədəbi və fəlsəfi baxışlarla əlaqələndirir, məşhur tarixi şəxsiyyətlərə istinad edir, incə ruhlu qəzəllərini, qəsidələrini, şeirlərini oxuyur. Hər dəfə Hacı Soltanın başçılıq etdiyi məclislərdə iştirak etdiyim zaman onun gənclik illəri yadıma düşür. Biz demək olar ki, bir məhəllədə yaşayırdıq. Hələ uşaqlıqdan onun dinə, fars və ərəb dillərinə maraq göstərməsi haqqında danışırdılar...” (sms. səh.51).

Soltan Əlizadəni insanlara sevdirən onun həm də şair olmasıdır. Bizim Azərbaycan xalqı şeiri, sənəti çox sevir. Şair həm də Əhli-beyt (ə.m.) aşiqi olanda, misilsiz olur. Soltan Əlizadə də sözünü Əli (ə) ilə başlayıb, Əli (ə) ilə qurtaran şairlərimizdəndir. “Mən Əli şairiyəm” deyən, Əlinin (ə) şənində kitab-kitab əsərlər yazan şairi kim sevməz ki...

Əhli-beyt (ə.m.) aşiqi olanları Allah da sevir, nəinki insanlar. Allah Hacı Soltana verdiyi qabiliyyətləri ancaq sevimli bəndələrinə verir. Ona görə də çox keçmir ki, ali dini təhsili olmamasına baxmayaraq, dini əqidəsini, savadını, fəaliyyətini nəzərə alıb ona “Axund” vəzifəsi vermişlər, 1988-ci ildə Şeyxül-islamın əmri ilə Buzovna məscidinə axund təyin olunmuşdur.

1990-cı ildə Buzovna kəndinin dindarları, o cümlədən Hacı Arif Əhməd oğlu, Hacı Əmrulla Məşhədi Balahüseyn oğlu, Hacı Ağahüseyn Məşhədi Məzahir oğlu, Hacı İlham Kərim oğlu, Məşhədi Elşad Nəriman oğlu, Məşhədi Nasir Adil oğlu, Hacı Soltan Hüseynqulu oğlu Məşhəd ziyarətinə gedərkən

Təbrizin imam Cüməsi Ayətullah-üzma Mələkuti ağanın qonağı olurlar. Ağa Hacı Soltan ilə maraqlanır, 7 nəfərin şahidliyi ilə onu imtahan edir və dini biliyini yüksək qiymətləndirir. Azərbaycan xalq artisti Hacı Tələt Qasımov "Musiqi biliyi də çox əladır" adlı məqaləsində Hacı Soltanın hər sahədə məlumatlı, bilikli olduğunu ön plana çəkərək, dəyərləndirir və yazır: "Bakı şəhərində bir neçə axunddan xoşum gəlir. Onların birincisi Hacı Soltandır. Mən onun iştirak etdiyi məclisdə axıra qədər əyləşirəm. Axund Hacı Soltanın özünü aparması, sadəliyi, ədəbi, hafizəsi, elmi təhlilləri, natiqliyi, cəsarəti, şairliyi və musiqi biliyi də çox əladır. Məclisə uyğun, məclisə dair etdiyi söhbətlər əvəzedilməzdir. Buzovna əhli fəxr etməlidir ki, belə axundu var..." (sms.səh.101).

Ziyalı, müəllim, aparıcı, molla, axund, fərq etməz, söz danışan, insanlara nəsə demək istəyən və auditoriya tərəfindən anlanılmaq istəyən hər bir natiq öz savadına, biliyinə arxayın olub, tribunaya çıxmalıdır. Əks halda auditoriyada bir xaos yaşanacağı mütləqdir. Hacı Soltan özünə qürrədir, bilir ki, apardığı məclisi, söz demək istədiyi insanları ələ ala biləcək, onları özünə qulaq asmağa səfərbər edə biləcək və özünü sevdirə biləcək. Neftçilər xəstəxanasının baş həkimi Fəxrəddin Cavadov "Biz onunla fəxr edirik" adlı yazısında bunun fitri istedad olduğunu vurğulayır: "Buzovna qəsəbəsinin axundu Hacı Soltan Hüseynqulu oğlu Əlizadə bizim əzizimiz və sevimlimizdir. O, elə bir ruhanidir ki, öz istedadı ilə başqalarından seçilir.

Axund Hacı Soltanın məntiqli moizələri, hikmətli hədis və hekayələri, ortaya qoyduğu tarixi faktları, poeziyadan gətirdiyi nümunələri, hətta din və tibb elmlərinin vacibliyi

barəsində olan incəlikləri Qurani-Kərimin "Loğman" surəsində olan hikmətlər ilə əlaqələndirib həkimanə bir şəkildə insanlara çatdırması ilahi tərəfindən ona bəxş olunmuş fitri istedadın bəhrəsidir" (sms.səh.80).

Bəli, Allah tərəfindən verilən fitri istedad çox şey deməkdir. Nə qədər oxuyursan oxu, öyrənirsən öyrən, Allahdan gələn ilham olmasa, insanlara heç nə verə bilməzsən. Çünki, danışdığın da, yazdığın da insan qəlbinin dərinliyində əks-səda verə bilməz. Hacı Casim Əlisöhbət oğlu "Onu elmə Allah hidayət etmişdir" adlı məqaləsində yazır: "Bəzi insanları Allah-təala ən xoş zamanda dünyaya bəxş edir. Belə xoş anda yaranan insanlardan biri də Hacı Soltandır. Allah-təala Hacı Soltana paklıq, iman, elm, təqva, sədaqət, eşq və yaradıcılıq kimi gözəl, ölçüyəgəlməz xəzinələr hədiyyə etmişdir. Axund Hacı Soltan ali məktəblərdə, universitetdə elm almamışdır. Onu elmə məhz Allah-təala hidayət etmiş və ona bu yolda kömək olmuşdur" (sms.səh.130).

Hacı Soltan təkcə din xadimlərindən eşitdikləri ilə kifayətlənməmiş, əldə etdiyi dini kitabları, klassik əsərləri dönə-dönə oxumuş, öz beyin süzgəcindən keçirmiş, bu da nəticədə onun kitablar tərtib etməsinə, əsərlər yazmasına aparıb çıxarmışdır. Filologiya elmləri namizədi Vərağa Almasov "Qələmini belə çevirmiş mənəviyyat əkinçisi" adlı məqaləsində Hacı Soltanın kitabları ilə tanışlığından söz açır və yazır: "Hacı Soltanın bəlağətli və fəsahətli, amma həm də hövlnak və həyəcanlı nitqini, heç şübhəsiz, çoxları eşidib, nədənsə mənə elə gəlir ki, onun yazıları hövsələ ilə deyə bilmədiklərini təmkinlə demək ehtiyacından doğmuşdur. Axı, o istər içərisində boya-başa çatdığı islami yaşayış

biçiminə söykənən ənənələr baxımından, istərsə də fərdi dünyagörüşü ilə dolu adamdır, doluluq, tutumluluq, dolğunluq isə elə şeydir ki, bir kərə yox, min kərə mütləq özünü göstərir" (sms. səh.88-89).

Elə bu doluluq, bu tutumluluqdur ki, Hacı Soltan istər yazısında, istərsə də şifahi nitqində heç vaxt söz üçün məəttəl qalmır. Saatlarla danışmağa sözü olan, eyni zamanda nitqi ilə insanları yormayan, əksinə auditoriyanı maraqlandıran, məlumat bolluğu ilə təmin etməyi bacaran, nitqində klassikləri xatırlayan, klassik nümunələri əzbərdən deyən Hacı hər şeydən danışır, dünyanı, hadisələri əhatə etməyə, keçmişi gələcəyə birləşdirməyə cəhd edir. Bu da onu dinləyənləri razı salır. Hər kəs öz marağına uyğun nəsə tapır, o məclisdən heç kim əliboş getmir. Hərbi həkim, polkovnik Cabbar Buzovnalı "Ədib, şair, axund" adlı məqaləsində müəllifin kitablarını sadalayır və yazır: "Oxudum bu kitabları. Çox şey öyrəndim. Həzz aldım. Sevindim. Dərk etdim ki, Hacı Soltan yatanları ayıltmaq istəyir. Keçmişləri gələcəyə təhvil verir. İnsanları öz köklərinə, soylarına qaytarır. Öz sağlığında öz heykəlini ucaldır Hacı Soltan. Gələcək insanların həyat proqramı üçün özünün nümunəvi obrazını təqdim edir Hacı Soltan. Onun keçirdiyi yubileylər, məclislər, iclaslar fəqət bir amala xidmət edir: insanlığı sevmək, Vətənə, torpağa məhəbbət, Allaha ibadət, millətə və bütün yaxşı insanlara xidmət, keçmiş tarixi öyrənib, igid və alim babalarımızı tanıyıb, gələcək nəsillərə tanıtdırmaq, daha çox şeylər, çox şeylər" (sms.səh. 108-109).

Həqiqətən, Hacı Soltan gözəl tədqiqatçıdır. İnsanlara həmişə yeni nəsə demək istəyi onda güclüdür. Açarı paslanmış sandıqları açmaq, dərya dibində gizli qalmış xəzinələri

tapmaq, araşdırmaq onun həyat kredosuna çevrilmişdir. Filologiya elmləri doktoru, professor Qəzənfər Paşayev "İlahiyyatçı və ədəbiyyatşünas alim" adlı məqaləsində yazır: "...Buna qədər yalnız Şeyxül-islam Allahşükür Paşazadə tarix elmləri doktoru adına layiq görülmüşdü. Doğrudur, sonralar Qafqaz Müsəlmanları idarəsinin sədr müavini Hacı Sabir Həsənli, idarənin Elm və Təhsil şöbəsinin müdiri Hacı Mirəziz Seyidzadə, Mingəçevir məscidinin axundu Hacı Xanəli Babayev namizədlik dissertasiyaları müdafiə etdilər. Apardığı tədqiqatların həcminə və səviyyəsinə görə əlində rəsmi diplomu olmasa da, mən Hacı Soltanı da bu siyahıda görürəm" (sms.səh.48).

Hacı Soltan bu mərtəbəni üç ilə, beş ilə qazanmamışdır. İslami dəyərlərə sevgi, Əhli-beytə (ə.m.) məhəbbət, elmə, şeirə, sənətə hüsn-rəğbət, bütün bunlar körpəlikdən Allahın ona bəxş etdiyi mənəvi cəhətlərdir ki, Hacı Soltan bunu hələ uşaqkən anlamış, bu nemətlərin qədrini bilmiş, böyük əziyyətlər hesabına içindəki qığılcımı atəşə çevirməyi bacarmışdır. "Kamilliyin zirvəsində" adlı məqaləsində Allahın verdiyi fitri istedaddan, qabiliyyət və bacarıqdan bəhs açan tarix elmləri doktoru Təvəkkül Səlimov Hacı Soltanı hərtərəfli səciyyələndirir və yazır: "Axund Hacı Soltan Hüseynqulu oğlu da zəmanəsinin nadir istedadlı kamil insanlarındandır. Onun istər həyatına, istərsə də yaradıcılığına nəzər saldıqda bu qənaətə gəlirsən ki, Hacı Soltan hər kəsə nümunə olacaq bir şəxsdir. Çünki onun həyat yolu, elmi və bədii yaradıcılığı, ruhani alim özəlliyi hər adam üçün örnək olacaq qədər dəyərlidir. Onu bir neçə parametr üzrə səciyyələndirmək mümkün və vacibdir" (sms.səh.66).

Hacı Soltanın kamilliyini, istedadını, insanlığını, xeyirxahlığını və s. onun haqqında yazılmış bir çox məqalələrdə görürük. İstər alim olsun, istər şair olsun, istər din xadimi olsun, hər hansı ixtisas sahibi, hər hansı peşə sahibi olmasından asılı olmayaraq, bütün müəlliflər onun qeyri-adi istedadını, savadını, bilik və bacarığını ön plana çəkmişlər. 125 saylı məktəbin müəllimi Hacı Nazim Məmməd oğlu yazır: "Allah-təala hər bir bəndəsinə bir-birinə bənzəməyən, özünəməxsusluğu ilə fərqlənən istedad verib. Xoşbəxt o kəsdir ki, öz istedadını uşaqlıqdan tapsın, iç dünyasına vara bilsin, ruhuna, mənəviyyatına nəzarət etsin. Bu istedad ağacını münbit mənəvi mühitdə böyüdüb başa çatdıra bilsin. Şəxsiyyətinə daim hörmət etdiyim Axund Hacı Soltan da bu istedad sahiblərindən biridir. Ona bu dünyada mömin bir din xadimi səlahiyyəti qismət olmuş və bu işin öhdəsindən məncə layiqincə gəlmişdir" (sms.səh.116).

Hər bir qələm əhlinin əsərlərini oxuyanda ilk növbədə onun özünü axtarıram. Əgər əsərdə müəllifin özü yoxdursa, müəllif öz mənini oxucuya açıb göstərə bilməyibsə, mənə maraqlı gəlmir. Əsər boyu axtara-axtara sonda müəllifi tapa bilmirəmsə, o əsəri oxuduğum vaxta heyfsilənirəm. Hacı Soltanın istər şeirlərində, istər tədqiqat əsərlərində onun iç dünyası görünür. Allah eşqi, Peyğəmbər (s) sevgisi, Əhli-beytə (ə.m.) məhəbbət, Vətən eşqi, torpaq sevgisi, xalqa, millətə məhəbbət, şeirə, sənətə hüsn-rəğbət sətir-sətir, misra-misra süzülür. Əməkdar müəllim Tamilla Əmirkişi qızı "Verilən sədəqə öyrədilən elmdən üstün olmur" adlı məqaləsində yazır: "Hacı Soltan əsl vətənpərvərdir. Dövlətçiliyimizə, onun tarixinə, keçdiyi çətin və şərəfli yoluna, ənənələrinə,

ümumən İslam birliyinin müqəddəsliyi yolunda xüsusi baxışları olan bilicidir.

Axund Kərbəlayi Hacı Soltan gözəl natiqdir. Güclü hafizəsi var. Onu dinləyənləri dinlətmək məsiyyətlərinə malikdir. O, xeyirxahdır. Unudulanları yaşatmağa çalışır. Son illərdə respublikamızda ilahiyyat üzrə yetişən alimlər haqqında məlumat verməkdən, tərcümə olunan dini kitablarda mənsub olduğumuz mənəvi keyfiyyətləri gənclərə öyrətməkdən yorulmur...” (sms. səh.112).

Bəli, insan yaşadanda yaşayır. Unudulmağa qoymayanda, unudulmur. Allah ona elə məqam qismət edir ki, onu da yaşadırlar, unudulmağa qoymurlar. Bu mənada Hacı Soltanı yaşadacaq əməlləri, işləri saya gəlməz. Hacı Şəhriyar Salami “Hacı Soltan məktəbdir” adlı məqaləsində yazır: “Azəri torpağı imanlı, Vətəni sevən, sədaqətli, namuslu və istedadlı övladları ilə nəinki Şərqdə, hətta bütün dünyada şöhrət tapmışdır. Və sevindirici haldır ki, belə insanlar arasında bir çox ruhanilər də ön sırada olmuşlar. Belə ruhanilərdən biri də Buzovna Dini İcmasının başçısı Hacı Soltan axunddur. Hacının Allah, din, Vətən eşqi ilə döyünən ürəyi, parlaq fikri, iti zəkası, məqsəd və amalı, haqq və ədalət yolunda fədakarlığı inkarolunmaz bir həqiqətdir. Hacı Soltan ağa haqqında xatirəm və bildiklərim ömrümün, həyat yolumun bir hissəsidir.

Hacı Soltan məktəbdir. Və bu məktəbin şagirdi, tələbəsi olmaq səadətini, şükürlər olsun ki, Allah mənə də nəsib etmişdir” (sms.səh. 142).

“Hacı Soltan məktəbi” elə zaman kəsiyində yarandı ki, yenidənqurma işləri başlamışdı, amma dini qadağalar hələ də

qüvvədə idi. Çünki insanların beyinləri hələ dumanlı idi. Hələ də qarmaqarışıq fikirlər beyinləri gəmirirdi. Baxmayaraq ki, din azadlığı verilmişdi, amma beyinlər hələ əsarətdən qurtula bilmirdi. Belə bir zamanda insanları hidayət etmək, islami dəyərləri onlara izah etmək o qədər də asan iş deyildi. Amma Hacı Soltan bu çətinliyin öhdəsindən gəldi, uşaqlıqdan öyrəndiklərini, beyninin dərinliyində yerləşdirdiyi dini fikirləri, qəlbinin dərinliyində bəslədiyi Əhli-beyt (ə.m.) sevgisini sevə-sevə insanlara payladı. Həm təşkil etdiyi dini məclislərdə şifahi şəkildə, həm də yuxusuz gecələr bahasına ərsəyə gətirdiyi kitablarda yazılı şəkildə...

Şeyx Hacı Arif Əhməd oğlu ilə Gərşivaz Əhməd oğlunun Hacı Soltanın 40 illik yubileyində ona ünvanladıqları müraciətində oxuyuruq: “Möhtərəm Hacı Soltan! 21..12.98-ci il tarixində Sizin 40 yaşınız tamam olur. Bu kamillik yaşının Mübarək Ramazan ayının başlanğıcına təsadüf etməsi Sizin mömin gələcəyinizdən xəbər verir. 40 yaş Allah-təalanın yaratdığı bəndəsinin başına dürr tacı qoyma yaşıdır.

Kiçik yaşlarından Həzrəti-Əli (ə) kimi dünyanın gözəlliyinə, nazü nemətinə arxa çevirərək, məscid sakini olmaq, müxtəlif təqib və təzyiqlərə məruz qalmanıza baxmayaraq, Yaradanın Həzrəti-Peyğəmbərimiz Mühəmmədə (s) nazil etdiyi, dünyaya inqilab gətirən sonuncu səmavi kitab “Qurani-Kərim”i, digər dünyəvi və üxrəvi elmləri öyrənərək, digərlərinə təlim etmək, gənc yaşlarında “Hacı Soltan məktəbi” yaratmaq Sizə nəsib olmuşdur.

Son vaxtlar, illərdən bəri ürəyinizdən keçən arzuları həyata keçirməyə başlamısınız. Keçmişimizi araşdırmaq, yaddaşlardan silinən, yeni və orta nəslə naməlum üləmaların, din

və mədəniyyət xadimlərinin, böyük xidməti olmuş tarixi şəxsiyyətlərin həyatını, fəaliyyətini üzə çıxarmaq, onlar barəsində dəfələrlə mətbuatda çıxış etmək, kitablar nəşr etdirmək, mövludlarını və şəhadətlərini yüksək səviyyədə keçirmək, yeni elmi-dini əsərlər üzərində işləmək gənc nəslin islami təlim-tərbiyəsində yorulmadan təbliğat aparmaq...

Bax, budur Sizin tale qismətiniz!

Qoy bu sadaladığımız və sadalamadığımız işlərinizə Allah--təala Özü qiymət versin. Biz isə Sizə və ailənizə sağlamlıq, xoşbəxtlik, gələcək işlərinizdə müvəffəqiyyətlər diləyirik...” (sms.səh. 140-141).

Hacı Soltan haqqında yazılan məqalələrdən görünür ki, məktəb yaratmaq, tələbə yetişdirmək, islami dəyərləri gələcək nəslə çatdırmaq heç də ona asan başa gəlməmişdir. Qadağalar səngiyəndə qaragüruhçu mollaların tənqidinə məruz qalan Hacı Soltan yenə öz yolundan dönməmişdir. Bir-birinin ardınca gözəl, dəyərli kitablar yazmış, tərtib etmiş, hətta nəşr etdirib təmənnasız insanlara paylamışdır. Filologiya üzrə elmlər doktoru Asif Rüstəmli “Xəmsə” sahibi” adlı məqaləsində Hacı Soltanın ömür yolundan, kitablarından bəhs edir və yazır: “Müqəddəs kəmamların məna dünyasına bələdçilik edən, Tanrı qüdrətindən nur almış islami tövsiyyələrin səcdəsində duran böyük və işıqlı mənəviyyat sahibi, istedadlı ilahiyyatçı alim, “Məşhədi-Qərib” məscidinin axundu, “Ozan” nəşriyyatının dini məsələlər üzrə məsləhətçisi Hacı Soltan Hüseynqulu oğlu Əlizadənin 40 yaşı taman olur. Yubilyar ad gününə öz “Xəmsə”si – beş sanballı kitabı ilə gəlmişdir. Elə kitablar ki, qərinələrin, əsrlərin yaddaşına yaşamağa indidən haqq qazanmışdır. İnanırıq ki, ömrünün coşqun,

qaynar və eyni zamanda müdriklik dövrünü yaşayan Hacı Soltan dinimizin, mənəviyyatımızın aktual problemlərindən bəhs edən yeni-yeni əsərlər yazacaq, xeyirxahlıq missiyasını daha inamla, geniş miqyasda davam etdirəcək, müstəqil Azərbaycanımızın möhkəmlənməsində, vətəndaş sülhünün bərqərar olmasında, İslam dünyasında nüfuz sahibinə çevrilməsində bilik və bacarığını əsirgəməyəcəkdir" (sms. səh. 214). Elə də oldu. Hacı Soltan il-ildən fəaliyyətini daha da genişləndirdi. Nəhəng sənətkarların, qəhrəmanların, din xadimlərinin, o cümlədən, Şah İsmayıl Xətainin, Məhəmməd Füzulinin, Abbasqulu ağa Bakıxanovun, Qumri Dərbəndinin, Məhəmməd Asinin, Seyyid Əzimin oğlu Cəfərin, Şeyx Bəhaəddinin, Şeyx Şamilin, Axund Kamyabın, Hacı İsgəndərin yubileylərini təşkil etdi, həmçinin Azərbaycan soyqırım qurbanlarının, 20 Yanvar şəhidlərinin matəm mərasimlərini keçirdi. Hacı Soltan 40 illik yubileyini beş-on kitabla qarşılamışdısa, 50 illik yubileyində artıq iyirmi beş kitabı çap olunmuşdu. Hacını yubiley münasibətilə bütün dostları təbrik etmiş, onun haqqında məqalələr, şeirlər, təbriknamələr yazmışdılar. Höccətül-islam Əbdürrəhman Yusifpurun "Buzovna məscidinin axundu hörmətli Hacı Soltan Əlizadə cənablarına" müraciətində oxuyuruq:

"Bismillahir-rəhmanir-rəhim!

Sizi 50 illik yubileyiniz münasibətilə təbrik edir, həyatın şirin neməti olan cansağlığı və uzun ömür arzu edirəm. Allahdan arzum budur ki, ömrünüzün 50-ci ilində və bundan sonra da yaradıcılığınızda və təqvanızda müvəffəqiyyətlər əldə edəsiniz. Yazdığınız bütün əsərlər qoy Allah dərgahında qəbul olunsun. Qoy həmişə günəş öz şəfəqlərini üstünüz-

dən əskik etməsin.

Allah-təala həmişə başınızın üstündə olsun" (sms. səh.14). Hacı Soltanın 50 illik yubileyinə həsr olunmuş şeirlərdən birini – Ələmdar Mahirin təbriknaməsini oxuculara təqdim edirik:

Getməkdə olan ömrü firavan yaşa, qardaş,
Artdıqca sevincin, ürəyindən daşa, qardaş.

Hal əhli yığışmış başına əlli yaşında,
Şan-şöhrətin hər yerdə başından aşa qardaş.

Qəm qəm gətirər, könlünə yol tapmağa qoyma,
Qəlbindəki qəm şişəsini çal daşa, qardaş.

Yüksəkliyə pərvaz eləməkçün qanadın var,
Qartal kimi qon zirvəyə, məğrur yaşa, qardaş.

İnsan eləməz varlığını nəfsinə qurban,
Mərdanə dolan, ağlını qoyma çaşa, qardaş.

Kamil olanı naqis olan anlaya bilməz,
Aqilləri aqil düşər ancaq başa, qardaş.

Dostluqda, sədaqətdə cəvahir kimi safsan,
Qiymətdə bərabərsən özün daş-qaşa, qardaş.

Hər kim ki, ola sən kimi əxlaqdə sadə,
Tərifi bir insan kimi gəlməz başa, qardaş.

Məclisdə, ziyafətdə yaşın əlliyə yetmiş,
Şadlıqla qalan ömrünü də vur başa, qardaş.

Könlündəki hər arzuna Allah kömək olsun,
Sür ömrünü sevdiklərin ilə qoşa, qardaş.

Mahir səni şe'r ilə bu gün təbrikə gəlmiş,
Gün olsun o gün ki, yetəsən yüz yaşa, qardaş.

İldən-ilə, kitabdan-kitaba böyüyən, yetkinləşən, kamilləşən, məşhurlaşan tədqiqatçı, şair ömrünün bir hissəsini insanları islama dəvət edən məclisə həsr etmişsə də, bir hissəsini də bu kitablara vermişdir. Kitab-kitab böyümək hər adama qismət olmur. Mənalı ömür yaşamaq, həm bu dünyanı, həm o dünyanı qazanmaq heç də asan deyildir. Hacı Soltan təkcə bir Buzovnanın deyil, bütün Abşeronun, bütün Azərbaycanın Hacı Soltanı oldu. Filologiya üzrə elmlər doktoru, professor, Əməkdar elm xadimi Hacı Bəhlul Abdulla "Tale yolu" adlı məqaləsində Hacının hamıya örnək olan dini və elmi fəaliiyətini əhatə edərək yazır: "Bu gün Axund Hacı Soltan islam dininin fəal və ləyaqətli təbliğatçısı kimi təkcə Buzovnada deyil, bütün Abşeronda, həmçinin Azərbaycanın çox-çox yerlərində tanınır, sevilir. Bu sevgini qazanmaq axund həzrətləri üçün heç də asan başa gəlməyib, böyük zəhmət, daim oxuyub öyrənmək, öyrəndiklərini yadda saxlamaq və yaddaşdakıları məharətlə dinləyicilərə - məclisdəkilərə çatdırmaq kimi keyfiyyətlərdir Hacı Soltanı hörmət pilləsinə ucaldan. Fitri yaddaş sahibi olmaq hər kimsəyə qismət olan səadət deyil. Və bu sayaq adamların sayı da çox olmur.

Xoşbəxtlikdən Hacı Kərbəlayi Soltan da belə nadir hafizəli şəxslərdəndir. O, bir kərə öyrəndiyini bir daha unutmur, yaddan çıxarmır.

Hacı Soltanın həmçinin mahir natiqlik qabiliyyəti vardır. Vallah, onu dinləyəndə az qalır deyəsən ki, bu natiqlik də Hacı Soltanda Allah vergisidir. Dilin şirinliyi, sözləri rəvan tələffüz etməsi onun bu natiqliyinə xüsusi bir rövnəq verir" (sms.səh.220-221).

Hacı Soltan həm də bir xeyriyyəçi kimi tanınmış, bir çox xeyirxah işlərə imza atmışdır. Buzovnada "Əli ayağı" ziyarətgahının, Cümə məscidinin, "Məşhədi-Qərib" məscidinin təmiri və bərpası, Xəlifə Məhəmməd Mömin türbəsinin, Seyyid Qasim, Seyyid Gülşən, Seyyid Əli, Mir Möhsün Ziya məqbərəsinin bərpası işlərinə başçılıq edən Hacı Buzovna kəndinin dəyərli şair və alimlərinin yaşadığı binaların qarşısına xatirə lövhələri vurdurmuş, cəbhə bölgələrinə yardımların aparılmasını təşkil etmiş, döyüşçülərlə, şəhid ailələri ilə, qaçqın-köçkünlərlə görüşmüş, problemlərinin həllində yardımçı olmuş, hətta özünəməxsus torpaq sahəsini belə bağışlamış, doğma kəndindəki uşaq bağçasını təmir etdirmiş, bağçanın həyətində su quyusu qazdırmış, gənclərin xeyir işinə təkan vermiş, evi olmayanlara tikintidə köməklik etmişdir.

Bu yazımızı Cəbiyev Azər Hacıbala oğlunun Hacı Soltana ithaf etdiyi şeiri ilə yekunlaşdırırıq:

Sən qismətə bax, gəldi cahana, zəki oğlan,
Tərif oluna hüsn-camalı, adı Soltan.
Elm almadı, amma nə böyük zirvəyə qalxdı,
Qalxdıqca da mat qoydu mahalı, Hacı Soltan.

Peyğəmbəri dərk etdi, çün öyrəndi lisanın,
Quranla açır sirlərini, bax, bu cəhanın.
Bil, vurğun olursan ona, açdıqca dəhanın,
Zakirdə görür dövlətü malı, Hacı Soltan.

Alimlik adı almağa bir elmi də bəsdir,
Allah neçə elmi eləyibdir ona təqdir.
Bilməm nə üçün bunları görmürlər əkabir,
Əllamədir, bil, əsl ziyalı, Hacı Soltan.
Şairdir, sınanmışdır o, vallah, bu sənətdə,
Nasirdir, ədiblər ona heyran bu xirəddə.
Ruhanı, axund, həmdə ki, hakim şəriətdə,
Bunlarda görür çünki amalı, Hacı Soltan.

Allaha olan eşqidir, etmiş onu sərvər,
Təbliğ eləyir dini, Quranı, odu rəhbər.
İnsanda gözəllik qəni, yəqin edib Azər,
Ən öndə görür əqlü kəmalı, Hacı Soltan.

**1999.**

# KİTAB-KİTAB YAŞANAN ÖMÜR

Qafqaz Müsəlmanları İdarəsinin Xəzər rayonu üzrə Qazisi, idarənin nəzdində yerləşən Elmi-dini şuranın üzvü, Buzovna Cümə məscidinin axundu, Buzovna dini icmasının başçısı, Buzovna "Əli ayağı" ziyarətgahının fəxri axundu, Azərbaycan Yazıçılar Birliyinin üzvü, Azərbaycan Jurnalistlər Birliyinin üzvü olan Hacı Soltan bir çox fəxri adlara layiq görülmüş, müxtəlif mükafatların laureatıdır, orden, medal və bir sıra diplomlar almışdır.

Hacı Soltanı tanıyanlar ona sadəcə axund kimi, qazi kimi, ümumiyyətlə, din xadimi kimi baxmırlar, həm də bir ədəbiyyat adamı kimi ortaya qoyduğu kitabları səbirsizliklə gözləyirlər. Onu başqa din xadimlərindən fərqləndirən də elə vaxtaşırı oxucuların ixtiyarına verdiyi kitablarıdır. Hacı Soltan şairdir, şeirlərinin böyük əksəriyyəti də dini mövzudadır. Amma onun ərsəyə gətirdiyi kitablar içərisində tarixlə bağlı yazdıqları daha çox diqqəti çəkir. O burada da tarixçilərdən fərqlənir. Çünki, təkcə tarix kitablarını oxuyub, araşdırıb yazmır, həm də canlı insanlarla görüşüb, onların söhbətlərini yazır. Yaxın keçmiş olsa da, gələcək nəsillərə gərəkli olan məqamları qələmə alır və həmin yazıları kitab-kitab toplayıb çap etdirir. Bu kitablar həm alimlər, doktorantlar, tələbələr üçün dəyərli vəsaitdir, həm də gələcək nəsillər üçün ərməğandır.

Biz Hacı Soltanın kitablarını oxuduq, incələdik, əsərlərinin bəzilərini sadəcə təsvir etdik, bəzilərini təhlilə çəkdik. Bu zaman Hacı Soltanın kitabları haqqında yazılmış məqalələrdən və yubiley şeirlərindən də istifadə etdik. Şeirləri məzmununa görə, kitablara uyğun yerləşdirməyə çalışdıq. Kitabları oxuculara çap tarixi ardıcıllığı ilə təqdim etməyi daha məqsədəuyğun saydıq.

# 1.AZƏRBAYCAN DƏRVİŞLƏRİ VƏ RÖVZƏXANLARI

Hacı Soltan ilk dəfə oxucuların görüşünə "Azərbaycan dərvişləri və rövzəxanları" adlı kitabı ilə gəlmişdir. Kitab 1995-ci ildə "Boz oğuz" nəşriyyatının Azərbaycan jurnalistlər Birliyinin "Nicat" nəşriyyatı ilə birgə nəşridir. Kitabın naşiri Rəhimağa İmaməliyev, rəyçiləri Şeyxülislam Allahşükür Paşazadə və Vasim Məmmədəliyevdir. Kitab Rəhimağa İmaməliyevin rəyi ilə açılır. Hacı Soltanın yaradıcılığı haqqında maraqlı fikirlərlər söyləyən müəllif yazır: "Coşğun bir ilhamla yazılmış bu kitabın hər səhifəsində dərviş və rövzəxanların həyat və fəaliyyəti ilə əlaqədar olaraq klassik şeirimizin, muğamlarımızın əsl gözəlliyi, əsl şirinliyi ilə daha dərindən tanış oluruq. Axund ağa hər bir dərviş, mərsiyəxan, rövzəxan haqqında elə açıq ürəklə, fəxrlə danışır ki, onun səsini bərəkətli, qədim məmləkətimizin hər bucağından eşidəcəyik, buna indidən əminliyimiz var!" (səh.4).

Naşir sözündən sonra Hacı Soltanın oxuculara müraciəti kitabda yer alır. Yazıdan məlum olur ki, müəllif bu kitabı uzun illərin axtarışları, gərgin əməyi sayəsində ərsəyə gətirmişdir. Bir sıra dərviş və rövzəxanlarla görüşmüş, onların söhbətlərindən maraqlı məqamları və oxuduqları klassik şeir nümunələrini oxuculara təqdim etmişdir. Tədqiqatçı, eyni zamanda, dünyalarını dəyişən sənətkarların əlyazmalarını axtarıb tapmış, bir sıra fotoşəkilləri belə əldə edərək kitaba daxil etmişdir. Müəllif yazır: "Bu kitabı nəşr etdirməkdə əsas məqsədim, əsasən 19-cu əsrin əvvəlindən bu günümüzədək dərvişlərin, rövzəxanların, mərsiyəxanların həyat və fəaliyyətindən, onların islam, klassik ədəbiyyat və muğam tarixi ilə bağlılığından bəhs etməkdir" (səh.7).

Kitab Şeyxülislam Allahşükür Paşazadənin xeyir-duası ilə çap olunmuşdur. O, Hacı Soltanın dini və ictimai fəaliyyəti haqqında söz açaraq, kitab haqqında yazır: “Mən onun uzun illərin səyləri və axtarışları, gərgin və əvəzsiz zəhmətinin bəhrəsi “Dərviş və rövəxanlar” adlı gələcək kitabının mətni ilə böyük marasqla tanış oldum. Yazılan materialları oxuduqdan sonra belə bir qənaətə gəldim ki, Hacı Soltanın din-imanımız naminə gördüyü bu yaradıcılıq işi İslamın respublikamızda, xüsusilə, Bakı və Abşeron ərazisində kəşf olunmamış qiymətli dəyərləri, bu mənbələri öz həyat və fəaliyyətində yaşadan görkəmli din xadimləri barədə zəngin məlumat verir” (səh.11).

Kitabın ilk fəsli “İslamda dərvişlik” adlanır. Müəllif burada ilkin olaraq islam aləminin dörd şərəfli məclisi haqqında məlumat vermişdir: “Quran məclisi”, “Şəriət məsələləri məclisi”, “Həzrəti-Əlinin (ə) mədhi məclisi”, “İmam Hüseynin (ə) əza məclisi.

Bir çox ədəbi və dini mənbələrə müraciət edərək, zəngin məlumatlar ilə oxucu auditoriyasına qədəm qoyan miəllif tarixi faktlardan, hədislərdən, klassik şeir nümunələrindən istifadə etməklə kitabın daha sanballı çıxmasına səy göstərmişdir. Bu fəsildə oxucular bir sıra maraqlı əhvalatlarla tanış ola bilər və elmi-tarixi biliklər əldə edə bilərlər. Buzovnada yerləşən müqəddəs Əliayağı qədəmgahından söz açan müəllif yazır: “Xalq arasında qədəmgah barədə müxtəlif rəvayətlər, xatirələr danışılır. Ərəb mənbələrində Həzrəti-Əlinin (ə) hicri tarixi ilə 13-cü ildə Abşeronda, Buzovna dəniz kənarında olması göstərilir. Buzovna sakini Əliyarın evlənəndən sonra yuxulu halda nurani bir qoca tərəfindən buraya

gətirilməsi və ona qayaların üstündə Həzrəti-Əlinin (ə) özünün və atının ayaq izlərinin göstərilməsi, Əliyara "şeyxlik" rütbəsinin verilməsi, Həzrəti-Əlinin (ə) ayaq izləri olan yerlərin paklığının qorunmasının tapşırılması və s. Şeyx Əliyar hər gün bu qayaların üstündə azan çəkər və namaz qılarmış. Bu, hər gün təkrar olunduğundan, həyat yoldaşı kişinin hara getməsi ilə maraqlanmış və gəlib ləpirlərin şahidi olmuş, hətta qorxudan arvadın dili tutulmuşdur..." (səh.34).

Kitabda gedən "Ləhni-Davud" adlı yazı da maraq doğurur. Müəlif burada Davud peyğəmbərdən (ə) klassik şeirimizdə onun səsinin mədhindən söz açmış və klassik muğam dünyasına kiçik bir ekskursiya etmişdir.

Kitabın növbəti fəslində "Vəfat etmiş dərviş və rövzəxanlar" haqqında məlumat verən tədqiqatçı Eldar Mustafa oğlu (1818-1936), Kərbəlayi Həmzəli (?-1924), Müin Ağa oğlu (?-1937), Rəşid Kazım oğlu (təx. 1853-1937), Kərbəlayi Mir Səməd (1866-1952), Axund Hacı Mirzə Mehdi Hacı Əbdülkərim oğlu (1863-1942), Axund ağa Əlizadə (1870-1954), Ağarza Kərbəlayi Rəhim oğlu (12870-1956), Süleyman Hacıbala oğlu (1875-1955), Mirhəmid Mirabdulla oğlu (1879-1953), Məmmədvəli Maşan oğlu Vəliyev (1879-1963), Murad Məhəmmədəli oğlu (1879-1967), Molla Xalıq (1879-1968), Dadaş Məhəmməd oğlu (1880-1943), Əsədulla Ağabəy oğlu (1880-1961), Əlimuxtar Piri oğlu (1881-1965), Məşədi Məhəmmədhüseyn Kərbəlayi Cahanbaxış oğlu (1882-1945), Ağadadaş Sami oğlu (1883-1956), Salam İmaməli oğlu (1885-1957), Əliqulu Məmmədəli oğlu (1886-?), Riza Əbasəlt oğlu (1888-1954), Mir Əliəsgər

Seyid Alxas oğlu (1889-1980), Əliağa Fərəculla oğlu (1890-1962), Səməd Vahab oğlu (1890-1963), Mir Xəlil Mir Yəhya oğlu (1890-1973), Əbasəlt Nəsir oğlu (1891-?), Əlihüseyn Gülhüseyn oğlu (1892-1965), Çıraqəli Balağa oğlu (1894-1972), Məşhədiağa Xasəli oğlu (1895-1969), Nüsrət Paşa oğlu (1896-1985), Rzaəli Məhəmmədəli oğlu (1897-1967). Səməd Məhəmməd oğlu Səmədov (1898-1955), Bəgi Dadaşbala oğlu (1898-19650, Muradəli Yarməmməd oğlu (1898-1971), Axund Müseyib (1898-1976), Əsəd Əhliman oğlu (1900-1087), Qəmbər Qədim olu (1901-1972), Ənnağı Kərbəlayi Tağı oğlu (1903-1970), Həsən Ağavəli oğlu (1903-1983), Məhəmmədbağır Dünyamalı oğlu (1904-1984), Hacı Yəhya Yusif oğlu Yəhyayev (1904-1986), Qüdrət Kərbəlayi Ağakişi oğlu (1905-1975). Möhsün Quliyev (1905-1980), Balaəli Ərəbəli oğlu (1905-1984), Ağaəli Qulaməli oğlu (1906-1989), Məlikməmməd Rəsul oğlu Rəsulzadə (1907-1988), Əbdülhüseyn Əliheydər oğlu (1908-1981), Axund Məşhədi Məzahir Kərbəlayi Rəsul oğlu (1911-1976), Abdullah Əhliman oğlu (1911-1994), Xəlil Müseyib oğlu Abıyev (1919-1992), Səfa Əliyulla oğlu (1925-1994), Hacı Murad Ağaqulu oğlu Vüzuli (1926-1984), Əlisöhbət İmamverdi oğlu (1927-1989), Şirinəli Balaəli oğlu (1939-1990), Rzaəli Hacıbala oğlu (1956-1994) kimi dərvişlərin həyat və fəaliyyətini əhatə etmiş və onların oxuduğu klassik şeir nümunələrini də oxuculara təqdim etmişdir. Burada Nizaminin, Xaqaninin, Möhnəti Bakuyinin, Nəsiminin, Xətainin, Füzulinin, Məhəmməd Əmaninin, Qövsinin, Saibin, Aşıq Ələsgərin, Bakinin, Qumrinin, Müdərrisin, Şeyx Rəşidin, Dəxilin, M.H.Qüdsinin, Nəbatinin, Şüainin, Hüzninin, Əliməhəm-

məd Fənanın, Racinin, Acizin, Dilsuzun, Seyyid Əzimin, M.Ə.Sabirin, Qasirin, Vahidin, Pürğəmin, Üryanın, Dilrişin, Saqibin, Fəqirin, Mir Həbib ağanın, Ağasəlim Fədainin, Mir Cəlalın, Şeyx Əli Tutinin, Şirinəlinin dərvişlərin repertuarında olan əsərləri də yer almışdır. Akademik Vasim Məmmədəliyev "Dərvişlik və rövzəxanlıq sənəti" adlı məqaləsində yazır: "Son vaxtlar respublikamızda dini ədəbiyyatın nəşrinə xüsusi qayğı göstərilir, müxtəlif adlarda dini mətbuat çap olunur, bir neçə ali dini tədris müəssisəsi, çox sayda dini məktəb, litsey və kollec fəaliyyət göstərir, bir sözlə Azərbaycan bir müsəlman ölkəsi kimi özlüyünə qayıdır, dini mənəviyyatını ehya edir. Məşhur din xadimlərimizin, müctəhid və axundlarımızın əsərləri çap edilib xalqın istifadəsinə verilir, görkəmli şairlərimizin mərsiyələri və növhələri kütləvi tirajla çap edilib dindarlara çatdırılır, məscidlərə, dini ocaqlara paylanılır. Bu baxımdan Buzovna məscidinin axundu Hacı Soltanın 1995-ci ilin sonlarında nəşr edilmiş "Azərbaycan dərvişləri və rövzəxanları" kitabı xüsusi əhəmiyyət kəsb edir. Çünki, yuxarıda qeyd etdiyimiz kimi, son illərdə respublikamızda dini ədəbiyyatın nəşri sahəsində müəyyən işlər görülsə də, dərvişlərimiz və rövzəxanlarımız haqqında gözə dəyən bir əsər yazılıb çap etdirilməmişdir. Hacı Soltanın yenicə çapdan çıxmış bu kitabı bu sahədə atılmış ilk addım kimi çox təqdirəlayiqdir" (sms.səh. 171).

Kitabın növbəti fəsli "Müasir dövr dərviş və rövzəxanları" adlanır. Burada haqqında söhbət açılan Mirzağa Cəfərqulu oğlu (1906), Tahir Rəşid oğlu (1916), Əzizulla Hacıbala oğlu (1918), Əzim Musa oğlu Mirzəyev (1920), Ağanəcəf Əbdülsahib oğlu (1929), Əbülfəzl Kərim oğlu (1929), Mikail

Qurban oğlu 91931), Gülbala Ağacan oğlu (1933), Nadir Söhrab oğlu (1938), Xanlar Yaqub oğlu (1941), Arif Əliheydər oğlu (1944), Əbdürrza Xanmirzə oğlu (1947), Cəbrail Mikail oğlu (1952), Məşhədi Aqil Qədeşbala oğlu (1952), Rasim Rza oğlu (1954), Məhəmmədağa Əlisgəndər oğlu (1954), Məşhədi Yaşar Cahid Nərdərani (1956), Nasir Hüseyn oğlu (1958), Məhəmməd Məşhədi Baba oğlu Quliyev (1959), Əliəsgər Kərbəlayi Mikail oğlu (1962), Məzahir Kamil oğlu (1976), Tərlan Cənnət oğlu (1979) kimi rövzəxan və mərsiyəxanların müraciət etdiyi şairlərdən Xətainin, Vidadinin, Abbasqulu Ağa Bakıxanovun, Qumrinin, Fəqirin, Abdulla bəy Asinin, Racinin, Növrəsin, Qəribin, Lütfəli Lütfinin, Məşhədi Əşrəf Nəzərlinin, Tutinin, Hacı Əzim Məddahın, Hacı Soltanın, Yaşar Cahidin, Təmkinin əsərləri də kitabda yer alır. Professor Hacı Bəhlul Abdulla "Tale yolu" adlı məqaləsində yazır: "Hacı Soltanın 1995-ci ildə nəşr etdirdiyi "Azərbaycan dərvişləri və rövzəxanları" kitabı təkcə onun öz yaradıcılığı üçün deyil, ümumiyyətlə, Azərbaycan mənəviyyatı üçün mühüm hadisədir. O, Azərbaycanın bir çox yerlərini , xüsusən Abşeronu kənd-kənd, ev-ev gəzərək unudulmuş, yaddan çıxmış dərvişlərin, rövzəxanların yaradıcılıqlarını, repertuarlarını toplamış, neçə-neçə əlyazmanı, həm də çox çətin, hətta az qala oxunması mümkün olmayan əlyazmanı gözdən keçirmiş və nəhayət, samballı bir kitabla Azərbaycan ədəbiyyatına dəyərli bir töhfə vermişdir" (sms. səh.222-223).

Kitabın sonunda dərviş və rövzəxanlarla bağlı şəkil qalereyası təqdim olunmuşdur.

Bu yazını Hacı Zəki İslamın Hacı Soltana yazdığı və

"Azərbaycan dərvişləri və rövzəxanları" kitabına işarə etdiyi "Tapdım" şeiri ilə yekunlaşdırırıq:

Atalar sözüdür, axtaran tapar,
Ay Allah, nə gözəl insanı tapdım.
Ekranda görmüşdüm nur camalını,
Hacı, Kərbəlayi Soltanı tapdım.

Məhərrəm ayı öz yerində taxtdadır,
Mustafa, Müctəba şəhid vaxtdadır.
Görüşə bax, nə təsadüf vaxtdadır,
Xəyalda dolanan gümanı tapdım.

"**Azərbaycan dərvişləri**" kitabı
Haqqın haqq yoludur, haqqı, hesabı.
Arayan, axtaran dini səvabı,
Buzovnalı Axund Soltanı tapdım.

Bəndeyi-bəşərdən yox ehtiyacım,
Kərbeyi, məşhədi, şamilə hacım.
Tanrıdan payımdır bu təxtü tacım,
Şeirdə, sənətdə imanı tapdım.

Ömrünü düz qoymuş Əli yolunda,
O on dörd məsumun "Bəli" yolunda.
Zəki İslam gördü mələk donunda,
Qəlbimdə burulan tufanı tapdım.

15 iyul, 1996.

# 2.ŞAH İSMAYIL XƏTAİ

Hacı Soltanın ikinci kitabı "Şah İsmayıl Xətai" 1997-ci ildə "Ozan" nəşriyyatında dərc edilmişdir. Xronoloji-tarixi məlumatların toplandığı bu kitabı müəllif əmisi Balağa Məşhədi Məcid oğlunun simasında həyatını Vətənin azadlığı və müstəqilliyi uğrunda qurban vermiş şəhidlərin əziz xatirəsinə ithaf etmişdir. Şeyxülislam Allahşükür Paşazadənin xeyir-duası ilə nəşr edilən kitabın redaktoru Bəhlul Abdulla, rəyçiləri Əziz Mirəhmədov, Vasim Məmmədəliyev və Təvəkkül Səlimovdur.

Kitab Fuad Qasımzadənin "Siyasət, sənət və elm müsəxxiri" adlı rəyi ilə açılır. Şah İsmayılın həyat və fəaliyyəti haqqında əhatəli söhbət açan müəllif Azərbaycan xalqının bu nəhəng övladını fəxrlə oxuculara təqdim edir, onun siyasi xadim, tarixi şəxsiyyət və şair kimi tanındığını diqqətə çatdırır. Hacı Soltanın Xətai haqqında yazdığı kitabı dəyərləndirir və savab iş hesab edir. Kitabı bir növ təzkirə hesab edən və bu cəhətini çox müsbət qiymətləndirən müəllif yazır: "Kitab Şah İsmayıl haqqında dolğun təsəvvür yaradır. Oxucularımıza bu böyük insan haqqında, üç mühüm sahənin: siyasətin, sənətin və elmin müsəxxiri haqqında geniş məlumatlar verir. Oxucu Şah İsmayılın elm və sənət adamlarına münasibəti, İlahi gözəllik barədə görüşləri, vətən, əqidə, sülh, şücaət, əxlaq, qadına münasibət və s. mühüm problemlər barəsinsə fikirlərilə tanış olur" (səh.11).

Bəhlul Abdullanın "Tale yolu" adlı yazısı Şeyxülislam Allahşükür Paşazadənin sözləri ilə başlayır. Sonra Buzov-

na kəndi haqqında tarixi faktlara müraciət edən müəllif kəndin adının mənasını açıqlamağa çalışır. Söhbəti lap uzaqdan başlayan tədqiqatçı, nəhayət, sözü gətirib Hacı Soltana çıxarır. Onun çap olunmuş ilk kitabından və çapını gözləyən kitablarından söz açır və fikrini belə yekunlaşdırır: "Hacı Kərbəlayi Soltan fəaliyyət və yaradıcılığının yüksələn dövrünü yaşamaqdadır. Bi inanırıq ki, bu möhtərəm şəxs istər dini-islama xidmət etməkdə, istərsə də fərdi yaradıcılığında çox-çox uğurlar qazanacaq. Qoy onun seçdiyi bu tale yolu Tanrı nuruyla həmişə işıqlansın" (səh. 18).

Hacı Soltan kitabın "İslamda birlik" adlı ilk yazısını belə başlayır: "Mənim bu kitabı ortalığa çıxarmağıma səbəb Şah İsmayıl Xətaiyə olan böyük məhəbbətimdir. Təkcə mən yox, bütün Azərbaycan xalqı Şah İsmayılı sevir və özünü ona borclu bilir. Mən bu yazımda Xətaini islami baxımdan xarakterizə etmyə çalışmışam. Bu kitabda Şah İsmayıl haqqındakı tarixi faktlarla yanaşı, görkəmli yazıçılarımızın Xətai həyatından yazdıqları tarixi romanlardan da misallar göstərilmişdir.

Din xidmətçisi kimi öz fəaliyyətim dövründə mən bir çox məclislərdə millətimizin bu böyük oğlu haqqında dəfələrlə söhbət açmış, öz moizələrimdə daima ona aid misallar göstərmiş, hətta bir çox çıxışlarımı yalnız Xətai dühasına həsr etmişəm. Hər yerdə bu böyük şəxsiyyətə xalqımızın böyük məhəbbətini və dərin marağını müşahidə etmişəm. Məhz bu səbəblərə görə Xətai mövzusunda bu kitabı hazırlamağı, cavan nəsli Xətainin islam dünyası ilə tanış etməyi özümə borc bildim. Məqsədimə nə dərəcədə nail olduğumu oxucu söyləyəcək" (səh. 19).

Akademik Əziz Mirəhmədov "Axund Hacı Soltanın "Şah

"İsmayıl Xətai" əsəri barədə" məqaləsində yazır: "Axund Hacı Soltan axır vaxtlaradək alimlərin səhvən müsbət qiymətləndirdikləri bəzi tarixi hadisələrin əslində mənfi mahiyyətdə, hətta mürtəce hadisə olduğunu düz qeyd edir. Bu münasibətlə o, kitabın müqəddiməsi kimi verilən "İslamda birlik" bölməsində müasir yazıçılarımızdan yaxşı nümunələr almışdır.

"Şah İsmayılın təxəllüs, ad və ləqəbləri" Axund Hacı Soltanın böyük əmək nəticəsində xətaişünaslığa etdiyi orijinal xidmətidir. Onun əlyazmasının bu hissəsində "təxəllüsləri, adları və ləqəbləri" bölmələrindən sonra Xətai adı ilə bağlı coğrafi, ədəbi, folklor termini və ünvanı, müəssisə, küçə, məktəb və s.-nin siyahısı verilir. Bu, böyük Azərbaycan klassikinə məhəbbət və ehtiramın dərəcəsi barədə yaxşı təsəvvür yaradan bəhsdir" (sms.səh. 199).

Bir çox tarixi faktları açıqlayan müəllif Azərbaycan xalqının daha bir nəhəng övladı Abbasqulu ağa Bakıxanovun Xətaiyə olan məhəbbətindən bəhs etmiş, onun İran-Rusiya müharibəsi zamanı Ərdəbildə olarkən Şeyx Səfi məqbərəsini, Şah İsmayıl Xətainin qəbrini ziyarət etdiyini də diqqətə çatdırmışdır. Burada Vəli Həbiboğlunun "A.A.Baklıxanov", Əzizə Cəfərzadənin "Bakı-1501" əsərindən və Mahmud Kaşğarinin "Divan"ından da sitatlar verən müəllif yazısını Şah İsmayılın birlik haqqında yazdığı şeirləri ilə bitirir.

Akademik Ziyad Səmədzadə Hacı Soltana həsr olunmuş məclisdəki çıxışında demişdir: "...Hacı Soltan bu gün ilahiyyat elmi və din mədəniyyəti sahəsində ən nadir və özünəməxsus tədqiqatçılardan biridir. Hər alim Şah İsmayıl Xətai yaradıcılığına girişə bilməz. Hacı Soltan Azərbaycan tarixinin

ən ağır və ən çətin səhifələrini araşdırmaqla Azərbaycan mədəniyyətinin ən görkəmli simalarından birinə çevrilmiş və az müddət ərzində ölkəmizdə və onun hüdudlarından kənarda böyük marağa və diqqətə nail olmuşdur" (sms.səh. 157).

Növbəti yazı "İslamda birlik haqqında böyük din alimlərinin dediklərindən" adlanır və burada İmam Xomeyninin, Ayətullahül-üzma Birucerdinin, Əllamə Məhəmməd Cavad Müğniyənin, Ayətullahül-üzma Xameneinin, Şəhid Ayətullah Sədrin, Əllamə Seyid Şərafəddin Amulinin, Əllamə Təbatəbainin və başqalarının fikirləri yer alır. "Az ömrün böyük dünyası" adlı yazıda Xətai haqqında müxtəlif alimlərin, yazıçıların fikirləri ilə tanış oluruq. Burada Xətainin son döyüşü, vəfatı haqqında söz açan müəllif sonda onun vəfatından sonrakı hakimiyyət şəcərəsini təqdim edir. "Şah İsmayıl Xətainin ömür yolu xronologiyası"nda onun anadan olmasının, atasının ölümü, ailənin həbsi, İsmayılın Ərdəbildə Səfəvi təriqətinə şeyx təyin olunması, başına gələn hadisələr, taxta çıxması, səfərləri, yürüşləri, fəthləri, nəhayət, vəfatı tarixləri verilmişdir. "Hürr kimdir" yazısında Xətainin Hürrün qəbrini açması hadisəsi açıqlandırılmış, sonda Əliməhəmməd Fənanın Hürrə həsr etdiyi mərsiyəsi verilmişdir.

Kitabda Şah İsmayılın öz dövrünün elm və sənət adamlarına münasibətindən danışan müəllif, "Alim, elm və sənətkar" adlı yazını Xətai yaradıcılığına həsr etmiş və burada həm də Fərman Kərimzadənin, Əzizağa Məmmədovun və Azadə Rüstəmovanın əsərlərindən parçalar vermişdir.

"Şah İsmayıl Xətainin dili" adlı məqalə daha çox diqqəti çəkir. Burada müəllifin Xətai yaradıcılğını müxtəlif

aspektdən tədqiq etdiyinin şahidi oluruq. Şairin üslubu, əsərlərinin leksikası, sintaksisi, bir sıra dil xüsusiyyətləri açıqlanmış, sonda şeirlərindən nümunələr verilmişdir.

Kitabdakı "İlahi gözəllik" adlı yazıda islam fəlsəfəsindən çıxış edərək kamil insan haqqında söz açan Hacı Soltan yazır: "Şah İsmayıl Xətai belə bir insani-kamil, xarici və batini gözəl, böyük əql və ilham sahibi, qəlbi Allah eşqi ilə çırpınan, Rəsulallah (s), Həzrəti-Əli (ə), Əhli-beyt (ə) karvanının yolçusu və davamçısı olan kamil insan, mərifət əhli, mürşidi-kamildir.

Həqiqətən, Xətai müdrik və ali, səmimi və ciddi, sadə məğrur, xoş təbiətli şair, böyük əql sahibi alim, cəsur və cahangir sərkərdə, minlərcə müridə mürşidi-kamil olan bir şəxsiyyətdir. Bəli, Xətai aşiqdir. Bütün insani-kamil kimi onun da qəlbi Allah eşqilə vurur" (səh.93).

Akademik Vasim Məmmədəliyev "Axund Hacı Soltan Hüseynqulu oğlunun "Şah İsmayıl Xətai" kitabı haqqında" adlı məqaləsində yazır: "Kitabda Şah İsmayıl Xətainin həyat və yaradıcılığı barəsində bir çox maraqlı mülahizə və müddəalar irəli sürülmüşdür. Azərbaycan klassiklərinin həyat və yaradıcılığına yaxşı bələd olmaqla yanaşı, İslam dinini yaxşı bilən Hacı Soltan böyük şairimizin həyat və yaradıcılığı barəsində bir sıra maraqlı mülahizələr irəli sürmüş, şairin etiqadı və əqidəsi haqqında yeni fikirlər söyləmişdir. Ümidvarıq ki, müəllifin irəli sürdüyü bu fikirlər Şah İsmayıl Xətainin həyat və yaradıcılığı ilə bağlı gələcəkdə aparılacaq tədqiqatlar üçün yaxşı zəmin yaradacaq. Müəllif Şah İsmayıl Xətai kimi mürəkkəb bir şəxsiyyətin həyat və yaradıcılığı ilə bağlı bir sıra maraqlı məqamların üzərində ətraflı dayanmış, onlara

öz yeni münasibətini bildirmişdir" (sms.səh. 173-174).

M.Qasımlının, T.Hacıyevin, Ş.Fərzəliyevin, V.Devittin Xətai haqqındakı məqalələrindən sitatlar verən müəllif yazını Xətainin Əhli-beytə (ə) həsr etdiyi şeirləri ilə bitirir.

Kitabda gedən "Vətən, əqidə, sülh və şücaət haqqında" başlıqlı yazıda Həzrəti-Əli (ə) və Şah İsmayıl Xətai paraleli diqqəti çəkir. Sonra Xətainin ömür yoluna çıraq tutan müəllif, yeri gəldikcə, Fərman Kərimzadənin "Çaldıran döyüşü", "Xudafərin körpüsü", Əlisa Nicatın "Qızılbaşlar", Əzizağa Məmmədovun "Şah İsmayıl Xətai", Elçinin "Mahmud və Məryəm" adlı əsərlərindən, habelə Xətai haqqındakı məqalələr toplusundan sitatlar verərək fikirlərini daha da dolğunlaşdırmışdır. Burada Xətainin Sultan Səlimə cavab məktubu da maraq doğurur. Yazının sonunda Xətai şeirlərindən nümunələr təqdim olunmuşdur.

Akademik Bəkir Nəbiyev "Ağıl yaşda deyil, başdadır" adlı məqaləsində yazır: "Hacı Soltanın "Şah İsmayıl Xətai" kitabı müdrik dövlət başçısı, qəhrəman sərkərdə və incə ruhlu şair haqqında çox qiymətli materialları əhatə edir və bundan sonra həmin mövzuda yazacaq özünə hörmət edən heç bir alim həmin əsərə etinasız qala bilməz". (sms.səh.38).

"Əxlaq" adlı məqalə Xətainin bir tiyuğu ilə başlayır:

Xətai can arxına,
Əhli-ürfan arxına.
Mərifətdən su gəlib
Tökülür can arxına.

Burada bir haşiyə çıxmaq istəyirəm. Xətai ilə bağlı bir sıra kitablarda bu tiyuğ bu şəkildə getmişdir. Düzdür, mərifət

bir ümmandır, amma su ümmanı deyil, mərifət ümmanıdır. Mərifət ümmanında su olmaz, mərifət olar. İnsan mərifət ümmanından bir içim içsə, kamilləşər. Yəqin ki, bu tiyuğun düzgün variantı belə olar:

Xətai, can arxına,
Əhli-ürfan arxına.
Mərifətdən bir içim
Tökülür can arxına.

Nə isə... Bu yazıda islam əxlaqından söz açan müəlif Xətai əxlaqını onun paralelində görür. Xətai yaradıcılığına müraciət edən müəllif onun "Nəsihətnamə"sini əxlaq mövzusunda yazılmış bir həyat kitabı adlandırır. Sonra yenə də yuxarıda adını çəkdiyimiz kitablardan sitatlar, sonda Xətai poeziyasından nümunələr verir.

"Qadına münasibət" adlı yazı Qurani-Kərimin "Nisa" surəsindən ayə ilə başlayır. Müəllif İslam dininin qadına verdiyi dəyərdən bəhs edir və Quranın müxtəlif surələrindən misallar verərək fikirlərini əyaniləşdirir. Adı tarixə düşən, bu günümüzə qədər gəlib çatan müqəddəs xanımlardan, eləcə də Azərbaycanın igid, kişi qeyrətli qadınlarından söz açan Hacı Soltan sözü Şah İsmail Xətainin Taclı Bəyiminə gətirib çıxarır. Yenə də əhdinə sadiq olan müəllif Xətai ilə bağlı əsərlərdən parçalar və sonda Xətainin qəzəlini verir.

"Şah İsmayılın təxəllüs, ad və ləqəbləri", "Şah İsmayıl Xətainin əsərlərində istifadə etdiyi bəzi atalar sözləri, zərbülməsəllər, hikmətlər" də oxucuya maraqlı məlunatlar verir. "Şiə islahatı və onun əhəmiyyəti"ndən söz açan tədqiqatçı

Oqtay Əfəndiyevin "Azərbaycan Səfəvilər dövləti" əsərinə istinadən bir sıra tarixi faktları diqqətə çatdırır. Şah İsmayıl Xətainin əsərlərindən götürülmüş nəsihətamiz beytlər, bəndlər də kitabda ayrıca bir bölümdə yer alır.

Oqtay Əfəndiyev "Axund Hacı Soltan Hüseynqulu oğlunun "Şah İsmayıl Xətai" kitabı haqqında" məqaləsində bu kitabı xətaişünaslığa təqdim olunan gözəl bir hədiyyə hesab edərək yazır: "Müəllif Səfəvilər dövrünün tarixinə dair maraqlı məlumatlar toplamış, çoxsaylı mənbələrdən iqtibaslar etmiş, nəhayət, Şah İsmayıl Xətai və Səfəvilər dövləti haqqında öz əsərində zəngin və dolğun xronoloji-tarixi, elmi-ədəbi məlumatlar vermişdir.

Maraqlı burasıdır ki, Hacı Soltan 38 yaşında (o, 1958-ci ildə anadan olub) 510 səhifəlik bir sanballı əsər tərtib edib, 38 il ömür sürmüş dahi Şah İsmayıl Xətainin 510 illik yubileyinə və Xətaişünaslıq elminə layiqli bir töhfə bəxş etmişdir" (sms.səh. 196).

Kitaba Xətai haqqında müxtəlif əsərlər, o cümlədən Füzulinin "Bəngü badə", Jozef Dögininin "Ağqoyunlu türkmənləri", Abbasqulu Ağa Bakıxanovun "Səfəvilər dövlətinin zühurundan Nadir şahın vəfatına qədər olan dövr", Seyid Əzim Şirvaninin "Şah İsmayıl Xətai" Məhəmməd Əmin Rəsulzadənin "Türk hakimiyyəti altında fars ədəbiyyatı", Məhəmmədəli Tərbiyətin "Danişməndani-Azərbaycan", Salman Mümtazın "Şah Xətai", Həmid Araslının "Şah İsmayıl Xətai və onun yaradıcılığı", Mirzə Abbaslının "Xətai və Füzuli", Əzizağa Məmmədovun "Şah İsmayıl Xətainin əsərləri", Əlisa Nicatın "Şah İsmayıl Xətai", Firudin Qurbansoyun "Şah İsmayıl Xətai Məhəmməd Füzulinin sənət güzgüsündə"

və bir sıra alimlərin məqalələri, nəhayət, Hacı Soltanın "Övliya Xətai Füzulinin qəlbində imiş", Ə.M.Dəmirçizadənin "Azərbaycan ədəbi dilinin inkişafı tarixində Xətai-Füzuli mərhələsi", Şahin Fərzəliyevin "Azərbaycan XV-XVI əsrlərdə" adlı məqalələri, sonda Xətaiyə həsr edilmiş şeirlər verilmişdir.

Yazımızı Hacı Yaşar Cahidin Hacı Soltana yazdığı və "Şah İsmayıl Xətai" kitabına işarə etdiyi şeirindən bir hissə ilə bitiririk:

Hər kəs istər ki, görə məclisi-ürfanımızı,
Gələ bu məclisə görsün ədəb-ərkanımızı.

Saqiya, məclisə bir badeyi-ruhani gətir,
Seyr edək badə səfasilə bu ruhanimizi.

Sən nəzər qıl belə məclislərə arif nəzəri,
Çünki imanlı olan anlayar imanımızı.

Budur alimlər ilən həm Əli məddahləri,
Haradan yetdi məqamə neçə mehmanımızı.

O səbəbdi bu biyabandə söz səyyadi,
Alıcı quş kimi gözlər yenə tərlanımızı.

Neçə mənalı əsərlər yaradıb xəlqim üçün,
Mədh edib dərvişü məddahü nəvaxanımızı.

**Şah Xətaiyə** yazıblar elə bir şanlı əsər,
Artırıb bu yol ilən şöhrət ilən şanımızı.

Şah Xətaini sevir Azəri xəlqi, yenidən
O, hədiyyəylə sevindirdi müsəlmanımızı…

# 3.İSLAMDA İDMAN və BOKS ŞAHI MƏHƏMMƏD ƏLİ

Hacı Soltanın üçüncü kitabı "İslamda idman və boks şahı Məhəmməd Əli" 1997-ci ildə "Ozan" nəşriyyatında çap olunmuşdur. Kitabın redaktorları professor Ağacan Əbiyev və filologiya üzrə elmlər doktoru Bəhlul Abdulladır, rəyçisi Axund Hacı Cəbrayıl Mikayıl oğludur. Müəllif kitabı Buzovna kəndinin xeyirxah sakinləri Rahib Ələkbər oğlunun, Qüdrət Ağasəf oğlunun, gənc şair Kəbir Azərinin və əmisi oğlu Arif Həsən oğlunun əziz xatirələrinə hədiyyə etmişdir. Ağacan Əbiyev kitaba yazdığı ön sözdə Axund Hacı Soltanla ilk görüşündən, ona bağışladığı kitablarından bəhs etmiş, redaktoru olduğu kitabla bağlı fikirlərini oxucularla bölüşmüşdür: "Kitabda çox qədim tarixi olan idmanın insanın fəaliyyətində, mənəvi əxlaqında, vətənə, xalqa xidmətində faydasından geniş söz açan müəllif, həmçinin İslam dininin dünya şöhrətli idmançıların, eləcə də Məhəmməd Əlinin həyatındakı rolundan da geniş bəhs etmişdir. Hacı Soltan çox doğru olaraq qeyd edir ki, İslam dini idmançının mənən, ruhən saf, sağlam olmasında, nəcib insan kimi yetişməsində xüsusi əhəmiyyət daşıyır.

İslam müqəddəslərinin idmana dair söylədiyi fikirlər, daha çox idmanla məşğul olan cavanlarımız üçün örnək, onların vətənpərvərlik ruhunda tərbiyə olunmasında bir məktəbdir. Yaxşı ki, bu cür nümunələr ilk dəfə olaraq Axund Hacı Soltan tərəfindən toplanılıb kitaba daxil edilmişdir (səh.5).

Kitab üç fəsildən ibarətdir. Müəllif birinci fəsildə İslamın idmana müsbət baxışını qeyd edərək, Qurani-Kərimdən ayələrə, Mühəmməd peyğəmbərin (s) öyüdlərinə, Həzrəti-Əlinin (ə) hikmətli sözlərinə, İmam Rzanın (ə) hədislərinə və müxtəlif idmançıların idmanla bağlı sözlərinə müraciət etmişdir. Kitaba Azərbaycanın tanınmış pəhləvan şahlarının, keçən əsrdə, habelə müasir dövrdə fəaliyyəti olan idman ustalarının siyahısı da daxil edilmişdir. “İdman sağlamlıqdır” adlı yazı Şah İsmayıl Xətainin beyti ilə başlayır. Burada da islami dəyərlərdən, hikmətli sözlərdən, klassik Azərbaycan şeirindən bəhrələnən, Həzrəti-Əli (ə) gücünü öyən Hacı Soltan, nəhayət, boks şahı Məhəmməd Əliyə keçid alır. Yenə də Əlidən (ə) bəhs açır, Xətaiyə keçir və fikrini onun şeiri ilə yekunlaşdırır.

Əsərin II fəslində “Məhəmməd Əli fenomeni”ni açmağa çalışan müəllif onun səfərlərindən, boks görüşlərindən, qələbələrindən danışır. “İdman ulduzu – boks kralı” adlı yazıda məşhur idmançının əsl adını öyrənirik. Müəllif yazır: “1960-cı ildə Roma Olimpiadasında gənc Amerika boksçusu Klassius Kley birinci yeri tutdu və aldığı qızıl medaldan imtina edərək onu dənizə tulladı. Bütün dünya bu hadisədən heyrətə gəldi. Gənc çempion isə bu əməlinin ABŞ-da aparılan irqi-ayrıseçkilik siyasətinə, qara dərililərin hüquqlarının tapdanmasına bir etiraz olduğunu bildirdi. Bu hadisədən sonra Klassius Kley peşəkar boksçular arasında yer tutmağa başladı və bir-birinin ardınca parlaq qələbələr əldə edərək məğlubedilməz döyüşçü imici qazandı. O, demək olar ki, bütün döyüşlərdə rəqibi üzərində nakautla qələbə çalırdı. 1964-cü ildə 12 il

boyunca məğlubiyyət acısını dadmayan Listonu yeddinci raundda yerə uzadan Klassius Kley dünya boks çempionu oldu. Bu vaxtlarda ABŞ Vyetnama qarşı ədalətsiz müharibəyə başladı. Klassius Kley bu müharibəyə getməkdən imtina etdi və ABŞ-ın eksponsionist siyasətini pislədi. Bunun müqabilində o, dörd il müddətinə həbs edildi və onun boks yarışlarında iştirakı yasaqlandı. Klassius Kley həbsxanada İslam dinini qəbul etdi və özünə "Məhəmməd Əli" adını götürdü".

Bu yazıda tədqiqatçı Məhəmməd Əlinin sonrakı yarışlarından, nakauta düşməyindən, xəstələnməsindən, onu böyük məhəbbətlə sevən, əvvəlcə dayəsi, nəhayət, həyat yoldaşı Lonnidən, Atlanta oyunlarında yenidən həyata qayıdışından əhatəli söz açmışdır. Bu fəsildə boksçuya həsr olunmuş "Məhəmməd Əli kimdir?" adlı esse də maraq doğurur.

Məşhur idmançı, əməkdar məşqçi Əbdülağa Sadıqov Hacı Soltana ünvanladığı "Müqtədir din xadimi" adlı yazısında onu 50 illik yubileyi münasibəti ilə Azərbaycan İdman Veteranları İttifaqı adından təbrik edir, onun idmanla bağlı kitablarını yüksək dəyərləndirərək yazır: "Dünya şöhrətli boksçu, XX əsrin ən yaxşı idmançıları sırasında öncül yerlərdən birini tutan Məhəmməd Əli haqqında kitabınız böyük oxucu rəğbəti qazanmaqla yanaşı, sizinlə dünya boksunun şahı Məhəmməd Əli arasındakı tanışlığın bünövrəsini qoydu. Mən sizinlə həm də həmkəndlim kimi də qürur duyuram...". (sms.səh.105)

Kitabın III fəsli "İdman, gözəllik və estetika" adlanır ki, burada müəllif Qədim Şərqə bir növ səyahət edir. Şərq mədəniyyəti, dövlətçiliyimiz, tariximiz, şifahi və yazılı ədəbiyyatımız, idmanın etik-estetik mənzərəsi və s. burada öz əksini

tapmışdır. Folklora müraciət edən tədqiqatçı el nəğmələrindən, xalq oyunlarından, zorxana tamaşalarından, pəhləvanların yarışlarından da bəhs etmişdir.

Kitabda idman texnikası haqqında da məlumat verilmiş, müxtəlif dərəcəli idmn ustalarından, müasir idmançıya məxsus mənəvi keyfiyyətlərdən, güləşin metadlarından, güləşçinin iradə hazırlığından da əhatəli danışan müəllif eyni zamanda idmanın sağlamlıq üçün vacibliyindən, övlad tərbiyəsi və cavanmərdlik qaydaları haqqında, hətta namazın mahiyyəti haqqında da söhbət açmışdır. Kitaba dahi şairimiz Məhəmməd Füzulinin "Səhhət və mərəz" əsərindən bir hissə də daxil edilmişdir. Sonra xülasə və Məhəmməd Əlinin Hacı Soltana göndərdiyi şəkillər verilmişdir. Sonda müəllifin tibbi qaydalardan, bioenergetikadan, Fransada İslama olan inamdan, Azərbaycan boksunun tarixindən bəhs açan müəllif, çempionatlarda iştirak edən pəhləvanların siyahısını da oxuculara təqdim etmişdir.

Haşiyə: Amerika Birləşmiş Ştatlarında boks üzrə dünya çempionu, Məhəmməd Əlinin anadan olduğu Kentuki ştatının Lusivil şəhərində Məhəmməd Əli adına beynəlxalq turnir təşkil olunmuşdu. Həmin turnirdə Azərbaycan Boks Federasiyasının Prezidenti Ağacan Əbiyev və Azərbaycan boksçuları da iştirak etmişdilər. Ağacan Əbiyev Məhəmməd Əliyə Azərbaycanda Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadənin onun haqqında kitab yazdığını xəbər vermiş, bu xəbəri çox sevinclə qarşılayan Məhəmməd Əli öz həyatı haqqında olan "Albom-kitab"ı şəxsi imzası ilə Hacı Soltana göndərmiş və öz kitabında albomdakı şəkillərdən istifadə etməsini istəmişdir.

Əfsanəvi boksçu Məhəmməd Əli Axund Hacı Soltanın Azərbaycanın hansı bölgəsində yaşadığını soruşmuş, Buzovna adını eşidəndə təəccüblə demişdir: "Azərbaycanla bağlı Bakı, Gəncə, Qarabağ adlarını eşitmişdim, amma Bzovna adını eşitməmişdim. Mən çox şadam ki, Azərbaycanda da məni sevənlər var. Haqqımda kitab yazıblar. Nəhayət, bildim ki, Buzovnada da mənim bir dostum vardır". Sonralar dövri mətbuatda "Məhəmməd Əlinin buzovnalı dostu" başlıqlı bir sıra məqalələr çap olunmuşdur ki, oxucular tərəfindən rəğbətlə qarşılanmışdır. Hacı Soltan isə öz növbəsində bu dostluğa sadiq qalmış, hətta Məhəmməd Əlinin dünyasını dəyişdiyini eşidib, onun üçün Quran oxumuş, Buzovnada Məşhədi Qərib məscidində ehsan vermiş, ruhuna Quran tapşırmışdır.

Hacı Yaşar Cahidin Hacı Soltana ithaf etdiyi şeirinin ardını da bu kitaba aid olduğu üçün burada təqdim edirik:

O, **Məhəmməd Əli**yə yazmaq ilən tazə kitab,
Təbliğ etmiş həmi İslam, həmi idmanımızı.

Rinqə gir, burda yarış söz ilədir olsa rəqib,
Sən nokautla tanıt onlara meydanımızı.

Yaşamaq, həm də yaşatmaq və yaratmaq eşqi,
Bu sevindirdi bütün xəlq ara hər yanımızı.

Yenə İslamdə idmanə yazıb tazə əsər,
Artırıb tazə xəbərlərlə bu elanımızı.

Biz dedik ki, yorulub, indi yəqin dinc oturar,
Sən demə təbə gəlib vəsf edib Yəzdanımızı.

Qoyub ürfanə qədəm mədhi-Nəbiylə bahəm,
On bir övladı ilə həm Şəhi-mərdanımızı.

Adını qoydu bu dürdanəyə "Məsumnamə",
San təəccübdə qoyub şairi-şahanımızı.

Var duamız ki, hələ tazə əsərlər ilə sən,
Nura qərq eyləyəsən Azəribaycanımızı.

Cahida, ülvi məhəbbət ilə həm hörmət ilə
Gəlmişik təbrik edək biz Hacı Soltanımızı.

# 4.YAŞAMAQ, YAŞATMAQ, YARATMAQ

Hacı Soltanın dördüncü kitabı “Yaşamaq, yaşatmaq, yaratmaq” 1998-ci ildə və təkrar 1999-cu ildə “Ozan” nəşriyyatında çap olunmuşdur. Kitabın əvvəlində Buzovna kəndinin gözəl ziyalıları ilə tanış oluruq. Təsadüfi deyil ki, müəllif kitabı buzovnalı xeyriyyəçi Nadir İmamnəzər olğu Quliyevin xatirəsinə ithaf etmişdir. Kitab Azərbaycanın Dövlət himni ilə açılır, sonra Heydər Əliyevin Azərbaycan yazıçılarının X qurultayında söylədiyi nitqindən bir hissə gəlir.

Kitabın redaktorları Hacı Nazim və Hacı Aydının giriş sözü də burada yer alır. Kitabı təqdim edən redaktorlar yazır: “Hacı Soltanın kənddə keçirdiyi, düzüb-qoşduğu tədbirlərdə - yubiley gecələri, ildönümləri, mövlud və şəhadətlə bağlı ehsanlar da bir ideyaya xidmət edir. Yaşamaq və yaşatmaq ideyasına! Müəllif hər bir xeyirxah işə ürəkdən sevinir və özü bilavasitə işlərin təşkilatçılarından birinə çevrilir, çünki həyatda bir amala xidmət edir: keçmişi yaşadıb, gələcəyə inamla təhvil vermək!” (səh. 7).

Hacı Soltan “Yaşamaq və yaşatmaq nə deməkdir?” adlı yazısında Qurani-Kərimin ayələrini sitat kimi verərək, fikirlərini əsaslandırır, peyğəmbərin 41 hədisindən 40-cısı olan “Daim yazılan savab yolları”nı təqdim edib, açıqlama verir. Daha sonra şeirlərdən sitat verən tədqiqatçı Buzovna kəndində doğulub, bu ədəbi mühütdə yazıb-yaradan şairlərdən söz açır və ədəbiyyat tariximizə qısa səyahət edərək, fikrini Hüseyn Cavidin “Azər” poemasının “Yaşamaq və yaşatmaq” bölməsindən şeir parçaları ilə yekunlaşdırır.

Hacı Soltan "Ad" haqqında nə bilirik?" adlı yazısını Allahın adı ilə və Füzuli, Nizami sözü ilə başlayır. Bu yazıda da Quran həqiqətlərindən, Peyğəmbər hədislərindən bəhs edən müəllif uşaqlara qoyulan adların mənalarını bilməyin vacibliyini qeyd edir və peyğəmbər, imam adlarına müraciət edərkən məsuliyyətli olmağın gərəkliliyini vurğulayır. Burada Allahın adları ilə bağlı rəvayətlərdən də söz açılır. Xətaidən, Seyid Əzimdən ad ilə bağlı misraları təqdim edən müəllif ad ilə bağlı bir sıra nəsr əsərlərinə, hətta tarixi əsərlərə də müraciət edir. Məqalədə dini ədəbiyyatla bədii ədəbiyyatın növbələşməsi onu göstərir ki, Hacı Soltan xurafat və fanatizmdən uzaqdır. O, dini fikirlərə müraciət etməklə yanaşı sadə, müasir oxucunun, kütlənin başa düşə biləcəyi bir tərzdə yazmağa üstünlük verir. Yəqin elə buna görə də, onun kitabları geniş oxucu auditoriyası qazanır və maraqla oxunur. Sənətşünas Ziyadxan Əliyev Hacı Soltanla müsahibəsində ona müraciətində kitaba ensiklopediya dəyəri vermişdir: "Sizin "Yaşamaq, yaşatmaq, yaratmaq" kitabınızı Buzovna kəndi haqqında ensiklopediya da adlandırmaq olar..." ("İşıqlı adam". sms.səh. 278).

Kitabda kəndin xeyriyyəçi insanları haqqında ayrı-ayrı məqalələr də yer alır. "İgidlik rəmzi, mərdlik timsalı" adlı yazı Hacı İsgəndər Abuzər oğlunun həyat fəaliyyətindən bəhs edir. Vaxtilə ermənilər Bakıda qırğın törədəndə bütün Bakı kəndləri ayağa qalxmışdı. Belə bir vaxtda Hacı İsgəndər öz hesabına çoxlu silah alıb camaatı silahlandırmış, kəndin ətrafında səngər qazıtdırmış, eyni zamanda digər kəndlərə də silah yardımı etmişdir. Hacı hətta döyüşdə fərqləndi-

yinə görə Nuru Paşa tərəfindən qəhrəmanlıq nişanına layiq görülmüşdür. 1937-ci ildə onu həbs edib, ermənilərə qarşı vuruşanların siyahısını istəyirlər. O isə dəhşətli işgəncələrə baxmayaraq, heç kimi ələ vermir. Hacı Soltan kəndinin qəhrəman oğlu haqqında bildiklərini yazmaqla, gələcək nəsillərə dəyərli məlumatlar çatdırır. Onun yazdığına görə, Hacı İsgəndərin cənazəsi belə ailəsinə verilməmişdir. Müəllif Hacının xeyriyyəçilik işlərindən də ətraflı söhbət açır, aclıq illərində öz balıq vətəgəsindən kənd camaatına pulsuz balıq payladığını, su quyuları qazdırdığını, gecələr kəndin küçələrində neft lampaları asdırdığını, yolların bərpasında iştirak etdiyini və s. qeyd edir. Yazıda müəllifin bir təəssüfünün şahidi oluruq. 37-ci il repressiyasının qurbanı olan Hacı İsgəndərin hələ də bəraət almamasını ürək ağrısı ilə qeyd edən tədqiqatçı, onun vəsaiti hesabına inşa olunan Buzovna Mədəniyyət sarayının niyə Hacı İsgəndərin adını daşımadığını sual edir və müstəqillik dövründə belə şəxsiyyətlərin xatirələrinin əbədiləşdiriləcəyinə inandığını bildirir. Əlisa Zeynallı Hacı Soltana həsr olunmuş məclis haqqında qələmə aldığı "İslamın zəngin mənəvi dəyərləri hamıya çatmalıdır" adlı məqaləsində yazır: "Yaşamaq, yaşatmaq, yaratmaq" əsəri oxucuları "olum-ölüm" fəlsəfi sualı ilə üz-üzə qoyur, onları düşündürür. Burada İslamın əsası olan "Qurani-Kərim" ayələri, hədislər, bəşəriyyətin sonuncu Peyğəmbəri (s) və ona ilk iman gətirənlərdən tutmuş ta bu günümüzə kimi möhkəm etiqadların bilik xəzinəsindən məharətlə istifadə edilərək, möhtəşəm bir əxlaqi abidə yaradılmışdır" (sms.səh.285).

Kitabda Seyid Əzim Şirvaninin oğlu, Buzovna torpağında

uyuyan Mir Cəfər haqqında gedən yazı da maraq doğurur. Yazının əvvəlində müəllif bir sıra şairlərin Buzovnada məskən saldığını, bəzilərinin Buzovnada dəfn olunduğunu qeyd edir, nəhayət Mir Cəfər ağaya keçir. Yazır ki, Seyid Əzimlə birlikdə Nəcəfdə təhsil alan Buzovna axundu Əbasəlt öz bağının bir hissəsini Seyid Əzimə bağışlayır. Oğlunun ürək xəstəliyini nəzərə alan şair həmin bağı ona verir və Mir Cəfər 85 yaşına kimi Buzovnada yaşayır. Yazı Seyid Əzimin oğluna həsr etdiyi şeirlər ilə bitir.

Kitabda bir sıra axundlar, mollalar haqqında yazılar da yer alır: Axund Məşhədi Məzahir, Molla Məmməd Axund Həmid oğlu, Axund Şeyx Cəlal Lənkərani, Molla Rzaəli, Axund Mirzəəli, Axund Əbdüllətif Buzovnalı, Şeyx Hüseyn Ramanalı, Molla Məhəmməd İsmayıl Asi, Dərviş Əlisöhbət Kürdəxanılı, Mir Möhsün ağa, maştağalı Salavat Ağaəli, Kərbəlayi Hacıbaba və s. Əli Yusifoğlu "Yaşamaq istəyən yaşatmağı bacarmalıdır" adlı məqaləsində yazır: "Geniş oxucu kütləsi, ələlxüsus, filoloqların, aspirantların, tələbələrin, müəllimlərin diqqətinə təqdim olunan "Yaşamaq, yaşatmaq, yaratmaq" kitabı gələcək tədqiqatlara aparan yolda ən tutarlı və etibarlı elmi mənbə olacaqdır... Kitaba daxil edilmiş seçmələrin demək olar ki, hamısı tapıntıdır: Tanrı, həyat, dünya, insan, sevgi, gül, məhəbbət və s. haqqında bildiyimiz və bilmədiyimiz tapıntılardır. Yüksək intellektuallığı və dərin emosionallığı ilə seçilən tapıntılar" (sms.səh.328).

Kitabın ikinci fəslində Buzovna kəndinin şeyxlərinin, axundlarının, mollalarının, rövzəxanlarının, Bakıətrafı kəndlərin mərhum və müasir dərvişlərinin adları qeyd edilmiş-

dir. Sonrakı yazılarda Buzovnadakı məscidlərin fəaliyyəti, dini mədrəsələr haqqında, bu sahədə zəhmət çəkən dindarlar barəsində məlumatlar alırıq. Sonra İkinci dünya savaşında, həlak olanların, Qarabağ münaqişəsi zamanı şəhid olanların adları siyahılanır. Daha sonra Buzovnalı şairlərin, elm adamlarının, müxtəlif sənət, peşə adamlarının adları ilə tanış oluruq. Bütün bu məlumatlar hər bir bakılı üçün, eləcə də Bakının tarixi ilə maraqlanan tədqiqatçılar üçün maraqlı ola bilər. Hacı Soltanın oxuculara təqdim etdiyi kitabların dəyəri də elə bundadır ki, onlardan bir sıra tədqiqatçılar faydalana bilərlər.

Kitabın üçüncü fəslində müxtəlif müəlliflərin yazıları verilmişdir. Professor Vilayət Quliyevin “Buzovna və ətraf kəndlər XIX əsr rus səyyahının gözü ilə” adlı məqaləsində həm müəllifin, həm də İ.Berezinin fikirləri ilə tanış oluruq. Burada bir sıra maraqlı yazılardan din xadimləri haqqında faydalı məlumatlar alırıq. “Molla Kamiyab Axundzadə”, “Axund Şeyx Cavad”, “Şeyx Hüseyn Molla Əhməd oğlu”, eləcə də müxtəlif müəlliflərin dəyərli insanlardan bəhs edən “Mübariz müəllim və mömin insan”, “Buzovnalı axund”, “Layiqli davamçılar yetişir”, “İman Nuri”, “Fədakar insan”, “Yazılmamış ad”, “Xalq müəllimi Heydər Eyvazov”, “Çörək elə çörəkçiyə verilib”, “Mənim cəfakeş anam”, “Təvəllüdü-1805” adlı məqalələr bizə zəngin material verir.

Dördüncü fəsildə isə ölüm və həyat haqqında müxtəlif yazılar, Qurani-Kərimdən müxtəlif ayələr verilmiş, vəsiyyətin məziyyətləri, faydaları açıqlanmışdır. Şəhid Ayətullah Mürtəza Mütəhhərinin “Ölümün mahiyyəti” adlı yazısında ölüm haqqında daha dərin bilgilər ala bilirik. Burada ölümdən

sonrakı həyat haqqında maraqlı fikirlər verilmişdir.

Bu fəsildə “Kəlilə və Dimnə”dən, “Şahnamə”dən parçalar, eləcə də Azərbaycan şairlərinin, o cümlədən Xaqani, Nizami, Nəsimi, Xətai, Füzuli, Əvhədi, Cami, Dəhləvi, Bakıxanov, Seyid Əzim, Didə, Dəxil, Sabir, Qümri, Sührəverdi, Dilsuz kimi şairlərin və XX əsr Azərbaycan poeziyasının bir sıra nümayəndələrinin dini, ədəbi fikirlərini əks etdirən şeir nümunələri verilmişdir.

Kitabda Hacı Soltana ithaf olunmuş şeirlər və bir sıra alimlərin onun haqqında dəyərli fikirləri də yer alır.

Kitabın sonunda Ülviyyə Niyazovanın BDU-nun ilahiyyat fakültəsində diplom işi kimi yazdığı “Azərbaycanda Həzrəti-Əli sevgisi” adlı yazısı yer alır. Girişdə Həzrəti-Əli şəxsiyyətini açıqlamağa Allahdan güc və cəsarət istəyən müəllif “Əli (ə) bəşər tarixində əbədi şəxsiyyət kimi” və “Həzrəti-Əlinin (ə) həyat və fəaliyyəti” adlı bölümlərdə bu vəzifənin öhdəsindən gəlməyə çalışmışdır. Gənc bir tələbənin ürəyində yurd salan Əli sevgisini, əlbəttə, alqışlamaq lazımdır.

Hacı Soltanın əvvəlki kitabları kimi bu kitabında da istər dini, istərsə də ədəbi yazılar, istər öz yazıları, istərsə də digər müəlliflərə məxsus yazılar öz sanbalı, fikir zənginliyi baxımından diqqəti çəkir. Kitabın maraqlı cəhətlərindən biri də budur ki, müəllif haqqında söz açdığı bir sıra şəxsiyyətlərin şəkillərini də əldə edib oxuculara təqdim etmişdir. Kitab istər tarixilik baxımından, istər dini, istər elmi-ədəbi cəhətdən oxucular üçün böyük əhəmiyyət kəsb edir.

Yazımızı Hacı Arif Buzovnalının Hacı Soltana həsr etdiyi şeirlərindən biri ilə yekunlaşdırırıq:

**Yaşamaq, yaratmaq, həm də yaşatmaq...**
Niyyətin nə gözəl niyyətdir, Hacı.
Tarixi kəslərə tarix yazmağın
Özü də tarixə zinətdir, Hacı.

İnsanın xoş işi getməz hədərə,
Özü qayıtsa da gəldiyi yerə.
Ömrünü pislikdə heç edənlərə
Hər sözün, əməlin ibrətdir, Hacı.

Məclislər bəzəyi oldu nəfəsin,
Kəsdi nadan nitqin, cühəla səsin.
Ömrünün mənası oldu həvəsin,
Bu səndə ilahi qüdrətdir, Hacı.

Gah dərviş diliylə danışdı qəlbin,
Gah pəhləvan kimi yarışdı qəlbin.
Gah Şah zəhmi ilə alışdı qəlbin,
Bu nə sirdur, necə hikmətdir, Hacı?!

Qəlbi yumşaqlarçün belədir aləm,
Bir tərəfdə sevinc, bir tərəfdə qəm.
Qəmin sevincindən çoxsa, qəmin kəm,
Bir şey başqa şeyə nisbətdir, Hacı.

Qafillər dərdini könlünə salma,
Əyri baxışları gözünə alma.
Bədxahlar fikrindən pərişan olma,
Həsəd nacinslərdə xislətdir, Hacı.

Sən söz bağçasından zövq al, çək ətir,
Kəlməyə kəlmə tut, sözə söz gətir.
Təbin dəryasından gövhərlər yetir,
Sərraflar saf sözə həsrətdir, Hacı.

Qırx yaş əzəlidir əbədiyyətin,
Hələ bilinəcək qədrin, qiymətin.
Hər işin əzəli olsa da çətin,
Zəhmətin ən ali zəhmətdir, Hacı.

Sənə hər işində kömək ola Həq,
Edə hər arzuna səni müvəffəq.
Bu istək yetəcək yerinə mütləq,
Hər şey sahibinə qismətdir, Hacı.

Sən yaşayacaqsan tarixdə bişək,
Yaşayıb, yaradıb, yaşatdığın tək.
Hər kəsin amalı bu olsun gərək,
Kişinin qazancı rəhmətdir, Hacı.

Arifəm, hər dəfə söyləyirəm mən,
Səndəki bu həyat eşqinə "əhsən".
Böyük Xətainin nəvəsisən sən,
Bu sənə ən böyük diqqətdir, Hacı.

## 5.XƏTAİŞÜNASLIĞA HƏDİYYƏ

Hacı Soltanın növbəti kitabı "Xətaişünaslığa hədiyyə" adlanır. "Ozan" nəşriyyatının 1998-ci ildə çapdan buraxdığı bu "Elmi, ədəbi-bədii" topluda bir sıra ədəbiyyatşünasların, eyni zamanda müxtəlif peşə sahiblərinin Şah İsmail Xətai haqqında məqalələri, Xətai şeirlərinə yazılmış nəzirələr, təzminlər və ona həsr edilmiş şeirlər toplanmışdır.

Kitab Xətainin şəkli ilə açılır və şəklin altında M.Ə.Rəsulzadənin belə bir fikri yazılmışdır: "Şah İsmayılın sarayı Azəri türk ədəbiyyatının yaradıcı ocağı və bir akademiyası idi". Sonra Xətainin, Rəsulzadənin, Həsən bəy Ağayevin və Heydər Əliyevin vətənpərvər fikirləri təqdim olunmuşdur.

Kitabın annotasiyasında oxuyuruq: "Oxuculara təqdim olunan "Xətaişünaslığa hədiyyə" adlı bu toplu Azərbaycanın XVI əsrdə yaşamış görkəmli dövlət xadimi, böyük şairi və filosofu Şah İsmayıl Xətai haqqında orta əsrlər və çağdaş tədqiqatçıların, xüsusilə, azərbaycanlı xətaişünasların elmi araşdırmalarının mühüm nailiyyətlərini özündə birləşdirən dəyərli kitabdır. Məqalələrin bir çoxu elmi professonallığı ilə seçilir məzmun etibarilə xətaişünaslıq və azərbaycanşünaslığın etnokultur tarixi, incəsənəti (memarlıq, musiqi, rəssamlıq, xalçaçılıq), tarix, fəlsəfə, din, bədii təfəkkür mədəniyyəti, siyasət, dövlətçilik, iqtisadiyyat kimi mühüm sahələri əhatə edir. Topluda, xüsusilə, Xətai və Azərbaycan milli mədəniyyətinin, milli dilimizin intibahı, milli özünə qayıdışımızın yeni tarixi mərhələsində dil və milli birliyimizin inkişafı və möhkəmlənməsi məsələsinin öyrənilməsinə ciddi əhəmiyyət verilir.

Kitabda Şah İsmayıl Xətainin siyasi-ədəbi və mədəni sahələrdə gərgin fəaliyyəti, əxlaqi-estetik görüşləri və onun yüksək insani keyfiyyətləri layiqincə təqdim olunmuşdur".

Tərtibçi kitabda Azərbaycan Respublikasının "Şah İsmayıl" ordeninin statusu və təsvirinin təsdiq edilməsi haqqında Azərbaycan Respublikasının qanununu, "Şah İsmayıl" ordeninin statusunu və ordenin təsvirini də vermişdir.

Jurnalist Kənan Hacıyev "Şah İsmayıl Xətainin buzovnalı nəvəsi" adlı ön sözündə Xətai hünərindən, Hacı Soltanın yaradıcılıq fəaliyyətindən və "Xətaişünaslığa hədiyyə" kitabından qısa konkret söz açaraq yazır: "Bu əsər "Şah İsmayıl Xətai" kitabının davamı kimi yazılıb. Ancaq bu topluya ön söz yazmaq mənim bəxtimə düşdüyündən bəri başdan sizdən bir xahişim var: bu kitabı elə-belə vərəqləməyin, dönə-dönə oxuyun, iş masanızın əl çatan yerində saxlayın. Çünki bu kitab hər zaman, hər dəqiqə gərəyiniz olacaq, sizi istiqbalımızı qorumaq üçün səngərində sərvaxt saxlayacaq. Azərbaycan əsgərləri və bütün azadlıq mücahidləri üçün Şah İsmayıl şücaəti, düşmənlə döyüşlərdə göstərdiyi misilsiz rəşadəti vətənpərvərlik və fədakarlıq nümunəsidir. Mən çox istərdim ki, bir əlində silah tutan Azərbaycan əsgəri o biri əlində məhz bu kitabı tutsun".

Kitabın "Tədqiqatlar, araşdırmalar" bölümündə Əli Məmməd Nəbibəylinin "Xətai Allahın adıdır" adlı məqaləsindən sonra Hacı Soltanın "Xətai əxlaqı" və "Xətai bir alim kimi" məqalələri yer alır. "Xətai şücaəti və rəşadəti, Xətai şeiri Xətai əxlaqının məhsuludur" qənaətinə gələn müəllif yazır: "Bütün başqa xüsusiyyətlərilə bahəm Xətai gözəl əxlaq sahibi, mərifət məqamında oturmuş bir övliyadır. Şah İsmayılın

bütün hərəkətlərinə nəzər salarkən bu məqamı unutmamaq lazımdır. Xətai əxlaqı kamil əxlaqdır. İnsani-kamilin bütün hərəkətləri İlahi nəzəri altında ölçülüb-biçilir, İlahi əmrinə uyğun həyatda özünü göstərir. İnsani-kamilin, Haqqa qovuşmuş bir insanın Haqdan uzaq hərəkəti mümkündürmü? Xətai əxlaqı haqda danışarkən bu əxlaqın Haqdan gələn bir əxlaq olduğunu unutmamaq lazımdır" (səh. 17).

Kitabda Məhəmməd Əmin Rəsulzadənin "Azərbaycan mədəniyyət ənənələri" əsərindən bir parça və Məhəmməd Fuad Köprülüzadənin "Xətai Şah İsmayıl Səfəvi" adlı yazısı verilmişdir. Daha sonra Əzizə Cəfərzadə, Oqtay Əfəndiyev, Şamil Məmmədbəyli, Zülfəli İbrahimov, Anar, Tofiq Hacıyev, Azadə Rüstəmova, Vera Devitt, Rafael Hüseynov, İmperial Həsənli, Yaqub Mahmudov, Nüşabə Araslı, Vəcihə Feyzullazadə, İmamverdi Həmidov, Məhərrəm Qasımlı, Çingiz Sadıq oğlu, Əlyar Səfərli, Mahmud İsmayıl, Möhsün Nağıyev, Kamil Vəli, Hacı Bəhlul Abdulla, Hacı Sabir Həsənli, Məmməd Aslan, Qəzənfər Paşayev, Təvəkkül Səlimov, Kamran Məmmədov, Ayaz Vəfalı, Zəminə Hacıyeva, Əlisa Nicat, Şahin Fazil Fərzəlibəyli, Rasim Əfəndi, Nikpur Cabbarlı, Məhərrəm Hüseynli, Pərvin Darabadi və Eldəniz İbrahimov, Nərgiz Quliyeva, Elmira Arzumanlı, Nadir Məmmədli, N.M.Hüseynov, Ariz Abdullayev, Mobil Aslanlı, Sabirə Dünyamalıyeva, Yadigar Əliyev, Şaməddin Xəlilov, Çingiz Qacar, Elman Cəlilov, Tahirə Nurəliyeva, Nüşabə Hüseynli, Şərif Kərimov, Məşədixanım Nemətova və Süleyman Allahverdiyev, Məşədixanım Nemətova və Vəfa Quliyeva, Rəfiqə Mustafayeva və Bəybala Abbaslı, Rəfiq Özdək kimi görkəmli tədqiqatçı alimlərin Xətainin həyat fəaliyyəti və yaradıcılığı ilə bağlı məqalələri gəlir.

Əlisa Zeynallı Hacı Soltanın yaradıcılığına həsr olunmuş məclisdən qələmə aldığı “İslamın mənəvi dəyərləri hamıya çatmalıdır” adlı məqaləsində “Xətaişünaslığa hədiyyə” əsərini bir çox sahələri əhatə edən bir abidə kimi vurğulayaraq yazır: “...Onda oxucu, bənzəri olmayan tarixi şəxsiyyət, dəyərli alim, zəngin mədəniyyət nümayəndəsi, basılmaz sərkərdə, unudulmaz dövlət xadimi kimi özünə ad qazanmış bir insanın əfsanəvi həyatına “səyahətə çıxır” və haqqında söhbət açılan insanı özünün idealı kimi qəbul edir. Hacı Soltanın əsərləri ideya və əxlaqi dəyərləri nöqteyi-nəzərdən çox qiymətlidir. Çünki onun mayası əsl saf mənbədən qidalanmışdır. Kim bu mənbədən bəhrələnirsə, kamillik zirvəsinə doğru irəliləyir və layiqli payını alır” (sms. səh. 286).

“Salnamələri vərəqlərkən” adlı bölümdə müxtəlif mənbələrdən toplanmış məlumatlar, Hacı Soltanın A.Ağayevin, Füzuli Ramazanoğlunun və Əlisa Nicatın yazıları ilə tanış oluruq. Kitabın ən maraqlı bölümlərindən biri “Şeyx Səfi nəslinin yadigarları”dır. Xətai ilə bağlı filmin çəkilməsi üçün bir sıra adamların səyi və görülən tədbirlər ilə bağlı yazılar da maraq doğurur.

Kitabın resenziyalar bölümündə Hacı Soltanın əvvəlki kitabları haqqında Vasim Məmmədəliyevin, Oqtay Əfəndiyevin, Allahşükür Paşazadənin, Ağacan Əbiyevin, Tofiq Hacıyevin, Hacı Bəhlul Abdullanın, Fuad Qasımzadənin, Əziz Mirəhmədovun, Təvəkkül Şağani Səlimovun, Dildarın, Kənan Hacıyevin, Allahverdi Məmmədlinin rəyləri verilmişdir.

Hacı Soltanın “Xətaişünaslığa hədiyyə” kitabı bir çox tədqiqatçıların stolüstü kitabına çevrildi. Xalq yazıçısı, professor

Əzizə Cəfərzadə "İslam mədəniyyətinin carçısı" adlı məqaləsində Hacı Soltanın çoxcəhətli fəaliyyətini vurğulayaraq yazır: "Onun təşkil etdiyi iki ədəbi gecə məni valeh etmişdi. Bunlardan biri böyük hökmdarımız, sərkərdəmiz, şairimiz və din-təriqət başçımız Şah ismayıl Xətaiyə həsr olunmuşdu. Hacı sonralar bu əməlini, tədqiqatını davam etdirərək "Şah İsmayıl Xətai" və "Xətaişünaslığa hədiyyə" kitablarını meydana çıxardı. Kitablar o qədər lazımlı və gərəklidir ki, onların haqqında haradasa ayrıca danışmaq lazımdır. Hacı Soltan Xətai ilə bağlı yazılan məqalə, tədqiqat və elmi incələmələri bir yerə toplamış və sanki demişdir: hörmətli tədqiqatçı, aspirant, dissertant... gəzib, arxivlər axtarıb mənbə toplama, o, sənin əlindədir. Nə istəsən, kimi istəsən, burada taparsan..." (sms. səh. 30).

"Mübahisələr, etirazlar" bölümündə isə bəzi yazılarda gedən Xətaiyə layiq olmayan fikirlərə qarşı Rəşid Abbasov, Seyidağa Onullahi, Əlisa Nicat, Kənan Hacıyev, Əmrah Xanməmmədli, Əbdüləli Kərimov, Sədaqət Əsgərova kimi ziyalıların etiraz səsi eşidilir.

"Xətai yaradıcılığından yarpaqlar" bölümündə şairin həm azərbaycanca, həm də farsca şeir nümunələri verilmişdir. "İthaflar, nəzirələr" bölümündə Hacı Soltanın Həzrəti-Əliyə (ə), Xətaiyə, Nizamiyə, Füzuliyə, A.A.Qüdsiyə yazdığı şeirlər, Firudin Qurbansoyun "Xəta" adlı dramı, Şahin Fazilin "Çaldıran" adlı dramatik poeması, Nazim Rizvanın "Xətai" poemasından bir hissə və "doğrusu" rədifli qəzəlinə nəzirəsi, Zəlimxan Yaqubun "Şeyxim mənim, şahım mənim, şairim mənim" adlı şeiri, Vaqif Aslanın "Ruhlarla söhbət" poemasında parça, Elman Həbibin "Dilim mənim, elim mənim",

Zəki İslamın "Varıymış" adlı şeirləri, Qəşəm İsabəylinin "Türk sultanı Səlimin Azərbaycan şahı Xətaiyə məktubu" adlı poeması, Şükür Şənolun "Çaldıran döyüşündən sonrakı on il", Ləyaqət Ağaəmi oğlunun "Zəka Sultanı" (Hacı Soltana ithaf), Əjdər Ağazadə Atəşin "Allahın haqq bəndəsiyəm" adlı şeirlər təqdim olunmuşdur.

Kinorejissor Şeyx Hacı Əbdül Mamudbəyli Hacı Soltanın yaradıcılığına həsr olunmuş məclisdəki çıxışında demişdir: "Məni Hacı Soltanla birləşdirən Şah İsmayıl Xətai oldu. İlk dəfə "Xətai" təxəllüsünün əbcəd hesabı ilə Allahın 1001 adı olmasını mən Hacı Soltanın "Xətaişünaslığa hədiyyə" kitabından öyrəndim və Hacı Soltanı "Şah İsmayıl Xətai" filminin dini məsələlər üzrə baş məsləhətçisi seçdim" (sms. səh.157-158).

Kitabın sonunda Ziya Paşa ilə Hacı Zeynalabdin Tağıyevin şəkilləri və sözləri verilmişdir.

Yazımızı Qələndər Naxçıvanlının Hacı Soltana yazdığı və Xətaiyə işarə olunan şeiri ilə bitiririk:

Çoxdur Buzovnada məşhədi, hacı,
Hamıdan hörmətli Hacı Soltandır.
Quranı dərk edib mənasın bilən,
Hamıdan hörmətli Hacı Soltandır.

**Şah İsmayıl Xətai**dən söz desin,
Füzulidən, Nizamidən yüz desin.
Sual verin, cavabını düz desin,
Hamıdan hörmətli Hacı Soltandır.

Danışanda, baxın, necə coşur o,
Elə bil ki, bir dəryadır, daşır o.
Kitab yazır, neçə nəğmə qoşur o,
Hamıdan hörmətli Hacı Soltandır.

Sədidən və Nəsimidən xəbərdar,
Seyyid Əzim Şirvanidən söz açar.
Belə getsə, yüksəklərə ucalar,
Hamıdan hörmətli Hacı Soltandır.

Girəndə məclisə verər salamı,
Ehtiramla durar ayağa hamı.
Danışanda heyran edər adamı,
Hamıdan hörmətli Hacı Soltandır.

İştirak eyləyər xeyirdə, şərdə,
Oturar bir yanda, saxlayar pərdə.
Hələ yazacaqdır neçə əsər də,
Hamıdan hörmətli Hacı Soltandır.

Onda vardır ədiblərin söhbəti,
Günü-gündən çoxalacaq hörməti.
İllər keçsə, itməyəcək zəhməti,
Hamıdan hörmətli Hacı Soltandır.

07.09.2001.

# 6.İSLAM İDMAN ANTOLOGİYASI (Ensiklopedik məlumatlar)

Hacı Soltanın növbəti kitabı "İslam idman antologiyası. (Ensiklopedik məlumatlar)" adlanır. Kitab 1999-cu ildə "Ozan" nəşriyyatında çap olunmuşdur. Kitab məşhur idmançıların şəkilləri ilə açılır. Müəllif kitabı şəhid və dünyasını dəyişmiş Azərbaycan idmançılarının əziz xatirısinıə ithaf etmişdir. Kitabın redaktorları Hacı Aydın Kamil oğlu və Məşədi Elşad Nəriman oğludur.

Kitabın "İslam və idman" adlanın I fəsli kəlmeyi-teyyibə, kəlmeyi-şəhadət və Quran ayələri ilə açılır. Müəllif burada 12 imamın (ə.m.) şəkilllərini də vermişdir.

Hacı Soltanın "İdman sağlamlıqdır" adlı yazısı Xətainin "Pəhləvanlar çox cahanda, Rüstəmi-Zal olmuşam, Həm Skəndər hikməti, mülki-Süleyman məndədir" beyti ilə başlayaraq yazır: "İnsan uca Allahın yaratdıqlarının ən şərəfli və dəyərlisidir. Və həm də bu dəyərlilik daha çox onda qiymətli olur ki, insan daxilən, ruhən təmiz, pak olsun. Ruhən paklıq isə, şübhəsiz, canın saflığına, salamatlığına dəlalət edir. Çox olsun ki, "Sağlam bədəndə sağlam ruh olar" deyimi də elə bu görüşlərdən pərvəriş tapmışdır və bunu bir qədər başqa, yəni "Sağlam ruh sağlam bədəndə olar" şəklində də demək mümkündür.

İnsan bədəninin sağlamlığını təmin edən ətalət, süstlük, tənbəllik yox, zəhmət, iş-gücdür. Bundan savayı, bədənin sağlamlığı həm də müxtəlif təmrinlərin icrasından, müasir terminlə desək, idmanla məşğul olmaqdan çox asılıdır.

Qiymətlidir ki, elə müqəddəs İslam dinimiz də ayrı-ayrı fiziki təmrinlərin yerinə yetirilməsinə, idmana çox böyük əhəmiyyət vermişdir...”(səh. 8). Müəllif yazısında Peyğəmbərimizin (s) hədislərinə müraciət edərək fikirlərini oxuculara daha dəqiq çatdırmağa çalışmışdır.

İnsan bədəninin sağlamlığından bəhs açan müəllif həm folklordan söhbət açır, həm də klsssik şeir nümunələrindən istifadə edərək fikirlərini qüvvətləndirir və dini qayda-qanunlara əməl etməklə, ibadətlə insan ruhunun və cisminin saflaşdırıldığını, sağlamlaşdırıldığını diqqətə çatdırır. Peyğəmbərdən və imamlardan hədislər nəql edən müəllif ibadətin səhhət üçün faydalı olduğunu vurğulayır və bir sıra islami hikmətləri açıqlayır. Hiss olunur ki, bu yazdıqları eləbelə deyil, Hacı Soltanda həm islami biliklər, həm də idmanla bağlı məlumatlar, eyni zamanda islamla idmanın vəhdətinə güclü inam vardır. Müəllifin qızı Məşhədi Zeynəb Əlizadə səmimi övlad sevgisi ilə əlinə qələm götürüb, “Biz atamıza oğul əvəziyik” adlı məqaləsində atası haqqında dəyərli fikirlərini qələmə alaraq yazır: “...Ali məktəbdə öz elmi işimi yazarkən də atamdan kömək almışam. Onun idman sahəsində yazdığı əsərlər, İslam-idman əlaqəli araşdırmalarından diplom işimi yazarkən çox yararlanmışam. Elə “Azərbaycan müsəlmanlarının idmana baxışı” adlı kitabımın araya-ərsəyə gəlməsi də onun zəhmətinin bəhrəsidir” (sms.səh.136-137).

Kitabda Həzrəti-Mühəmmədin (s) öyüdləri, Həzrəti-Əlinin (ə) dedikləri, eyni zamanda onun “Nəhcül-bəlağə” əsərindən parçalar yer alır. Həzrəti-Əlinin (ə) igidliyindən söz açan müəllif Xəndək davasını, Xeybər müharibəsini xatırladır.

İmam Həsənlə (ə) İmam Hüseynin (ə) başına gələnlər-

dən bəhs edən müəllif Kərbəla hadisəsini yada salaraq, Əli Əkbərin (ə) döyüşünü, Həzrəti-Abbasın (ə) meydandakı rəşadətini təsvir edir və Həzrəti-Zeynəbin (s.ə) xütbəsi oxu-culara təqdim edir. Ümumiyyətlə, Hacı Sotan əsərlərində bütün gözəl, dəyərli, lazımlı şeyləri islami cəhətdən qiymətləndirməyi bacarır. Bu yolda daim Əhli-beyti (ə.m) örnək götürür. Əlisa Zeynallı Hacı Soltanın yaradıcılığına həsr olunmuş məclisi əhatə etdiyi "İslamın zəngin mənəvi dəyərləri hamıya çatmalıdır" adlı məqaləsində yazır: "İslam idman antologiyası" əsərində Peyğımbərin (s) öyüdləri, zahiri görkəmi və xasiyyəti, Həzrəti-Əlinin (ə) elminin inciləri və əxlaqından geniş istifadə etməklə, idmana oan münasibət ətraflı təhlil edilir. Burada İslamın idmana münasibətini insanların sağlamlığının təmin edilməsinin başlıca məqsədi kimi qəbul edilməsi tərənnüm edilir. Sağlam düşüncə, sağlam əqidə, sağlam əxlaq, sağlam əməl islamın başlıca prinsipləri kimi göstərilir. İslam elmindən istifadə edilən "anlayış"ların izahına geniş yer verilir" (sms. səh. 286).

I fəslin sonunda verilmiş Əqiqi Bəxşayeşinin "Əli (ə) məktəbində cihad və şəhadət", M.Əlizadənin "Əhli-beytin matəmində Əmirəl-möminin Əli ibni-Əbu Talib (ə)", "İmam Hüseynin (ə) şəhadəti", H.M.Seyidzadənin "İmam və əməvilər (islami söhbətlər)", Əvəz Sadıqovun "Kərbəlada şəhid olmuş azərbaycanlı kimdir?" adlı yazılar və Seyid Yəhyəvinin mərsiyələri maraq doğurur.

II fəsil "Mərsiyələr və qəsidələr" adlanır və burada Dağlı, Məzlum, Raci, Faiz, Vagir, M.H.Qüdsi, Dilriş, Qumri, Münzəvi, S.Ə.Şirvani, M.Ə.Sabir, Harud, M.Bisavad, Abdulla Şaiq, Dəxil, Məhəmməd, Abdulla bəy Asi, M.Füzuli, Dilsuz, Həqir, Xətai,

Şeyx Şamil, Hacı Soltan, S.Ə.Hüseyni, Ə.Vahid, Ə.Mahir, Ş.Fazil, Ə.Rəcəbli kimi şairlərin əsərləri yer alır.

"Dastanlarımızdan soraqlar" adlı III fəsildə "Kitabi-Dədə Qorqud"dan "Salur qazanın evinin yağmalandığı boy", Firdövsinin "Şahnamə"sindən "Rüstəm və Söhrab (ixtisarla)", "Koroğlu"dan bir hissə və dastandan seçmə şeirlər, Xaliqin "Lələ"və Əli Səmədlinin "Şah İsmayıl Xətai", "Qaçaq Nəbi", "Cavad xan", Cəsarətli xan", "Barışıq olmayacaq" adlı yazıları verilmişdir.

"Klassik ədəbi irs və idman" adlanan IV fəsildə Hacı Soltanın "Şah İsmayıl dövründə idmanla ədəbiyyatın vəhdəti", Arif Buzovnalının "Ədəbiyyatda cəng və ya klassik idmançılar", İ.A.Mollayevin "Əfzələddin Xaqanidə əmək və fiziki tərbiyə", Məhəmməd Nəsirəddin Tusi və fiziki tərbiyə", "Marağalı Əvhədi və fiziki tərbiyə", "Məhəmməd Hinduşah Naxçıvani və fiziki tərbiyə", "Nəsimi və fiziki sağlamlıq", Mobil Aslanlının "Xətai və fiziki mədəniyyət" adlı əhatəli elmi məqalələr yer alır.

V fəsil "Atlar və ov heyvanları" adlanır və Qurani-Kərimin "Əl-adiyat (Qaçan atlar)" surəsi ilə açılır. Müəllif 19 məşhur şəxsin məşhur atının adını və "Atlar nə vaxt əhlləşdirildilər və onlara niyə "Ciyad" adı verildi?", "At dünya xalqlarının atalar sözlərində" adlı yazılarda maraqlı faktlar təqdim edir.

Bu fəsildə verilən Bəhram Elçinin "At və igid" məqaləsi və Ayətullah Hacı Məhəmməd Fazil Lənkəraninin "Heyvanların başının kəsilməsi və şikar edilməsinin hökmləri" adlı əhatəli yazısı oxuculara maraqlı məsələləri açıqlayır.

Kitabın VI fəsli "Azərbaycan idmanı və idmançılar" adlanır və Heydər Əliyevin "Qədim dövrlərdən indiyə qədər idman

insanları həm fiziki, həm də mənəvi cəhətdən yüksəldən bir vasitədir" sözləri ilə və XXVI yay Olimpiya Oyunlarında iştirak edəcək idmançılarımızla görüşdəki "Azərbaycan idmanının şöhrətini yüksəklərə qaldırın" adlı çıxışı ilə açılır. Sonra İlham Əliyevin Əməkdar məşqçi Muxtar Dadaşova təbriki və Azərbaycan Respublikasının Milli Olimpiya Komitəsinin heyəti və XXVII yay Olimpiya Oyunlarına hazırlıq haqqında Azərbaycan Respublikası Prezidenti Heydər Əliyevin sərəncamı verilir.

Müəllif bu fəsildə "Azərbaycanın məşhur pəhləvan güləşçiləri və idman ustaları"nın, "Buzovnalı idmançılar"ın, Şəhid idmançılar"ın siyahısı və "Altıaylıq pəhləvan", "Əfsanəvi insan Brüsli" adlı yazıları təqdim edir. Sonra İlhamə Bəzimqızının "Van Dam Füzuli Musayevdən qorxdu", Əli Fərəcovun "İdman fədaisi", İ.Quliyev və V.Hacıyevin "Rüstəm kişi ötən günləri xatırlayır" və s. yazılar gəlir, sambo və güləşdən, onların inkişaf tarixindən, məşhurlardan, hakimlərdən maraqlı söhbət açılır. A.Əzimov və M.Rəsulovun "Bizim ilk çempionumuz", "Azərbaycan güləşçiləri beynəlxalq yarışlarda", Sərbəst güləşmə", Muxtar Dadaşov və Salar Aslanovun "Azərbaycan pəhləvanları", "Peşəkar pəhləvanlar", "Klassik güləş", Kamal Rəhmanovun "Qızıl yuxuların gümüş həqiqəti", Sofiya İsrafilovanın "Son illərdə 28 məşqçi, 41 idmançı itirmişik", "İdmançılarımızı ayaq üstdə alqışladılar", "Boks şahı Məhəmməd Əli", "Məhəmməd Əli fenomeni", Arif Buzovnalının "Məhəmməəid Əli kimdir? (esse)" və s. yazılarda da diqqəti çəkən məqamlar çoxdur. Azərbycan İdman Veteranları İttifaqının sədri Əbdülağa Sadıqov "Müqtədir din xadimi" adlı təbriknaməsində Hacı Soltanı 50 illik

yubileyi münasibəti ilə ittifaq adından təbrik edir, səmimi hisslərini, ürək sözlərini çatdıraraq yazır: “Möhtərəm Hacı Soltan! Siz Azərbaycanda idmana dini-ideoloji prizmadan yanaşan, idmanla din arasındakı qarşılıqlı əlaqələrin təhlilini verən yeganə din xadimi və bu mövzuda yazılmış əsərlərin ilk müəllifisiniz. Sizin idman və islam mövzusunda yazdığınız əsərlər, xüsusən də tərtibçisi olduğunuz “Azərbaycan İslam-idman antologiyası” əksər idman mütəxəssislərinin, eləcə də idmançıların masaüstü kitabına çevrilib. İdman mövzusuna müraciətiniz və islam dininin idmana verdiyi dəyər barədə fikirləriniz sizin müdrikliyiniz və bəsirətliliyinizin təzahürüdür. Bu, məni, ömrünün 65 ilini idmana həsr etmiş bir insanı nəhayətsiz dərəcədə sevindirir və fərəhləndirir. Mən elə bilirəm ki, hörmətli Prezidentimiz İlham Əliyevin sərəncamına müvafiq olaraq yaradılacaq Azərbaycan idman muzeyinin ekspozisiyalarında sizin “İslam-idman antologiyası” kitabınız özünəməxsus yer tutacaq” (sms.səh. 104-105).

Kitabın VII fəslində rəylər yer alır.

“Qaynaqlar” adlanan VIII fəsildə Azər Rüstəmlinin ASE-dən və Əmirhüseyn Elşənin “Varlıq” ensuklopedik toplusundan idmanla bağlı topladıqları məlumatlar təqdim olunmuşdur.

Hiss olunur ki, Hacı Soltan idmanla bağlı çox material toplamış, sonra onların hamısını kitaba daxil etmək istəmiş, rəngarənglik yerləşdirmə zamanı çətinliklər yaratdığından bəzi yerlərdə kitabın tərtib prinsipləri pozulmuşdur. Amma bütün bunlara baxmayaraq kitab idmanla maraqlananlar üçün dəyərli, maraqlı vəsaitdir.

Yazını Əzizzadə Əli Məhəmməd Natavaninin sevimli şagirdi Hacı Soltana ithaf etdiyi və bu kitabla əlaqəli olan şeirlə yekunlaşdırırıq:

Yaşamaq yaşatmaqdır, sən yaşadırsan adını,
Həm bilirsən ən mənalı yaşamağın dadını.
Yaşadırsan yaxınını, yaşadırsan yadını,
Görüm ki, yüz yaşayasan bu dünyada, ay oğul.

Yaşadırsan Şirvanini, **Xətaini**, Qumrini,
Doğru yola çağırırsan hər cür pisi, əyrini.
Namərd olan heç vaxt bilməz igid oğul qədrini,
Üzün ağdır, alnın açıq bu dünyada, ay oğul.

Vətənindən uzaqlarda da sən tanıt xalqını,
Sınaqdan sınağa çox çəkib bu həyat xalqını.
Yaşa, yaşat Vətənini, yaşa, yaşat xalqını,
Yaşayacaq adın sənin bu dünyada, ay oğul.

Buzovna, 1977.

# 7.MƏSUMNAMƏ

Hacı Soltanın növbəti kitabı “Məsumnamə” adlanır və 1999-cu ildə “Ozan” nəşriyyatında çap olunmuşdur. Müəllif kitabı atasının əziz xatirəsinə ithaf etmişdir. Kitabın redaktoru Arif Buzovnalı kitaba yazdığı “Ön söz”də kitabın səciyyəsini vermiş, Hacı Soltanın yeni orijinal əsər yaratdığını vurğulayaraq, fövqəlbəşər insanlara həsr olunmuş şeirlərə münasibətini bildirmişdir.

“Məsumnamə” Allah-təalaya “Münacat”la başlayır. Allahı Quran ayəsinə and verən şair hər beytdə istək və arzularını obrazlı ifadələrlə bildirir. Növbəti şeirdə on dörd məsuma salam verən Hacı Soltan insanları bu adətə səsləyir:

Daim, ey oğul, Qaili-Qurana salam ver,
Sən Həzrəti-Peyğəmbərə mərdanə salam ver.

Yad eylə Əli halini ol rahi-Xudadə,
Dur səcdeyi-taətdə axan qanə salam ver.

Ol Fatimədir, Həzrəti-Zəhrayi-nəcibə,
Hər dərdə dəva didəsi giryanə salam ver.

Növbəti beytlərdə müəllif Əli (ə) və Fatimənin (s.ə) on bir övladına salam verməyi tövsiyə edir. Qazi Axund Hacı Cəbrail Hacı Soltanın “Mövludnamə” kitabı haqqında yazdığı “İlk orijinal əsər” adlı yazısına belə başlayır: “İllərlə yaradıcılığını izlədiyim əziz dostum Qazi Axund Hacı Soltan Hüseynqulu

oğlu hər dəfə olduğu kimi bu dəfə də məni heyrətləndirdi. Belə ki, bu alimin hər yeni kitabı hələ əlyazma halında olduğu vaxt əlimə keçir və mən istər-istəməz bu əsərlərin ilk oxucusu oluram. Lakin, bu dəfə özümü kiçik bir rəy yazmaqdan saxlaya bilmədim. Halbuki, müəllifin çahardəh məsumu vəsf eləyən "Məsumnamə" əsərinə geniş bir rəy yazmışdım. Təəssüf ki, müəyyən səbəblər üzündən bu yazı o vaxt müəllifə çatmamışdır..." (sms.səh.250).

Həzrəti-Peyğəmbərə (s) həsr olunmuş "Məhəmməd" rədifli qəzəldə bədii obrazlarla kamal, hikmət sahibini vəsf eləyən şair sonda öz sonsuz sevgisini, sədaqətini bəyan edir. "Fatimə" rədifli növbəti qəzəldə isə müəllif iki dünya xanımlarının Xanımı, iffət, həya, paklıq, saflıq rəmzi, şəninə "Kövsər" surəsi nazil olan, dörd tarixi şəxsiyyət böyüdən, Əli məqamını nuru ilə işıqlandıran Peyğəmbər qızına (s.ə) öz izzini bəyan edir.

"Əli" rədifli qəzəldə Şahi-vilayəti "hər iki mülkdə şahim", "ruzi-qiyamətdə pənahim", "dünənimlə bu günüm, həm də sabahim", "seyfi-İlahim" və s. obrazlarla təqdim edən şair sonda fikrini belə tamamlayır: "İki aləmdə bütün sirrə izahim Əlidir".

Hacı Soltanın "Həsən" və "Hüseynim" rədifli qəzəllərində məsum imamların ilahi məhəbbəti, onların başına gələn müsibətlər, din yolunda hər əzaba dözmələri təsvir olunmuşdur.

Hacı Arif "Yeni kitabla yeni əsrə" adlı məqaləsində yazır: "...Axund Hacı Soltan Hüseynqulu oğlu "Məsumnamə"ni sırf Allah kəlamlarından, Peyğəmbər (s) və onun davamçıla-

rı olan imamların elm və hünərinin vəsfindən, dünya ədəbiyyatına və ümumilikdə dünya elminə incilər bəxş etmiş dahilərə bəslədiyi sonsuz məhəbbətdən, dostlarına, yaxınlarına, nəticədə, həyatları ilə bəşərə xidmət etmiş insanlara verdiyi qiymətindən qaynaqlanmış və məzmununa görə mükəmməl, mövzusuna görə orijinal bir əsər meydana gətirmişdir... "Məsumnamə" ümumbəşər mənəvi dəyərləri özündə yaşatmaqda təkcə indiki deyil, gələcək nəsillərə də çətin vəziyyətlərdə Allaha, dinə, mənəviyyata arxalanmaq və bundan istifadə etmək imkanını verir, yaşamağın tənzimləyicisi rolunu öz üzərinə götürür" (sms.səh.266).

İmam Zeynəlabidinə (ə) həsr olunmuş "Sürudi-Sacidin" şeiri sərbəst formada yazılmışdır. Şair burada onu nurlu zəka, əhdə vəfalı, bəla qəmxarı, hər dərdə dəva, xəstələrə şəfa, fəsahət və bəlağət sahibi kimi vəsf etmişdir.

Hacı Soltan İmam Mühəmməd Baqiri (ə) elmdə ustadi-əzəm, cahanda hikmət əhli kimi məşhur olan bənzərsiz şəxsiyyət kimi, İmam Cəfəri-Sadiqi (ə) Peyğəmbər (s) yoluyla gedən, elmləri insanlara təlim edən, Həq məzhəbini aşkara çıxaran, varisi-Peyğəmbəri-din, Heydəri-Kərrarə şərəf, "Ta-ha"ya layiqli xələf və s. kimi, İmam Museyi-Kazımi (ə) helmdə sabit, şəhidi-cahanın qiyamı, kitabi-hikmətin əlhəq nizamı və s. kimi, İmam Rzanı (ə) qəzaya razı, Müstəfa yadigarı, cövhəri-Axirzəman, zivəri-Xeyrən-nisa və s. kimi, İmam Mühəmməd Təqini (ə) hər iki aləmə izzət, nuri-ənvari-həqiqət, varisi-mülki-imamət, səbəbi-rahi-səadət və s. kimi, İmam Əliyyən-Nəqini (ə) möcüzəsi cahanı heyrətə salan, Şərqdən qərbə sədası yetən, elminin hikməti günəşə

zövqü səfa verən, cami-şəhadət içib vəslə yetən və s. kimi, İmam Həsən Əsgərini (ə) qareyi-Quran, sahibi-təfsir, elm içrə hər suala cavab verən və s. kimi, İmam Mehdini (əc.f) xilqətin son ümidi, zamanın sahibi, Hüccəti-Qaim və s. kimi vəsf etmişdir.

Əlisa Zeynallı Hacı Soltana həsr olunmuş məclisdən təəssüratını qələmə alarkən bu kitab haqqında da fikrini qeyd etmişdir: "Məsumnamə" əsəri həmişə barlı və bərəkətli olan, bir kök və gövdə üzərində boy atmış on dörd budaqdan ibarət barı tükənib-bitməyən, həmişəyaşıl, uca bir ağacın rəmzidir. Məhəbbət aşiqləri onun barından bəhrələnir və fayda tapır, istəməyənlər də məcburiyyətsiz, şərtsiz, könül xoşluğu ilə ondan bəhrələnir və "plovu yağsız yeməyi" üstün tuturlar. Allah dərgahında isə hər kəs öz əməli payını alır, mübahisə üçün heç bir əsasi yer qalmır. Əsər təfriqəçilərə elmi prinsiplər üzrə cavab vermək üçün çox dəyərlidir" (sms. səh.285-286).

Kitaba verilmiş "Quran", "Namaz", "Ramazan", "Məqamiüsuliddin", "Məkkə", "Məscid", "Mədəd", İmam Hüseynə (ə) həsr olunmuş növhə, "Eşqi-Hüseyn", "Var..." adlı qəzəllər, "Zeynəbin", "Əbəlfəzl", Həzrəti-Əli Əsqər" kimi qəzəllər də məzmunu və bədii siqləti cəhətdən maraq doğurur.

Kitaba Qeysi-Müsəhhər, A.A.Qüdsiyə, Raciyə, Qumriyə, Məhəmməd Asiyə, xeyriyyəçi Nadir İmamnəzər oğluna, əməkdar müəllim Heydər Eyvazova, Axund Məşhədi Məzahirə, şəhidlərə, Dərviş Əlisöhbətə, Mehdi Hüseynzadəyə, Balağa Məşədi Məcid oğluna, boksçu Məhəmməd Əliyə, Mazandaran Pələnginə, Zəki İslama, Hacı İntiqama, Novruz

bayramına, insan borcuna, vətən eşqinə, məktəbə və s. həsr edilmiş şeirlər də daxil edilmişdir. (Kitabın adına baxsaq, əslində bir çox şeirlərin burda yer alması müəllif tərəfindən yanlış addımdır. Heç olmasa, əlyazmanı oxuyan şəxslər müəllifin bəzi şeirləri kitaba daxil etməsinə etiraz edə bilərdilər və mənə elə gəlir ki, Hacı Soltan da onlarla razılaşardı...)

Sonda Şahin Fazilin Axund Hacı Soltanın "Məsumnamə" kitabının təqdimatı münasibətilə qələmə aldığı qəzəlini veririk:

Dikmiş gözünü göylərə canan, Hacı Soltan,
Hazırdı yolunda gedə qurban, Hacı Soltan.

Seyr eyləyirəm Soltan olan məclisi hərdən,
Burda, deyirəm, nurludu hər yan, Hacı Soltan.

Bir yanda şəriət meyi, bir yanda təriqət,
Bir yanda təsəvvüf ilə ürfan, Hacı Soltan.

Bir yanda həqiqət dayanıb mərifətiylə,
Bir yanda məhəbbətli bir insan – Hacı Soltan.

Öz bağçası var, bağçasının bənzəri yoxdur,
Söz bağçası var, bağçaya bağban Hacı Soltan.

Elmiylə edir fəhminə alimləri müştaq,
Şeiriylə edir bizləri heyran Hacı Soltan.

Ey çarə üçün dərdinə loğman diləyən kəs,
Pünhan eləmə dərdini, loğman – Hacı Soltan.

Şah İsmayılın şəninə çox söz yazılıbdır,
"Qoy çox yazıla" eylədi fərman Hacı Soltan.

Yaz Taclı Xatundan dəxi, hal əhlisən, ey dost,
Aç indi ərəbzəngiyə meydan, Hacı Soltan.

**Məsumları** nəzm eyləmisən, cəhdinə əhsən!
Olsun köməyin daima Quran, Hacı Soltan!

Amma ki, yazaq hər sözü xəlqin dili ilə,
Var səndə də, var məndə də imkan, Hacı Soltan.

Şahindi bu, Şahindi bu, bir Məşhədi Şahin,
Soltandı bu, Soltandı bu, Soltan – Hacı Soltan!

15 avqust, 1999

# 8.ŞƏHADƏT YOLU

Axund Hacı Soltan Hüseynqulu oğlunun "Şəhadət yolu" adlı kitabı 2000-ci ildə "Ozan" nəşriyyatında çap olunmuşdur. XX əsrdə Azərbaycanın azadlığı, bütövlüyü və tərəqqisi uğrunda canını fəda edən Azərbaycan şəhidlərinin ruhuna ithaf edilmiş bu kitabda növhələr toplanmışdır.

Hacı Soltanın "Şəhadət yolu" kitabı "Allaha xitab"la başlayır:

Sən eylə dəva, Rəbbül-aləmin!
Ey kani-vəfa, gənci-şəfa, Rəbbül-aləmin!

Eylə hidayət aləmi-eşq içrə bizləri,
Dildən uzaq elə bu həzin qəmli sözləri.
Güldür bu ağlayıb kor olan nəmli gözləri,
Sən ver bu əhli-kinə cəfa, Rəbbül-aləmin!

Şair açılmayan sirləri öyrənmək istəyir, Həzrəti-Hüseyn (ə) kimi şəhadətə yetməyi arzulayır. Yer üzündəki haqsızlıqların aradan qaldırılması yollarını axtarır, suallar verir və sonda çarəni Allahdan istəyir. Zamanın sahibini göndərməsini, onun vasitəsilə zülmün kökünün kəsilməsini yeganə yol hesab edir.

Hacı Soltanın bu kitabında İslami dəyərləri, tarixi dini şəxsiyyətlərin səciyyəsini özündə əks etdirən şeirləri üstünlük təşkil edir. Akademik Ziyad Səmədzadə "Möminlik insanlığın tacıdır" adlı məqaləsində Hacı Soltanın mənəvi dəyərlərə verdiyi qiyməti, min bir əziyyətlə yazıb, toplayıb ərsəyə

gətirdiyi kitabları və bu kitablarda qədim ənənələri yaşatdığını xüsusi vurğulayaraq yazır: "...Buzovna məscidinin axundu Hacı Soltan sözü sözdən seçən, hər kəlmənin uca məqamını dəyərləndirən ustaddır. Xatırladım ki, mən Hacı Soltanı uşaq yaşlarından yaxşı tanıyır və kəndimizdə belə bir imanlı gəncin yetişməsilə həmişə qürur duymuşam. El məclislərində dəfələrlə onun sözünün məntiqinin, söhbətinin şirinliyinin şahidi olmuşam (sms. səh.44).

Kitabda Allaha müraciətdən sonra "Peyğəmbər (s) növhəsi" gəlir. Növhə belə başlayır:

Ağla gözüm, Həzrəti-Peyğəmbərə,
Zəhri-cəfa verdilər ol Sərvərə.

Rəngi solub zəhri-cəfadən aman,
Fatimə bu halə olub bağrı qan.
Yatma deyir aç gözüvi, bir oyan,
Yoxsa çəkərlər qarani minbərə.

Sonra "Ərzü səma ağlayır, gəldi Məhərrəm, Əli, Cümlə mələklər tutub ərşdə matəm, Əli" beyti ilə başlayan "Növheyi-İmam Əli (ə)", "Ey ruhi-rəvan Həzrəti-Zəhra, Ey cövhəri-can Həzrəti-Zəhra!" beyti ilə başlayan "Fatimeyi-Zəhra (s.ə) növhəsi", "Nola məni zar qoyub getməyin, Dərdə giriftar qoyub getməyin" beyti ilə başlayan "Fatimeyi-Suğranın dilindən", "İstər ki, könül daim ola yari Hüseynin, Hər şiə gərək olsun əzadari Hüseynin" beytilə başlayan "İmam Hüseyn (ə) növhəsi", "Ey ləbi ətşan, qanınə qəltan, Can sənə qurban, canım, Hüseyn can" beytilə başlayan növhə, "Yolları kəsilmişdi meydanda Əbəlfəzlin, Səs saldı o dəm cəngi hər yanda Əbəlfəzlin" beytilə başlayan "Həzrəti-Əbbas növhəsi", "Məzlu-

mi-Hüseyn gəldi, ol dəmdə başı üstə, Ləli-ləbini qoydu ol qövsi-qaşı üstə” beytilə başlayan “Əli Əkbər növhəsi”, “Hamı deyər sibti-pəyəmbər mənə, Kimdi gözəllikdə bərabər mənə?” beytilə başlayan “Cənabi Əli Əkbərin dilindən”, Əkbər bu gecə qanınə qəltan gərək olsun, Leylanın işi naleyi-əfqan gərək olsun” beytilə başlayan Əli Əkbər növhəsi, “Meydanda durub şir tək şəhzadə cəvan Qasim, Qeyz ilə vurub xəncər ol şiri-jəyan Qasim” beytilə başlayan “Həzrəti-Qasim növhəsi”, Cənabi-Leylanın dilindən “Nola, gəl getmə bu meydanə, Əli, Cismi-pakin batacaq qanə, Əli” beytilə başlayan növhə, Cənabi-Rübabın dilindən “Ey gül üzlü ətşan balam, Lay-lay, Əli, ey vay Əli” beytilə başlayan növhə, Cənabi-Zeynəbin dilindən “Zeynəbi-nalan deyər: saxla qədəm, qardaşım, Ruhə qida, cismə can, kani-kərəm qardaşım” beytilə başlayan növhə, Cənabi-Səkinənin dilindən “Dəhrdə bikəslərə yavər baba, Sərvərü sərdari-hünərvər baba” beytilə başlayan növhə, “Zeynəb qalıb viranədə, Söylər məni nalani gör” beytilə başlayan “Fəryadi-Zeynəb” növhəsi, “Hüseynin qızı Səkinəyəm mən, Vurmayın məni, mərizəyəm mən” beytilə başlayan “Əhvali-Səkinə” növhəsi, “Torpağı al qanə dönüb Kərbəla, Gör nə gülüstanə dönüb Kərbəla” beytilə başlayan “Kərbəla növhəsi”, İmam Zeynəlabidinin (ə) dilindən “Ya rəbb, dəxiləm mən, Bimarü zəliləm mən” beytilə başlayan növhə, “Qətari-qəm düzüldi meydanə Kərbəladə, Zeynəb gəlibdi ol dəm əfqanə Kərbəladə” beytilə başlayan “Ərbəin növhəsi”, “Zəhri-cəfadən olub sinəsi suzan Riza, Va Həsəni-Müctəba, va cigəri qan Riza” beytilə başlayan “İmam Riza (ə) növhəsi”, “Aç gözün, qafil, oyan, matəmi-dünya görünür, Dut Əli damənini, məhşəri-kübra görünür” beytilə başlayan “Nəsihət növhəsi”, “Dəhrdə uyma işrətə, tərk eləmə ibadəti, Unutma bu həqi-

qəti, hövli-dəmi-qiyaməti” beytilə başlayan “İbrət növhəsi”,”Ğafil, şühəda qanınə mənа nə bilirsən, Gülzari-Hüseyn, qönçeyi-rəna nə bilirsən?!” beytilə başlayan “Qafilləri məzəmmət” növhəsi, “Zaliman, bilmədiniz qiymətin İslamımızın, Necə gör məhv elədiz ziynətin İslamımızın” beytilə başlayan növhə verilmişdir. Hacı Mustafa Mailoğlu “Layiqli davamçı” adlı məqaləsində yazır: “Hacı Soltanın bizim bir çox müasir ruhani alimlərimizdən fərqi bundadır ki, onun həm gözəl təbi var, həm şəriət alimidir, həm də ədəbiyyatşünasdır. Ən əsası isə bildiklərini qələmə alan tədqiqatçı alimdir. O, İslam aləmində böyük izlər qoymuş üləma, şüəra və ürəfalarımızın yolunu davam etdirmək əzmindədir”(sms. səh. 75).

Kitabda Əhli-beyt (ə.m.) ilə bağlı növhələrdən başqa XX əsr Azərbaycan şəhidləriə həsr olunmuş növhələr də yer almışdır: “Hər zaman rahi-Vətən rahi-şəhadətdi mənə, Ölə bilsəm onun uğrunda, səadətdi mənə” beytilə başlayan “Vətən şərqisi”, “Qanınə qəltan oldu dərdə yananlar, Xuda, Getdi otuz yeddidə türfə cavanlar, Xuda” beytilə başlayan “1937-ci il qurbanları haqda növhə”, “Yandı könül kül oldu iyirmi yanvar günü, Hər yan qızılgül oldu iyirmi yanvar günü” beytilə başlayan “20 yanvar növhəsi”. Nəhayət, sonda“Sidq ilə səslər səni pirü cavan, Hardasan, ey Mehdiyi-sahib-zəman” beytilə başlayan “İmam Mehdi Sahib-əz-zəman (əc.f) növhəsi” verilmişdir.

Kitab müəllifin oxuculara müraciəti ilə bitir: “Bismillahir-rəhmanir-rəhim! Hörmətli oxucu! Növhə, ədəbiyyatımızın və qədim İslam mədəniyyətimizin ayrılmaz hissəsi olduğundan, heç bir müsəlman bu şeir növünə və növhələrin istifadə edildiyi dini mərasimə biganə qala bilməz. Bu gün tarixi mövzuda yazılan hər bir əsər əslində tarixi keçmişimizin arayıb-

araşdırılmağa edilən cəhd və dahi tarixi şəxsiyyətlərimizə olan məhəbbətin təzahürüdür. Mənim bu mövzuda qələmə aldığım şeirləri qəlbimin harayı və məhəbbətimin, sevgimin nümunəsi kimi qəbul etməyinizi istərəm.

Ey can, bu yamyaşıl bəzənən növbaharı sev,
Bağ içrə əndəlib kimi nəğməkarı sev.

Azad olub çəmən ayazından zimistan,
Əlvan açan çiçəkləri gör, laləzarı sev.

Çıx seyri-bağə, könlünü ver nazlı güllərə,
Yaz fəslidir, əlində olan ixtiyarı sev.

Quran dedi, Əli dedi, həm itrətim dedi,
Yar ol Rəsuli-Əkrəmə, bu intizarı sev.
Qumri edirsə cəh-cəhi, guş eylə zövq ilə,
Fəryadə gəl, Hüseyn kimi namdarı sev.

Gəzsən, elə yer tap ola Kərbəla kimi,
Leylayə qaytar Əkbəri, o biqərarı sev.

Əbbasi əldə məşq tutan gör, fəğan elə,
Qasim üzündə qanə dönən zülfi-tarı sev.

Əldən gedibdi yeddi əxi, iki mərd oğul,
Düş xakə, payi-Zeynəbə dəymiş qübari sev.

Soltan, Xudaya şükr elə bu şövqü zövq üçün,
Sevsən, İlahi eşq ilə Pərvərdigarı sev.

# 9.HİDAYƏT YOLU

Hacı Soltanın növbəti kitabı “Hidayət yolu” 2000-ci ildə “Ozan” nəşriyyatında dərc edilmişdir. Müəllif kitabı 1918-ci ildə erməni-müsəlman münaqişəsində misilsiz qəhrəmanlıq göstərmiş Hacı İsgəndər Abuzər oğlunun və buzovnalı din xadimi Ayətullah Mühəmməd Rza Şeyx Qulamhüseyn oğlu Mühaminin əziz xatirəsinə ithaf etmişdir.

Kitabın redaktoru Arif Buzovnalıdır. Akademik Vasim Məmmədəliyev kitaba yazdığı “Yorulmaz tədqiqatçı” adlı ön sözdə müəllifi belə təqdim edir: “Bir tədqiqatçı kimi Hacı Soltanın mövzu dairəsi çox genişdir: dini dəyərlərimizin, İslam əxlaqının, İslam ehkamının təbliği, Peyğəmbərimizin (s), əhli-beyt imamlarının (ə) kəlamlarının izahı, onların müqəddəs dinimiz qarşısındakı xidmətlərini oxuculara çatdırmaq, Azərbaycan ədəbiyyatının, Azərbaycan dövlətçiliyinin ən görkəmli simalarından biri olan Şah İsmayıl Xətainin həyat və yaradıcılığını, dini görüşlərini tədqiq etmək, xətaişünaslığın ən qiymətli nailiyyətlərini toplayıb küll şəklində ədəbi ictimaiyyətimizə təqdim etmək, İslam və idman, müsəlman idmançıları, Azərbaycan dərviş və rövzəxanları, ayrı-ayrı ruhanilərimiz və din xadimlərimizin həyat və fəaliyyəti haqqındakı məlumatları toplayıb geniş oxucu kütləsinin ixtiyarına vermək, moizə xarakterli şirin söhbətlər və s. və i.a.

Hacı Soltan narahat tədqiqatçıdır. O daim arayıb-axtarır, oxuculara nə isə yeni bit söz demək istəyir və çox zaman buna nail olur da. Bu isə, təbii ki, gərgin axtarışlar, yuxusuz gecələr, günlərlə oturub işləmək, sözün qısası, ağır zəhmətə qatlanmaq bahasına başa gəlir. Fikrimizcə, Hacı Soltanın

həyatda daim narahat, bir qədər qayğılı görünməsinin əsas səbəbi elə budur" (səh. 5).

Hacı Soltanın bu kitabı çox təbii olaraq "Əsmaül-hüsna"nın – Allah-təalanın 99 gözəl adının lüğəti ilə açılır. Sonra "Peyğəmbər (s) əxlaqı" adlı yazı gəlir. Müəllif burada əqidədən, əxlaqdan, ehkamdan, nəfsin növlərindən bəhs edir. Yazıda verilən Peyğəmbərlə (s) bağlı hədislər və Peyğəmbərin (s) bir ərəbin suallarına cavabı maraq doğurur. "Elmin ziyası"nda Peyğəmbərimizin (s) elm haqqında dediklərini qeyd edən, Həzrəti-Əlinin (ə) insanlar haqqında buyurduqlarından, elm haqqındakı kəlamlarından danışan müəllif yenə də mötəbər mənbələrdən götürdüyü hədislərə istinad edir.

"Hidayət yolu" adlı yazı Quran ayəsi ilə açılır. Müəllif burada insanın doğru yola hidayəti üçün on istiqamətin olduğunu bildirir və onların izahını verir. "Həzrəti-Əlinin (ə) son vəsiyyətləri"ndə Əlinin (ə) oğlu İmam Həsənə (ə) 20 vəsiyyətini, "İmanın nişanələri"ndə 3 nişanə, "Cihad"da cihadın 4 növü oxuculara açıqlanır. Hacı Casim Əlisöhbət oğlu "Onu elmə Allah hidayət etmişdir" adlı məqaləsində yazır: "Allah-təala Hacı Soltana paklıq, iman, elm, təqva, sədaqət, eşq və yaradıcılıq kimi gözəl, ölçüyəgəlməz xəzinələr hədiyyə etmişdir. Axund Hacı Soltan ali məktəblərdə, universitetdə elm almamışdır. Onu elmə məhz Allah-təala hidayət etmiş və ona bu yolda kömək olmuşdur. (sms.səh. 130)

"Şəhidlik"də Kərbəla faciəsi ilə bağlı məsələlərdən bəhs edən müəllif növbəti yazıda İmam Hüseynin (ə) hikmətli kəlamlarını təqdim edir. "Mükafat və cəza", "Yaxşılığın əvəzi ancaq yaxşılıqdır" adlı yazılarda müəllif yenə də hədislərə, Quran ayələrinə söykənərək fikirlərini bizə daha dəqiq çatdırmağa çalışır.

"Ad haqqında nə bilirik", Quranda Əli (ə) v başqa imamların adının qeyd olunmamasının səbəbi", "Məsum imamların ad haqqında söylədiyi kəlamlar" adlı yazılarda Hacı Soltan Peyğəmbər (s) və imamlardan (ə.m.) hədislər verir və maraqlı fikirlərini oxucularla bölüşür. Burada Həzrəti-Əlinin (ə) qırx nəsihəti də diqqətə çatdırılır.

Kitabda gedən "Ruhuna duaçıyam", "İslamda dərvişlik", "Əlisöhbət İmamverdi oğlu" kimi yazılarda dərvişlərin həyatından fəaliyyətindən maraqlı epizodlar diqqəti çəkir. "Ləhni-Davud", "Siyahi-ləşkər muğamı" adlı yazılarda muğamlara islami nöqteyi-nəzərdən yanaşan müəllif bir sıra tarixi faktları açıqlayır. "İdman sağlamlıqdır", "Ömrümüzü itirməyək", "Xeybər müharibəsi","Hərbdə hiylə caiz olsa da", "Şah İsmayıl dövründə idmanla ədəbiyyatın vəhdəti", "Hürr kimdir", "İslamda birlik", "Yaşamaq və yaşatmaq nə deməkdir", Mir Cəfər Seyid Əzim oğlu", "Dilimizdəki bəzi deyimlərin şərhi" kimi müxtəlif mövzulara həsr olunmuş məqalələrdə də müxtəlif tarixi şəxsiyyətlərin həyatına ekskursiya olunur ki, müəllif bunları da İslamla əlaqəli şəkildə işləmişdir. Burada "Həzrəti-Mehdi Sahib-əz-zəmanın (əc.f) kəlamlarından" 34-ü verilmişdir. Xalq şairi Zəlimxan Yaqub "Haqqın işığında döyünən ürək" adlı məqaləsində yazmışdır: "Nizamidən başlamış günümüzədək nə qədər xalq sevgisi, məhəbbəti qazanmış şəxsiyyətlər, əhli-ürfanlar varsa, onların heç biri Hacı Soltanın diqqətindən yayınmayıb. Bu qiymətli cəhət də onu elin-obanın, az qala alimlər ordusunun sevimlisinə çevirib.

Hansı mövzuya əl atıbsa Hacı Soltan, orada bir dünya yaradıb, açılmamış səhifələr açıb, görülməmiş qatları görüb, çox qaranlıq sirlərə aydınlıq gətirib, endikcə enib, uzaldıqca

ucalıb, mədəniyyət tariximizə bir-birindən qiymətli əsərlər verib" (sms. səh.41).

"Mərsiyələr və şeirlər" bölümündə Hacı Soltanın növhələri, təxmisləri, qəzəlləri və s. şeirləri yer alır. "Hacı Soltana ithaflar"a Şahin Fazilin, Arif Buzovnalının, Hüseyn Kürdoğlunun, Hacı Yaşar Cahidin, Hacı Zəki İslamın şeirləri daxil edilmişdir. "Rəylər"də Əlisa Zeynallının, akademik Vasim Məmmədəliyevin, akademik Ziyad Səmədzadənin, kinorejissor Şeyx Hacı Əbdül Mahmudbəylinin, xalq artisti Hacı Əliabbas Qədirovun, professor Gərşivəz Əhmədoğlunun, xalq artisti Kərbəlayi Ramiz Əzizbəylinin, tarix elmləri doktoru Təvəkkül Səlimovun, polkovnik Şəmistan Nəzirlinin, əməkdar artist əli Nurun, Axund Hacı Əhmədin, Dərviş Məşədi Aqilin və Arif Buzovnalının tədqiqatçı, şair Hacı Soltan və onun yaradıcılığı haqqında layiqli fikirlərin yer aldığı yazıları verilmişdir.

Yazımızı Gülarə Munisin Hacı Soltana həsr etdiyi və "Hidayət yolu" kitabına da işarə etdiyi bir qəzəli ilə yekunlaşdırırıq:

İlahi, kəndimizin iftixarı Soltandır,
Ziyalı ordusunun bəxtiyarı Soltandır.

Qələm yazıb düzübdü, şah əsərdi "Divan"ı,
Demək söz aləminin tacidarı Soltandır.

Zühuru gözlədi hər dəm, olub ibadətdə,
O qeyb şahımızın intizarı Soltandır.

"**Hidayətin yolu**"nu bəxş edib o, dünyayə,
Şükür, zəmanəmizin Şəhriyarı Soltandır.

Bax, əsri etdi yarı, çatdı öylə bir sinnə,
Munisa, təbrik eylə, yubilyarı, Soltandır.

# 10.XƏTAİ VƏ FÜZULİ

Hacı Soltanın növbəti kitabı "Xətai və Füzuli" adlanır. Xətai-Füzuli mövzusunda qələmə alınmış məqalələrin toplandığı bu məcmuə 2000-ci ildə "Ozan" nəşriyyatında çap olunmuşdur. Tərtibçi kitabı buzovnalı xeyriyyəçi Kərbəlayi Cəmil Kəlbəli oğlunun və onun həyat yoldaşı Məşədi Xeyransa xanımın əziz xatirəsinə ithaf etmişdir. Kitabın redaktoru və ön söz müəllifi filologiya üzrə elmlər doktoru, xalq yazıçısı Əzizə Cəfərzadədir.

Hacı Soltan kitabla bağlı məramını "Tərtibçidən" adlı yazısında belə açıqlamışdır: "Bismillahir-rəhmanir-rəhim və bihi nəstəin. 1997-ci ildə "Şah İsmayıl Xətai", 1998-ci ildə isə "Xətaişünaslığa hədiyyə" kitabları işıq üzü gördükdən sonra hər iki kitabda müəyyən qədər açıqlanmış "Xətai və Füzuli" mövzusu məni rahat buraxmadı. Bu mövzu indiyədək işlənmədiyindən Xətai və Füzuli haqqında olan məlumatları toplayıb bir kitab halına salmaq və oxuculara təqdim etmək fikrinə düşdüm. İlk dəfə məndə bu maraq mərhum alim Mirzə Abbaslının 1958-ci ildə Azərbaycan jurnalında çapdan çıxmış "Xətai və Füzuli" məqaləsini oxuyandan sonra yarandı. Mən həmin məqaləni "Şah İsmayıl Xətai" kitabımda (1997) çap etdirdim. Sonra bu barədə olan digər məlumatları bir yerə cəm edib qarşınızda olan "Xətai və Füzuli" adlı bu kitabı tərtib etdim. Ümidvaram ki, imkanım daxilində Xətai və Füzuli kimi dahilərimizin qarşısında öz borcumun bir hissəsini yerinə yetirə bilmişəm" (səh. 3).

Professor Əzizə Cəfərzadə kitabda gedən "Axund Hacı

Soltanın “Xətai və Füzuli” kitabı” adlı kiçik rəyində yazır: “Mən Hacı Soltanın bir sıra kitabları, xüsusilə “Xətaişünaslığa hədiyyə”, “İslamda idman və boks şahı Məhəmməd Əli”, “Şah İsmayıl Xətai” və başqa bu qəbildən olan ədəbiyyatşünaslıqla bağlı kitabları ilə tanış olmuş və onları ədəbiyyatşünaslığımızda, xüsusilə həmin mövzular üzərində çalışan tədqiqatçılar üçün çox yararlı kitablar, mənbələr olduğunu qeyd etmişəm. Qarşımızdakı bu kitab da Hacı Soltan cənablarının tərtib etdiyi maraqlı bir tərtibatdır. Burada Xətai və Füzuli əlaqələri ilə bağlı suallara cavab verilir” (səh. 4).

Kitabın I fəsli Xalq yazıçısı, professor Əzizə Cəfərzadənin “Bakı-1501” romanından götürülmüş bir parça ilə başlayır. Təbii ki, bədii əsər müəllifin ilhamının məhsuludur. Xətainin Məhəmməd Füzuli haqqında belə bir fikrinin olub-olmaması dəqiq deyildir. Hər halda Hacı Soltan kitabı həmin sətirlərlə başlamağı məsləhət bilmişdir: “...Cəsarət budur ki, Məhəmməd Füzuli kimi nəinki vətənində, hətta dindarlar arasında, Ərəbistanda yaşayıb, öz dilində şeir, məsnəvi yazasan...

...Şair öz həmvətənlərinin eşidən qulağı, görən gözü, düşünən beyni, danışan dilidir...

...Məhəmməd Füzulinin mənim yanımda mərtəbəsi böyükdür. Bu düzdür ki, müqəddəs Kərbəlanı, İmam Hüseynin (ə) qulluğunu tərk edib buralara gəlməz...

...Təəssüf ki, biz İraqı fəth edib Kərbəlaya varid olanda Məhəmməd Füzulini belə tanımırdıq. Yoxsa, xadimlər içindən seçib ehtiyaclarından hali olardıq...

...Yenə də təəssüf ki, belə bir şair səltənətimizin, paytəxtimizin, sarayımızın bəzəyi deyil...” (səh.5).

I fəsildə Xətai ilə bağlı əvvəlki kitablarda bütöv verilmiş

məqalələrdən kiçik parçalar, bəzisindən hətta bir neçə cümlə verilmiş, tərtibçi onları təkrar bu kitaba daxil etməmişdir. (Zənnimizcə, həmin məqalələrin burada təkrar getməsi yaxşı olardı. Çünki, Hacı Soltanın kitablarına ehtiyac çoxdur, hamıya da bütün kitablarından verə bilmir...). Məhəmməd Füzulinin "Bəngü badə", Məhəmməd Əmin Rəsulzadənin "Azərbaycan mədəniyyət əlaqələri", Salman Mümtazın "Şah Xətai", Əkrəm Cəfərin "Füzuli şeirinin vəzni", Məhəmməd Fuad Köprülüzadənin "Şah İsmayıl Xətai Səfəvi", Bəkir Çobanzadənin "Xətainin dili və yaradıcılıq yolu", Mirzağa Quluzadənin "Füzuli lirikası", Əlisa Nicatın "Şah İsmayıl", Əzizağa Məmmədovun "Şah İsmayıl Xətai", Mirzə Abbaslının "Ov səhnələri", Anarın "Şairin zəfəri", Fuad Qasımzadənin "Siyasət, sənət və elm müsəxxiri" və "Qəm karvanı, yaxud zülmətdə nur", Tofiq Hacıyevin "Qış getdi, yenə bahar gəldi...", Nazim Rizvanın "Şəhriyar və Füzuli", Sabir Əliyevin "Azərbaycan alleqoriyasının zirvəsi" və "Xətai şeirinin vəzni", Mahmud İsmayılın "Azərbaycan tarixi", Azadə Rüstəmovanın "Xalq yaradıcılığı Xətai şeirinin estetik qaynaqlarından biri kimi", Axund Hacı Soltanın "Xətai bir alim kimi", Vera Devittin "Şah İsmayıl Xətai Azərbaycan ədəbiyyatı muzeyinin sərgisində", Lalə Əlizadənin "Xətai və Füzuli yaradıcılığındakı bəzi alleqorik obrazlara dair", Vəcihə Feyzullazadənin "Xətai ədəbi irsinin tədqiqi tarixindən", Təvəkkül Şağani Səlimovun "Ağır və şərəfli zəhmətin bəhrəsi", Dildarın "Qılınc və qələm şairinin obrazı", Kənan Hacıyevin "Xətaişünaslığa hədiyyə" və "Füzuli", adlı məqalələrindən parçalar, Mirzə Rəhimovun "Əmr şəkli", Əzəl Dəmirçizadənin "Ədəbi dilimizin inkişafında Füzuli mərhələsi" adlı məqalələri, yazıçılardan Fərman Kə-

rimzadənin "Çaldıran döyüşü", Əzizə Cəfərzadənin "Bakı-1501" romanından bir parça verilmişdir. Bu fəsil Nazim Rizvanın "Xətai" poemasının "Şairlər məclisi" hissəsi ilə bitir. Bəkir Çobanzadənin məqaləsindən verilən kiçik parçanın birinci abzası bircə cümlədən ibarətdir, amma bu cümlə bir məqaləyə dəyər: "XVI əsrdəki Azərbaycan türk ədəbiyyatının bədii yüksəkliyi – vertikallığı Füzuli ilə ölçülərsə, dil və yaradıcılıq ünsürləri vasitəsi ilə, içərisində aldığı bədii-lisani komponentlərin genişliyi – horizontal meyarı Xətai ilə təmsil olunur" (səh. 8).

Kitabın II fəslində Axund Hacı Soltan Hüseynqulu oğlunun "Övliya Xətai Füzulinin qəlbində imiş", Mirzə Abbaslının "Xətai və Füzuli", Rafael Hüseynovun "Şahın şairliyi və şairin şahlığı" məqaləsi və "Xətai bütövlüyü" məqaləsindən bir parça, Arif Əşrəf Buzovnalının "Xətai və Füzuli... (düşüncələr)", Firudin Qurbansoyun "Şah İsmayıl Xətai Məhəmməd Füzulinin sənət güzgüsündə", Məşədi Həsən Hüseyn oğlunun "Şah İsmayıl Xətai və Məhəmməd Füzuli", "Xətaiyə qiyməti dünya verib" adlı məqalələri yer alır. Fəslin sonunda Hacı Soltanın "Xətaidir", "Füzuli", Şah Xətaidən və Məhəmməd Füzulidən təxmisləri və müxəmməsi verilmişdir. Hacı Soltan "Xətaidir" rədifli qəzəlində Xətaini mədh eləyərkən, təkcə Füzulini deyil, həm də Nəsimi yad etmişdir:

Bu cahan mülkünü seyran eləyən Xətaidir,
Böyük Füzulini heyran eləyən Xətaidir.
Ömrünü dini-Müstəfa yoluna həsr edib,
Əliyə canını qurban eləyən Xətaidir.
"Ənəlhəq" elminə batində sahib olmaqla,
Nəsimi ruhunu əyan eləyən Xətaidir.

Kitaba Arif Buzovnalının Şah Xətaidən və Məhəmməd Füzulidən təxmisləri də daxil edilmişdir.

Yazını Hüseyn Kürdoğlunun Hacı Soltana ithaf etdiyi bir qəzəl ilə bitiririk:

Gün kimi şölə saçır hikməti Quranımızın,
Çəkilib gözdən itir zülməti Quranımızın.

Biz fəzilət orağıyla nə gözəl söz biçirik,
Dür tökür, inci saçır sünbülü xırmanımızın.

Daş tökənlər çox idi qəsd ilə ürfan yoluna,
Şükr olsun ki, açılmış yolu ürfanımızın.

Biz ki, Haqqın kərəmiylə çatırıq əhdimizə,
Xaliqə ülvi məhəbbət canıdır canımızın.

Əbədi məşəlimiz Əhmədi-Muxtar kəlamı,
Nəfəsi dəydiyi söz atəşidir qanımızın.

Yenə nadanlığa odlar şaxıyır Zülfüqarı,
Bayrağı göylərə qalxır Şəhi-mərdanımızın.

Özünü görmək üçün siz də Buzovnaya gəlin,
Dərs alın hər kitabından Hacı Soltanımızın.

Qoca Kürdoğlu onun şəninə min nəğmə yazar,
Çağlayar gur bulağı bir yeni dastanımızın.

11.07.1999.

# 11.DİVAN

“Ozan” nəşriyyatı 2000-ci ildə Hacı Soltanın “Divan”ını çapdan buraxmışdır. Kitabın redaktoru şair Arif Buzovnalıdır. Hacı Soltan divanına iki səhifəlik bir dibaçə yazmışdır. Dibaçədə tərcümeyi-halını verən müəllif çap olunmuş kitablarının siyahısını verməklə yanaşı çapa hazır olan kitablarının adını da açıqlamışdır. Şair divanını “Klassik ədəbiyyatımıza hörmət və xalqımıza xidmət əlaməti kimi ərməğan etdiyini” qeyd edərək yazır:

Çalışdım xəlq üçün beqədri-qüvvə,
İstədim əməlim zinətim olsun.
Hər etdiyim əməl, hər yazdığım söz,
Özümün özümə qiymətim olsun.

Azərbaycana, onun tarixi keçmişinə, bu gününə və sabahına aid olan hər bir əsərimi İslami və dünyəvi qanunlar, klassik adət-ənənələr çərçivəsində verə bilməyimin səfasını çəkdiyim vaxt sizlərin də nöqsanlarımı bağışlamaq zəhmətini çəkdiyinizdən çox məmnunam.

Bu əsərimi Azərbaycanıma məhəbbət və varlığımdan əlamət kimi qəbul edib, lütfən məni duadan məhrum etməyin” (səh. 4).

Divana 60 qəzəl, iki qitə, 3 qəsidə, bir müstəzad, iki mürəbbə, bir müxəmməs, Xətaidən və Füzulidən təxmis, bir müəşşər, bir tərcibənd, 14 növhə, 6 məsnəvi, 4 sürud, bir qoşma, 42 dübeyt, “Məsumnamə” daxil edilmişdir. Divan “Xətmi-kəlam”la bitir.

Əlyazmalar İnstitutunun böyük elmi işçisi Hacı Mustafa Mailoğlu “Layiqli davamçı” adlı məqaləsində Hacı Soltanı həm bir din xadimi kimi, həm də şair kimi təqdim edir və yazır: “Hacı Soltan divan ədəbiyyatımızda ən çox istifadə olunan qəzəl, qəsidə, təxmis, müxəmməs, dübeyt, qitə, müstəzad, mürəbbə, müəşşər, tərcibənd və s. əruz vəznində yazılan şeir növlərinə müraciət etməklə yanaşı həmçinin, növhə, mərsiyə, mədhiyyə və heca vəznində qələmə aldığı bəzi şeirlərini də “Divan”ına daxil etmişdir. Bu heç də Hacının “Divan”ına xələl gətirməmiş, əksinə, onu daha da rəngarəng və oxunaqlı etmişdir.

Hacının dinimizə, ədəbiyyatımıza, tariximizə, eləcə də böyük şəxsiyyətlərimizin həyat və yaradıcılığına həsr etdiyi qiymətli və təqdirəlayiq əsərləri elmimiz üçün çox böyük xidmətdir. İnanıram ki, bu əsərlər gələcəkdə mütəxəssislərin tədqiqat obyekti olacaq və xalqımız bu zəhmətləri lazımınca qiymətləndirəcəkdir” (sms. səh.76).

Şairin divanı eyni kitabda kiril və latın əlifbasında verilmişdir. Hacı Soltan yaradıcılığından bəhs açan Gülarə Munis “Sözün sehri, sözün sirri” adlı məqaləsində yazır: “Onun qələminin şah əsəri isə 2000-ci ildə nəşr olunmuş “Divan” kitabıdır. Bu kitab sanki müəllifin yaradıcılıq gücgüsüdür”. (sms. səh.320).

Divanda “Mir Möhsün Ziya”, “Buzovna”, “Muxtar ibn Məsud”, “Qorqud”, “Nizami”, “Nəsimi”, “Füzuli”, “Qüdsi”, “Raci”, Xomeyni”, “Mehdi”, “Mazandaran pələngi”, Əbəlfəzl”, “Quran”, “Xızrdən”, “Zeynəbin”, “Qumridən”, “Türkün”, “Rəbbdir”, “Əlidir”, “Əsğər”, “Xətaidir”, “Əlisöhbət” rədifli qəzəllər

maraq doğurur. Burada Hacı Soltanın müasirlərinə ithaf etdiyi qəzəllər də yer alır. Höccətül-islam vəl müslimin Seyyid Ocaq Nejad ağa “Din qardaşım, qədim səmimi dostum” adlı məqaləsində yazır: “O insan ki, xalis niyyətlə daima mənəviyyat yolunda olmuş və dini, mədəni və əxlaqi məsələlərə son dərəcə bağlılığı onun müxtəlif mövzularda çoxsaylı əsərlər yaratmağına səbəb olmuşdur. Bu da öz növbəsində onun aydın üfüqlərə geniş baxışından xəbər verir” (sms.səh. 12).

Hacı Soltanın divanı həcmcə kiçik olsa da, əhatəlidir. Burada irfani, dini mövzulu şeirlərlə yanaşı, vətənpərvərlik, humanizm və c. mövzularda yazılmış əsərlər də vardır ki, bu da şairin müasirliyini, təkcə keçmişlə deyil, həm də bu günlə yaşadığını və ürəyində gələcək arzuları daşıdığını göstərir. “Qarabağdır” rədifli qəsidəsi, müasirlərinə həsr etdiyi şeirlər buna əyani sübutdur. I qrup Qarabağ əlili, ilahiyyatçı, tədqiqatçı, publisist, Hacı Soltanın şeirlərini əzbər bilən və hər yerdə çıxışlarında, yazılarında onları xalqa çatdıran Hacı Həsən Hüseyni “Axund Hacı Soltan Hüseynqulu oğlu, 50 yaşın mübarək” adlı təbrikində yazır: “İldə bir neçə dəfə Buzovna kəndinə gedib “Qədəmgahi-Əli”ni ziyarət etdikdən sonra Hacıya da baş çəkməyi özümə borc bilirəm. Bir neçə saat onunla həmsöhbət olub, yazdığı gözəl şeir nümunələrindən bəhrələnirəm və sözün əsl mənasında mənəvi zövq alıram və ona qibtə edirəm” (sms. səh. 120-121).

Bu yazımızı Gülarə Munisin Hacı Soltanın “Divan”ının çap olunması münasibətilə qələmə aldığı təbriknamə ilə bitiririk:

Yaz qələm, bir namə yaz, şad eylə ürfan əhlini,
Vəsf edib Soltanı sən, yad eylə Quran əhlini.

Yazdı "Məsumnamə"ni, fəth etdi cənnət bağını,
Mədh edib hər kəlmədə şövq ilə iman əhlini.

Xaliqi bəxş eyləyib bir böylə istedad ona,
Nəzm edib "**Divan**"ı o, mat qoydu "Divan" əhlini.

Əxz edib müdrikliyi erkən yaşında, mərhəba,
Səslədi təmkin ilə imanə nöqsan əhlini.
Çox müsafirlər gəlib heyran olur göftarinə,
Ol gözəl əxlaq ilə cəzb etdi İran əhlini.

Həm yaşatmaq, həm yaratmaq söylədi mehmanına,
Görmədim səhv eyləyən aləmdə vicdan əhlini.

Munisa, bir gül dərib cənnət bağından, şükr edər,
Gər, Xuda əfv eyləsə Məhşərdə ürfan əhlini.

06.10.2008.

# 12.DÜBEYTLƏR, RÜBAİLƏR, TİYUĞLAR

Hacı Soltanın "Dübeytlər, rübailər, tiyuğlar" adlı on ikinci kitabı 2001-ci ildə "T-Nəşriyyat-Poliqrafiya Mərkəzi"ndə çap olunmuşdur. Kitab "Bismillahir-rəhmanir-rəhim"lə açılır, əsas hissədə 212 əsər vardır. "Əlavələr" bölümündə "Sev", "Balağa", "Bəsirətin", "Şahin", "Azər", "Tamilla xanım", "Zəlzələdən" rədifli qəzəllər, "Həzrəti-Fatimə", "Məhəmməd Asi" adlı sürudlar və "Yad eyləyirəm" adlı şeir vardır. Hacı Soltan yaradıcılığının bir özəl xüsusiyyətlərindən biri də budur ki, gördüyü, sevdiyi, maraqlandığı hər şey haqqında yaza bilir. Hacı Sabir Həsənli "Söz fədaisi" adlı məqaləsində Hacı Soltanın "çox rüzgarlara sinə gərdiyini, həyatın çox sınaqıarından başıuca çıxdığını, kəsərli qələmə malik olduğunu, onlarla maraqlı kitablar, İslamın müxtəlif sahələrini əks etdirən yazılar çap etdirdiyini qeyd edərək yazır: "... Onun qələminin və ruhunun sağlamlığı geniş oxucu kütləsinə yaxşı bəllidir. Azərbaycan klassik şeirinə vaqif olmaq, onun ruhunu yaşatmaq hər qələm əhlinə nəsib olmur. Hacı o müqəddəs xəzinəyə baş vuranlardandır ki, bu da ilahi bir qisməti paylaşmaq, bitməz, tükənməz yaradıcılıq sərvətinə baş vurmaq şansıdır. Nə gözəl ki, Hacı Soltana Uca Rəbbimizin hamıya bəxş etdiyi qabiliyyətlərdən daha çox pay düşmüşdür" (sms. səh. 26).

Bütün sahədən olan sənətkarlar haqqında, xalqın sevimli övladları haqqında qələmə aldığı ithaf şeirlərində obrazları rəngarəng olduğu qədər də maraqlıdır. Höccətül-İslam vəlmüslimin Seyyid Əliəkbər Ocaqneyad "Hacı Soltan" rədifli

qəzəlində onun kəlamına çox böyük dəyər vermişdir.

"Dübeytlər, rübailər, tiyuğlar" kitabının sonunda "Dünya poeziyasında İmam Əli (ə) obrazı" adlı geniş məqalə, məqalənin sonunda Əliyə (ə) həsr edilmiş şeirlər də yer almışdır. Seyyid Yəhya Bakuvinin tədqiqatçısı Dr. Metmet Rıhtım "Əli (ə) yolunun yorulmaz bəndəsi" adlı məqaləsində yazır: "İmam Əli əleyhissəlam "Ölmək istəmirsizsə, ölməz əsər buraxın" buyurur. Əli əleyhissəlamın yorulmaz bəndəsi Hacı Soltan "Mən Əli şairiyəm" deyir. "Allah eşqi, insan eşqi, söz eşqi" deyir. Bununla da o öz ürəyindən keçən səmimi hisslərini, təmiz duyğularını qələmə alır, ölməz əsərlər yazır" (sms. səh.18).

Yazımızı Ocaq Neyadın Hacı Soltana ithaf etdiyi qəzəli ilə tamamlayırıq:

İnsanlığa həsr etdi kəlamın Hacı Soltan.
Sındırmadı ömründə məramın Hacı Soltan.

Od saldı cəhalət kökünə mərifətilə,
Çünki tanıdı əsrin imamın Hacı Soltan.

Dərk eylədi çox dövrəni, tərk etmədi amma
Zikrü sələvat ilə səlamın Hacı Soltan.

Şe'rü ədəbin mərifətü elmü kəlamın,
Xadim elədi haqqa, təmamın, Hacı Soltan.

Aydındı bu söz həm sənə, həm aləmə, Seyyid,
Gər versə başın, verməz inamın Hacı Soltan.

# 13.HƏZRƏT ƏLİ (ə) və DÜNYA ƏDƏBİYYATI

Hacı Soltanın "Həzrəti-Əli (ə) və dünya ədəbiyyatı" adlı növbəti kitabı 2001-ci ildə "Tural-Ə" Nəşriyyat-Poliqrafiya Mərkəzində çap edilmişdir. Kitabın redaktoru Arif Əşrəf Buzovnalıdır. Annotasiyada oxuyuruq: "Axund Hacı Soltan Hüseynqulu oğlunun sayca on üçüncü olan bu kitabı Əmirəlmöminin Həzrəti-Əli (ə) şəxsiyyəti haqqında dünya yazarlarının fikir və rəylərinin şərhindən ibarət olub, İmam Əlinin (ə) dünya ədəbiyyatında rolunun mahiyyətindən bəhs açır. Kitab geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur (səh. 2).

Kitab "Allahın adı ilə" açılır və Həzrəti-Mühəmmədin (s) Həzrəti-Əlini (ə) səciyyələndirən yeddi sözü oxuculara təqdim olunur:

"Əgər ağaclar qələm, dəryalar mürəkkəb, cinlər hesabdar, insanlar yazan olsaydı, yenə də Əli ibn Əbu Talibin fəzilətlərini sayıb qurtara bilməzdilər".

"Əlinin üzünə baxmaq ibadətdir".

"Möminin əməl dəftərinin sərlövhəsi Əli ibn Əbu Talibin məhəbbətidir".

"Əli məndən, mən Əlidənəm. O, məndən sonra bütün möminlərin mövlasıdır".

"Məndən sonra ümmətimin ən elmlisi Əli ibn Əbu Talibdir".

"Əlinin Xəndək müharibəsində vurduğu bir zərbə, insanların və cinlərin qiyamətə qədər ibadətindən daha üstündür".

"Qiyamət günündə ərşdən nida gələr: "Ya Mühəmməd! Əcdadların ən yaxşısı əcdadın İbrahim, qardaşların ən yaxşısı isə qardaşın Əlidir" (səh.3).

Fəlsəfə elmləri doktoru Vəli Həbiboğlunun kitab haqqında “Həzrəti-Əli (ə) və dünya ədəbiyyatı” adlı yazısında oxuyuruq: “Respublikamızın din xadimləri arasında gözəl tədqiqatları, sanballı kitabları ilə tanınan Axund Hacı Soltan Hüseynqulu oğlunun bu yaxınlarda “Həzrəti-Əli (ə) və dünya ədəbiyyatı” kitabı çap olunmuşdur. Geniş mütaliəsi, İslam dininin tarixini və ədəbiyyatını mükəmməl bilməsi son illərdə ona bir sıra sanballı tədqiqat işləri, maraqlı kitablar hazırlamağa imkan vermişdir. Müəllifin “Azərbaycan dərvişləri və rövzəxanları”, “Şah İsmayıl Xətai”, “Xətaişünaslığa hədiyyə”, “Xətai və Füzuli”, “İslam idman antologiyası”.. “Yaşamaq, yaşatmaq, yaratmaq”, “İslamda idman və böks şahı Məhəmməd Əli”, “Hidayət yolu” və bir çox kitabları sevilə-sevilə oxunur. Son 6 il ərzində on iki kitab nəşr etdirən Hacı Soltan bir din xadimi kimi, indiyədək geniş ictimaiyyətə bəlli olmayan Şərqin bir çox şairlərinin yaradıcılığında öz əksini tapmış, daha doğrusu, çox şairlərin ilham mənbəyinə çevrilmiş Həzrəti-Əli mövzusuna müraciət etmiş və “Həzrəti-Əli (ə) və dünya ədəbiyyatı” kitabını yazmışdır. Kitabı vərəqlədikcə Həzrəti-Əli (ə) haqqında yazan yüzlərlə şairin adı ilə tanış olursan, onların bu qüdrətli şəxsiyyət haqqında fikirləri, şeir misraları adamı valeh edir” (sms. səh. 252).

Kitab iki hissədən ibarətdir, I hissədə 6 fəsil vardır. I fəsildə “Şərq ədəbiyyatında İmam Əli (ə) şəxsiyyəti”ni səciyyələndirməyə çalışan müəllif ilkin olaraq Şeyxül-İslam Məhəmməd Həsən Mövlazadə Şəkəvinin tərcüməsində “Həl-Əta surəsini verir. Sonra Həzrəti-Əlinin (ə) tərifini verənlərin siyahısını təqdim edir:

1.Allah-təbarəkə və təala (Quran və mələklər vasitəsi ilə).

2.Peyğəmbərlər (hədis və möcüzələrlə).

3.Həzrəti-Mühəmmədin (s) dilindən deyilən hədislər.

4.Məsum imanmların gözü ilə.

5.Həzrəti-Əlinin (ə) dili ilə ("Nəhcül-bəlağə və Divani-Əli vasitəsi ilə).

6.Şairlərin gözü ilə.

7.İslam və qeyri-islam alimlərinin gözü ilə.

8.Dostlarının gözü ilə.

9.Düşmənlərinin gözü ilə.

10.Hökmdarların gözü ilə.

11.Ən məşhur şəxsiyyətlər və ən sadə insanların gözü ilə.

12.Dərviş və rövzəxanların gözü ilə (səh.9).

Bu fəsildə Həzrəti-Əlinin (ə) künyə və ləqəblərini açıqlayan müəllif fikirlərini Qurana istinadən əsaslandırır. Sonra Həzrəti-Əlinin (ə) İmam Hüseynə (ə) nəsihətini, onu şəhadətə hazırlamaq üçün dediklərini oxuculara çatdırır. Burada Həzrəti-Əlinin (ə) təvəllüdündən söz açan Hacı Soltan bir sıra sənədli rəvayətlərə müraciət edir və Əli (ə) haqqında yazılmış şeirlərin şərhini verir. Kiitaba daxil edilən mərhum Ayətullah Mərəşi Nəcəfinin Həzrəti-Əlinin (ə) "Şəhriyar, şeirini oxu" deməsi ilə bağlı yuxusu da maraq doğurur. Bu fəsildə həm xarici ölkə şairlərinin, həm də Azərbaycan şairlərinin Həzrəti-Əliyə (ə) həsr etdikləri əsərlərlə tanış oluruq.

"Nizami Gəncəvi və Xaqani Şirvani yaradıcılığında İmam Əli (ə) şəxsiyyəti" adlı II fəsil Quranın "Şüəra" surəsinin ayələri ilə açılır. Nizami "Xəmsə"sində və Xaqaninin qəsidə-

lərində Əli (ə) ilə bağlı dəyərli fikirləri diqqətə çatdıran müəllif sonda özünün “Nizami” rədifli qəzəlini təqdim edir.

III fəsildə Nizamidən, Xaqanidən başlayan müəllif Əlini (ə) mədh edən digər Azərbaycan şairlərinin adlarını da sadalayır və Məhəmməd Əmin Dilsuz, Bixud Şirvani, Məhəmməd Füzuli, İmadəddin Nəsimi, Seyyid Əzim Şirvani, Naseh Şirvani, Əmani, Kərbəlayi Əsəd Zair Təbrizi, Mirzə Həsib Qüdsi, Seyyid Zərgər, Dilxun Ağamirzə, Faiz, Mirzə Kərim Şüai Dərbəndi, Məhəmməd İsmayıl Asi, Ağadadaş Müniri, İsmayıl Amil, Şıxəli Tuti, Kərbəlayi Rzaəli Nazim, Hacı Murad Vüzuli, Ğulaməli Azəri kimi şairlərin Əli (ə) haqqında şeirlərini oxuculara təqdim edir. Bu şeirlərin kitaba daxil edilməsi çox böyük əhəmiyyət daşıyır. Mən həmişə bir şairin kitabını tərtib edəndə, mütləq Hacı Soltanın kitablarını vərəqləyirəm. Ağadadaş Münirinin qəsidəsi də Əlyazmalar İnstitutunda olan əlyazma qovluğunda yox idi, biz onu Hacının kitabından götürüb şairin şeirlər toplusuna daxil etdik.

Vəli Həbiboğlu “Əlinin üzünə baxmaq ibadətdir (Məhəmməd (s)” adlı məqaləsini belə başlayır: “Hər cür qadağalara, məhrumiyyətlərə baxmayaraq xalqımız öz müqəddəs dininə hörmət və ehtiramını qəlbində qoruyub saxlamışdır.

Bu gün həyatımızı, əxlaqımızı bu müqəddəs din olmadan təsəvvür etmək çətindir. Bu cəhətdən Hacı Soltan böyük maarifçilik işi aparır. İlk baxışda sadə görünən bu iş heç də asan deyil. “Həzrəti-Əli (ə) və dünya ədəbiyyatı” kimi sanballı bir kitab hazırlamaq üçün müəllif din tarixini, ədəbiyyatını dərindən bilməlidir, geniş mütaliə qabiliyyətinə malik olmalıdır, ərəb və fars dillərində oxumağı, yazmağı bacarmalıdır. Bütün bunlardan əlavə, islamiyyətə, Həzrəti-Əliyə (ə)

böyük məhəbbət bəsləməlidir. Bu keyfiyyətlərin hamısı Hacı Soltanda var. O, müasir din xadimlərimiz arasında yeganə şəxsdir ki, bütün bilik və bacarığını xalqın maariflənməsi işinə sərf edir" (sms. səh. 253).

IV fəsil "Aşıq Qurbani, Aşıq Alı və Aşıq Ələsgər yaradıcılığında İmam Əli (ə) şəxsiyyəti" adlanır. Bu fəsildə Azərbaycan aşıq sənətindən söz açan Hacı Soltan bir sıra folklorşünas alimlərimizin fikirlərinə də istinad edir, Qurbanidən, Xətaidən də danışır, nədənsə təkcə Qurbaninin Əliyə (ə) həsr olunmuş şeirlərini diqqətə çatdırır, digərlərini növbəti fəslə saxlayır. V fəsildə Azərbaycan dastanlarından söz açan müəllif "Koroğlu", "Ağ Aşıq və Susənbər", "Abbas və Gülgəz" dastanlarında Həzrəti-Əliyə (ə) müraciət olunan şeirlərdən sitatlar verir. Sonra Aşıq Alı yaradıcılığına keçir. VI fəsildə Aşıq Ələsgər yaradıcılığından bəhs edir. Sonra Aşıq Miskin Abdalın, Abdal İbrahimin, Yunis İmrənin, Qurbaninin, Xəstə Qasımın, Aşıq Əhməd Rüstəmlinin, Dəmirçi Abbasın, Abbas Tufarqanlının, türkmən aşığı Seyid Nəzər Seydinin, İran aşığı Məhbub Xəlilinin, türk aşığı Pir Sultanın, özbək aşığı Məhəmməd Əlinin, Anadolu aşığı Rəcəb Hifzinin və Sabit Müdaminin, Aşıq Talıbın, Aşıq Nəcəfin, Aşıq Mələksimanın, Aşıq Şirinbəyimin, Aşıq Ağacanın, Aşıq Mustafanın, Aşıq Bəxtiyarın, Samın, Xətainin, Fəzlullah Nəiminin, Pir Sultan Abdalın, Qayğusuz Abdalın, Dərviş Əlinin, Səfil Əlinin, Viraninin, Abdal Musanın, Dədə Vəlioğlunun, Beyhaninin, İbrətinin, Harabinin əsərlərindən nümunələr verən Hacı Soltan Seyid Əzimi xatırlayır, onun söz haqqında bir bəndini verir, sonra Molla Pənah Vaqifin müstəzadından sitat verir

və yenidən aşıq Ələsgərə qayıdır, şeirlərini təqdim edir, sonra Fəqir Ordubadi ilə paralellər apadığından Fəqirin Əliyə (ə) həsr etdiyi şeirini verir, daha sonra Qasım bəy Zakirin müstəzadından parça verir və yenidən Aşıq Əliəsgərə qayıdır, onun şeirlərini diqqətə çatdırır. Aşıq Şəmşirə keçid alan tədqiqatçı onun Əhli-beytə həsr olunmuş əsərlərindən nümunələr verməklə sevgisini bildirir. Daha sonra bir neçə əhli-beyt aşiqlərinin adını çəkir, Aşıq Qəmbərin, Aşıq Valehin şeirlərini verir və yenidən Aşıq Şəmşirə qayıdır. Sonda Aşıq Qurbani, Aşıq Alı və Aşıq Ələsgər yaradıcılığında islami dəyərlərin, Həzrəti-Əli (ə) sevgisinin əks olunduğunu və bu aşıqların yaradıcılığının bizim üçün bir xəzinə olduğunu vurğulayır. Əslində, V və VI fəsillər IV fəslin yarımfəsilləridir, nədənsə müəllif onları ayrıca fəsildə vermişdir...

Kitabın II hissəsi 3 fəsildən ibarətdir. "Həzrəti-Əli (ə) və Qərb ədəbiyyatı" adlanan I fəsil Quran ayəsi və Həzrəti-Mühəmmədin (s) hədisləri ilə başlayır: "Şərq də, Qərb də Allahındır. Hansı tərəfə yönəlsəniz, Allah oradadır. Həqiqətən, Allah hər şeyi bilən və genişlik bəxş edəndir".  Bəqərə" surəsi, 115-ci ayə. "Mən elmin şəhəriyəm, Əli onun qapısıdır". "Həzrəti-Adəmin elmini, Nuhun düşüncəsini, Yəhyanın təqvasını, İbrahimin əxlaqını görmək istəyən Əbu Talibin oğlu Əliyə baxsın!" (səh. 213).

Hacı Soltan sözünə bir qədər uzaqdan başlayır, məqsədinin dünya xalqlarının Həzrəti-Əliyə (ə) münasibətini bilmək və oxuculara çatdırmaq olduğunu vurğulayır, laədri şeirdən bir bənd verir:

Bir adın Quran içində mədəni-cudi-səxa,
Katibi-qüdrət yazıb İncil içində İliya.
Yazılan Tövratın on dörd yerində Şintiya,
Pərdeyi-rüxsari ol mehri-dilaradan gəlib.

(yenə orada)

Bu fəsildə xristian yazıçı Süleyman Kəttaninin Nəcəf şəhərində keçirilən Əli (ə) ilə bağlı müsabiqədə I yeri tutan “Əl İmam Əli nibrə’s və mitrəs” və Fatimeyi-Zəhra (s.ə) ilə bağlı müsabiqədə yenə də I yeri tutan “Fatimətəz-Zəhra və tərr fi ğimdi” adlı kitablarından, məşhur fransız şərqşünası, tədqiqatçı alim Lui Masinyonun Fatimeyi-Zəhra haqqındakı dəyərli fikirlərindən söz açan müəllif məşhur ingilis şərqşünası, professor Edvard Braunun “Görəsən, elə bir şəxs tapılar ki, Kərbəla hadisəsini eşidə, onun ürəyi qanla, kədərlə dolmaya?”, alman alimi Marrbininin “Müsəlmanların bir millət kimi mövcudluğu İmam Hüseynin (ə) şəhadətidir. Buna görə ki, İmam Hüseyn (ə) eşqinə yanan bir şəxs heç vaxt zilləti, kökəliyi qəbul etməz”, Hindistanın dövlət xadimi bütpərəst Mahatma Qandinin “Hindistanı xilas etmək istəyirsinizsə, İmam Hüseyn (ə) yolunu tutun”, Pakistanın keçmiş baş naziri Binəzir Bhuttonun “Həzrəti-Əli (ə) öz qılıncını və elmini İslam yolunda işlətdi. Bütün ariflər və böyük şəxsiyyətlər onun yaşayışını özləri üçün nümunə bilmişlər”, ingilis alimi Karlilin “Əli (ə) öz ədalətinin qurbanı oldu. Çünki camaat onun qanunlarına dözmək taqətinə malik deyildi”, ingilis yazıçısı Tomas Karlaylın “Lakin Əli (ə) ... haqqında bizə təkcə bu qalır ki, onu sevək, ona məhəbbət bəsləyək. O, böyük

və alicənab şəxsiyyət idi. Onun vicdan çeşməsindən xeyir və yaxşılıq qaynayırdı, ürəyindən qəhrəmanlıq və təlatüm şölələri alovlanıb qalxırdı. O aslan tək şücaətli idi, lakin bu şücaət lütf, səfa və rəhmət dolu bir ruhla qarışmışdı, incə insani duyğular, həlimlik və yüksəklik hissləri ilə dopdolu idi", xaçpərəst yazıçı Mixail Nueymənin "Bir yazıçı və tarixçi nə qədər dahi və hünər sahibi olsa da, heç bir vaxt bir neçə min səhifədə Əlinin (ə) şəxsiyyətinin mükəmməl təsvirini, onun yaşadığı fitnə dolu və fırtınalı mühiti açıqlaya bilməz. Çünki bu kamil ərəb oğlu özü ilə Tanrı arasında heç kəsin eşidib görmədiyi bir ünsiyyət yaratmışdı...", fransız yazıçısı Volterin "İslam peyğəmbərinin sonuncu istək və iradəsi yerinə yetmədi. O, ölüm yatağında olarkən Əlini öz canişini seçmişdi. Lakin onun vəfatından sonra bu istək həmin əsrin bir sıra nüfuz sahibləri tərəfindən nəzərə alınmadı", fransız Baron Kardovanın "Əli – o bənzərsiz şücaət sahibi, tayı-bərabəri olmayan qəhrəman və cəsur insan İslam Peyğəmbəri ilə çiyin-çiyinə vuruşur, fəaliyyət göstərir və möcüzəsayağı qiyam edirdi. Bunlar tarixdə şan-şöhrət və əzəmətlə xatırlanır. Əli (ə) Bədr döyüşündə iyirmi yaşlı cavan idi, bir qılınc zərbəsi ilə qolunun zoru ilə qüreyş süvarilərindən olan, özü də güclü və qəhrəman sayılan məşhur bir adamı iki böldü. Ühüd döyüşündə Peyğəmbərin qılıncını götürdü, hər bir zərbəsi ilə başları parçaladı, zirehləri yırtdı. Yəhud və Xeybər qalalarına yürüşdə bir əli ilə ağır dəmir darvazanı yerindən qoparıb başı üzərində sipərə çevirdi. İslam peyğəmbəri onu çox sevirdi, ona böyük inam və etibarı var idi. Bir dəfə Peyğəmbər nəzərlərini ona dikmiş halda belə söylədi:

“Mən hər kim üçün mövlayamsa, Əli onun mövlasıdır”, ateist filosof Şibli Şüməyyilin “İmam Əli ibn Əbu Talib dünya böyüklərinin böyüyü, zamanın yeganə şəxsiyyəti idi. Qərb və Şərq dünyasında, keçmişdə və indiki vaxtda öz əslinə tam bənzər olan ikinci belə bir şəxs görünməmişdir”, yazıçı Corc Cordakın “Tarixin yanında həqiqət və gerçəklik bir cürdür, istər onu tanıyasan, istərsə də tanımayasan, fərq etməz. Adlı-sanlı şəhid, şəhidlərin böyük atası Əli ibn Əbu Talib insan ədalətinin səsidir, Şərqin əbədi şəxsiyyətidir”, müasir xaçpərəst yazıçı Cübran Xəlil Cübran Livaninin “Mənim əqidəmcə, Əbu Talibin övladı ilk ərəbdir ki, Ruhi-küllün yaxınlığını, zəruriliyini və insanla qırılmaz əlaqəsini əsas kimi götürmüşdür. Əli həmin ruhla gecələr ünsiyyət saxlayır və sirdaşlıq edirdi. O ilk ərəb idi ki, Ruhi-küllün ahəngini xalqın qulağına pıçıldayırdı, xalq isə bundan qabaq belə bir nəğmə eşitməmişdi. Beləliklə, adi xalq onun işıq saçan bəlağət yollarının ortasında öz keçmişlərinin qaranlıqlarına görə heyran qaldı. Hər bir kəs ona könül bağladı, ona heyran oldu, cahiliyyət və nadanlıq övladları isə ona düşmən kəsildilər”, xaçpərəst alim, siyasi xadim Hərsəsiyanın “Əgər bu böyük xətib Əli ibn Əbu Talib bizim əsrimizdə elə bu gün Kufə məscidində minbərə qalxsaydı görərdi ki, məscid Avropanın böyükləri və görkəmli adamları ilə doludur: hamı gələrdi və öz ruhlarını onun bilik dolu dənizindən sirab etmək üçün buraya toplaşardı” kimi dəyərli fikirlərini də biz oxuculara təqdim edir. Hələ fikirlərini sitat vermədiyi neçə-neçə alimin adını də sadalayır (214-223). Mənsə bütün bunları oxuduqca, düşünürəm ki, görəsən bu qədər xarici ədəbiy-

yatdan olan sitatları Hacı Soltan necə əldə edib? Bu qədər ədəbiyyatı araşdırmaq, doğrudan da, tədqiqatçıdan böyük səy, bacarıq, həvəs, iradə tələb edir. Öz-özlüyümdə Hacı Soltana "əhsən" deyirəm. Filologiya elmləri namizədi Vərağa Almasov "Qələmini belə çevirmiş mənəviyyat əkinçisi" adlı məqaləsində 90-cı illərdəki canlanmanı təsvir edir, bir sıra alimlərin fəaliyyətinə güzgü tutur və yazır: "…Axund Hacı Soltan da belə mürəkkəb bir dövrdə, hamı üçün gözlənilməz olan Həzrəti-Əlinin (ə) Azərbaycan və dünya ədəbiyyatındakı tərənnümü, fəlsəfə fikir tariximizdəki yeri və milli-mənəvi dəyərlərimizin formalaşmasına təsiri kimi dedikcə aktual mövzularla bağlı materiallar toplamağa başlamış, bu yöndəki axtarışlarını sürətləndirmişdir" (sms.səh.92).

Nə yaxşı ki, Hacı Soltan Əli (ə) ilə bağlı məlumatları kitab-kitab toplayıb bizə çatdırıb. Yadıma, onun mənə bağışladığı disk komplekti düşür. Əli (ə) ilə bağlı filmlərdən parçalara, məclislərdən fraqmentlərə, çıxışlardan epizodlara baxdıqca, adamı yaxşı mənada dəhşət bürüyür. Hacı Soltanın bu işləri bizim mədəniyyət tariximiz üçün dəyərli töhfədir.

Qəhrəman Cəbrayılov "Əli şəminin pərvanəsi" adlı məqaləsində yazır: "...Qurani-Kərimə, islami əfkara, ən ulu və qədim, müqəddəs qaynaqlara arxalanan milli əxlaqımızı və mənəviyyatımızı əks etdirən çoxsaylı kitablar, dərgilər çap etdirən, müsəlləh bir əsgər kimi dinimizin və məzhəbimizin müdafiəsinə qalxan, türk, islam ruhunun zəfəri yolunda öz qələmini silaha çevirib uğurla işlədən, bəlkə də öz qələmini Zülfiqari-dusər edən Axund Hacı Soltan Əlizadə ağanın bir şair, mütəfəkkir alim və islam ziyalısı kimi xidmətləri, əl-

bəttə, əvəzsizdir. Yaratdığı dini-fəlsəfi ədəbiyyatla o, bir daha Allah məddahı, Əli (ə) aşiqi olduğunu, öndərləri Nizami, Nəsimi, Xətai, Füzuli və Seyyidin varisi və davamçısı olduğunu sübuta yetirdi. Düşünürəm ki, XX-XXI əsrlərdə onun İslama etdiyi xidməti mövlamız Əli əleyhissəlamın sərkərdələrinin rəşadətiylə eyniləşdirmək olar " (sms. səh.94).

II hissənin II fəsli "Həzrəti-Əli (ə) – dostlar və düşmənlər" adlanır və Həzrəti-Mühəmmədin (s) sözü ilə açılır: "Əlini sevən məni sevib, məni sevən Allahı sevmiş kimidir. Əlini qəzəbləndirən məni qəzəbləndirmiş kimidir, məni qəzəbləndirən isə Allahı qəzəbə gətirər".

Bu fəsildə müəllif Əlinin (ə) həm dostlarının məhəbbət dolu fikirlərini, həm də düşmənlərinin heyrət dolu etiraflarını təqdim edir, sonda Seyyid Əsəd Hüseyninin "Əli" rədifli 12 bəndlik müxəmməsini verir.

"Həzrəti-Əli (ə) və İslamda birlik" adlanan III fəsil "Ali-İmran" surəsinin 103-cü ayəsilə və Həzrəti-Mühəmmədin hədisi ilə açılır: "Əgər camaat Əli ibn Əbu Talibin məhəbbəti ilə onun başına toplaşsaydı, Allah-təala cəhənnəm odunu yaratmazdı" (səh.229). Hacı Soltan bu fəsildə İslam dünyasında baş verən parçalanmadan söz açır, Seyyid Əzim Şirvaninin və Mirzə Əliəkbər Sabirin şeirlərindən sitatlar verərək öz fikirlərini dolğunlaşdırır. Müəllif Xətainin "...Mən sünni və şiə təriqətlərini birləşdirirəm. Mən vətən torpaqlarını birləşdirirəm. Gələcəkdə hamı bir əqidədə olanda, qalan şeylər yaddan çıxacaq, nifaq aradan götürüləcək...", Şəhid Ayətullah Sədrin "Mən bütün ömrümü şiə ilə sünninin vəhdəti və qardaşlığı yolunda sərf etmişəm, onların birliyinə səbəb olan

hər pəyamı, hər əqidəni müdafiə və himayə etmişəm. Mən şiənin qardaşı və övladı olduğum kimi, əhli-sünnənin də qardaşı və övladıyam", Əllamə Seyid Şərafəddin Amulinin "Sünni ilə şiə arasında anlaşma və birlik yaratmaq fikri, sıxılmış bulud topalarından qopan ildırım kimi sinəmdə parlayır, bir qeyrət kimi qanımda qaynayırdı. Həmişə müsəlmanları anlaşma sərhəddinə yetirib, düşmənçiliyi aradan qaldıran bir yol axtarışında idim", Əllamə Təbatəbainin "Bu gün müsəlmanlar müqəddəs islamın üsul məsələlərində həmrəyliklərini nəzərə almalı, əcnəbi qüvvələrdən çəkindikləri sıxıntı və narahatlıqlardan özlərinə gəlməli, ayrı-seçkiliyi kənara qoyaraq, bir sırada birləşməlidirlər" sözlərini və digər alimlərin bu kimi dəyərli fikirlərini toplayıb kitaba daxil etmişdir" (səh.251-252).

"Həzrəti-Əli (ə) və dünya ədəbiyyatı" adlı kitabın sonunda Hacı Soltanın Əhli-beytə həsr olunmuş 22 müxtəlif janrda şeirləri və 56 dördlüyü verilmişdir.

"İqtisadiyyat" qəzeti də 24-30 avqust, 2001-ci il tarixli sayında Hacı Soltanın bu kitabının çapdan çıxmasını alqışlayaraq yazır: "İmam Əli (ə) haqqında yazılmış kitablar sayagəlməzdir. Nə yaxşı ki, Axund Hacı Soltan həmin kitabların sorağı ilə getmiş, onlardan bəhrələnərək Əli (ə) və dünya ədəbiyyatı mövzusunda son dərəcə dəyərli bir əsər yaratmışdır. Bu, təqdir edilməli xidmətdir, İmam Əliyə (ə) olan məhəbbətin yeni təzahürüdür".

Yazımızı Kərəm Kürqıraxlının Hacı Soltana ithafən yazdığı Həzrəti Əlidən (ə) bəhs edən "Əli" adlı şeiri ilə yekunlaşdırırıq:

Buyurmuş ümmətə Rəsuli-Əkrəm:
**Əli** bu dünyaya sultandır, xandır.
Beyət etməyəni bu beş kimsəyə,
Rəbbim, zəlil edib odlara yandır.

Qəlbində əbədi Haqqın adı var,
Rəsuli-Əkrəm  tək bir ustadı var.
Dünyada nə qədər Əli adı var,
Bütün bu adlara canım qurbandır.

Vuruşlarda olan talandan bəri,
Zalımlara qılınc çalandan bəri,
Bilin, bu dünyaya gələndən bəri
Əli min hikmətli sirri-Sübhandır.

Onun tək məzlumlar qəlbi alanın,
Daş tək ürəklərə mürvət salanın,
Zərrəcə Əliyə eşqi olanın,
Xudam, zülmətdəsə, çırağın yandır.

Kərəm, nər doğulmaz bu nərdən sora,
Kim neylər bu boyda hünərdən sora?
Əli nökər gəzsə Qənbərdən sora,
Bilin ki, bu nökər Hacı Soltandır.

21.03.2002,  Bakı-Buzovna.

# 14.GİZLİ XƏZİNƏDƏN İNCİLƏR

Hacı Soltanın on dördüncü kitabı “Gizli xəzinələrdən incilər” adlanır. 2002-ci ildə “Tural-Ə” Nəşriyyat Poliqrafiya Mərkəzində Arif Əşrəf Buzovnalının redaktorluğu ilə nəşr olunan bu şeirlər toplusunda dünəndən bu günə bir çox şairlərin əsərləri yer alır.

Tərtibçinin kitaba yazdığı ön sözdə oxuyuruq: “Həzrəti-Mühəmməd (s) buyurmuşdur: “Həqiqətən, göyün altında Allahın gizlin xəzinələri vardır ki, onların açarları şairlərin dilləridir”. Bu səhih hədisə istinadən Azərbaycanın müəyyən hadisələr fonunda əsərləri üzə çıxmayan və yaxud əsərlərinin cüzvi bir hissəsi ilə tanınan, əslində isə xalq içərisində böyük nüfuza malik olan şairlərdən bəzilərinin həqiqətən də Allahın ərşi altındakı xəzinələrə sahib olduğunu nəzərə çatdırmağı lazım bildik və inşəallah ki, buna müvəffəqik. Peyğəmbər (s) və Ali-Peyğəmbərin (ə.m.) vəsfini verən bu şairlərin əksər hissəsi Azərbaycan ədəbiyyatında və folklorunda qədim adət-ənənələrin, ümumilikdə tarixin qorunub saxlanılmasında mühüm rolu olsa da, onlar bu günkü oxucu kütləsinə ya qismən tanışdır, ya da tamamilə tanış deyil. Onların ədəbi xarüqələrini kitab halında Azərbaycan oxucusuna çatdırmağımız bu şairlərin ruhları qarşısında etdiyimiz kiçik bir xidmətdən başqa bir şey deyildir” (səh.3).

Kitabın əvvəlində Hacı Soltanın “Qurani-Kərim”də Həzrəti-Əli (ə) barəsində gələn ayələrin bir qismi haqqında”, “Mübahilə” ayəsinin şərhi”, “Əhli-beytə aid hədislər”, “Həzrəti-Mühəmmədin (s) İmam Əli (ə) haqda buyurduğu

kəlamlardan bir qismi", Məhəmməd Peyğəmbərin (s) Ramazanda xalq qarşısında söylədiyi "Xütbə", "Məsumların kəlamlarından", "Həzrəti-Əmirəlmöminin Əli ibn Əbu Talibin (ə) ad, ləqəb və künyələri" adlı yazıları yer alır.

Kitabın I fəsli M.P.Vaqifin şeiri ilə başlayır:

...Ey xoş ol kəslər Mühəmməd Müstəfani sevdilər,
Oldular aşiq, Əliyyəl Mürtəzani sevdilər.
Sidqü ixlas ilə pənc ali-əbani sevdilər,
Çardəh məsum tək müşgülgüşani sevdilər.
Daxi onlardan gözəl yaxşi cəmaət görmədim...

Bu fəsildə Fəxri Gürgani, Hilali, Zakir, Qüdsi, Şaki, Nadim, Asif, Mücrüm, Sağəri, Vəhşi, Müniri, Məhcur, Fəqir, Dərviş, Dilsuz, Dilriş, Xəyyam, Şeyx Səfi, Dəxil, Taib, Fədəvi, Yasəvi, İbn Sina, Rövnəq, Xazin, Sultan Səlim Yavuz, Saib, Seyyid Nigari, Mənsur Həllac, Şəms Təbrizi, Şəbüstəri, Xalxali, Yunis İmrə, İsmayıl bəy Nakam, Xaqani, Nizami, Qazi Bürhanəddin, Novbəri, Məsihi, Əvhədi, Nəimi, Nəsimi, Xətai, Həbibi, Məkuki, Füzuli, Şeyx Bəhaəddin, Rudəki, Əbu Səid Əbülxeyr, Nasir Xosrov, Nəvai, Qətran Təbrizi, Sənai, Əsir Əxsikəti, Ənvəri, Əmir Xosrov Dəhləvi, Cami, Ziya paşa, Bahar Şirvani, Fikri, Xəzani, Ruhi Bağdadi, Zikri, Aciz, Vaqif, Vidadi, Seyyid Əzim, Həqir, Nəbati, Şükuhi, Qumri, Abbasqulu ağa Qüdsi, Hüzni, Zövqi, Hürri Dilavər, Hüseyn, Raci, Naseh, Natəvan, Yryan, Müxlis, Nişat, Sərraf, Hacı Şıxəli Tuti, Faiz, Şüai Dərbəndi, Şahi, Abdulla Şaiq, Manaf, Yusif, Cənnəti, Səid Ünsizadə, Müznib, Müztər, Pürğəm, Kazım paşa, Didə, Zəlil, Vazeh, Möcüz, Nəvvab, Nabi, Mirzə Zeynal Şirvani, Mirzə Səməndər Dərbəndi, Qəmgin, Dadaş Vasif, Məhəmməd İsmayıl Asi,

Sədi Şirazi, İbn Yəmin, Mirzə Əbdülkərim ağa, Axund Mirhəbib ağa, Makas Zeynəlabidin, Hacı Zeynəlabidin Marağayi, Məhsəti, Həqiqi, Səməd Mənsur, Dağlı, Hüseyn Cavid, Şıxəli Qurbanov, Çakər Lənkərani, Aşıq Alı, Aşıq Ələsgər, Aşıq Hüseyn Bozalqanlı, Miskin Abdal, Aşıq Xındı Məmməd, Aşıq Səməd, Hüseyn, Aşıq Soltan, Abbas Tufarqanlı, Aşıq Şəmşir, Pərvanə Həsən, Molla Cümə, Bakir, Hacıdadaş Qaib Səmədzadə, Qövsi Təbrizi, Əhməd Rumlu, Mücirəddin Beyləqani, Mikayıl Müşfiq, Nigar Rəfibəyli, Mirmehdi Seyidzadə, Rəsul Rza, Ağasəlim Fədai, Hacımurad Vüzuli, Məşədi Azər, Saqib, Şeyx Rəşid Bülbüləli, Sabit, Pərişan, Sürəyya, Əliağa Şərqi, Cövhər, Məxtimqulu, M.F.Axundov, Bisəvad, Sarayi, Naci, Şahid, Məddah, Dülgər, Hacı Mail, Hacı Kazım, Məhəmmədəmin Yurdaqul, Məhəmmədəmin Rəsulzadə, Məhəmməd Hadi, Dilxun Təbrizli, Səməd Vurğun, C.Cabbarlı, Puşkin, Vahid, Cəfər Rəmzi, Musəvi, Nüsrəti, Müim, Əbdürrəhim Munzəvi, Hacı Qədir Ənvər, Hacıbaba Hüseynov, İmam Xomeyni, Haləti, Dərviş Şirinəli, Səlman Rəhimli, Rüstəm Samit, Naxçıvanlı Zakir, Hökumə Bülluri, Sabunçulu qızı, Elnarə Buzovnalı, Bəhmən Vətənoğlu, Dəmirçi Abbas, Seyyid Murad, Məhəmməd Hüseyn, Namiq Kamal Dərbəndi, Kərim Pirşağılı, Huşyar, Aşiq, Növrəs İman, Məşədi Əyyub Baki Qarabaği, Əbdülməcid Naci (Racinin oğlu), Həkim Mirzə Əlixan Ləli, Zəbih, Nazim, Kərim ağa Safi kimi şairlərin əsərləri toplanmışdır. Fəslin sonunda tərtibçi araşdırmalar zamanı “Şükufeyi-ğəm”, “Yasəmən” və s. növhə kitablarında bir çox şairlərin əsərləri ilə tanış olduğunu və digər əsərlərin bundan əvvəlki kitablarına daxil olduğu üçün burada təkrar verməyi lazımsız hesab etdiyini bildirir.

Bu qədər əsəri bir kitabda toplamağın olduqca böyük

əziyyəti və eyni zamanda böyük əhəmiyyəti vardır. Bu əsərlər sovet dönəmində çapdan kənar qalmış, oxuculara çatdırılmamışdır. Hacı Soltan dövrün dəyişilməsindən istifadə edərək, bu nadir inciləri, ğəvvas dənizdən mirvari yığan kimi danə-danə yığıb bizim istifadəmizə vermişdir. Bu, Hacı Soltanın sözə olan sevgisindən, hüsn-rəğbətindən, şairlərə hörmətindən irəli gəlir.

Tərtibçinin digər kitablarında olduğu kimi burada da heç bir tərtib prinsipi gözlənilməmişdir. Nə əsrlər üzrə, nə bölgələr üzrə, nə vəsf obyekti üzrə, ümumiyyətlə, tərtibatda bir xaos nəzərə çarpır. Yaxşı olardı ki, Hacı Soltan bu nadir inciləri oxuculara müəyyən prinsipə riayət edərək müəyyən başlıqlar altında təqdim edəydi... Lakin bütün bunlara baxmayaraq, kitab ədəbiyyat tariximizə dəyərli töhfədir. Burada ədəbiyyat tariximizə düşməyən şairlərin əsərlərinə də çox rast gəlirik. Hacı Soltan min bir əziyyətlə bu əsərləri təkcə kitablardan deyil, həm də yaşlı insanların dilindən götürüb bir kitabda toplamışdır. Bu da Hacı Soltanın klassik şeirə həvəsindən, klassik şairlərə məhəbbətindən irəli gəlir. O, tanıdığı heç bir şairin kənarda qalmasını istəməmiş, hamısının tarixə düşməsini, yaşamasını istəmişdir ki, bunun üçün bu şairlər ona borcludurlar. Amma Hacı Soltan bu işləri görməyi özünə borc bilir. “Din elm imiş, biz bilmirmişik” adlı məqaləsində Hacı Soltanı həm bir din xadimi kimi, həm də klassik şeirin bilicisi kimi təqdim edən Akademik Tofiq Hacıyev  yazır: “...Hacı Soltanın ilk elmi söhbətini Şüvəlanda Hacı İntiqamın düzəltdiyi Füzuli məclisində eşitdim. O Füzulini bir şiə şairi kimi təhlil etdi. Az-çox Füzuli sənətindən başı çıxan adam kimi mən din xadiminin bu filoloji və fəlsəfi məzmunlu sohbətinə heyran qaldım” (sms.səh. 33).

Kitabın II fəslində laədri, yəni təxəllüsü bilinməyən şairlərin əsərləri verilmişdir. Burada əsasən qəsidələr yer alır.

Kitabın III fəslində müasir şairlərdən Əli Əkbər Ocaq Nəjad, Bəxtiyar Vahabzadə, Nəbi Xəzri, Hacı Əzim Məddah, Natiq Əbdülmanaf oğlu, Ənvər Nəzərli, Həkim Qəni, Şahin Fazil, Ələmdar Mahir, Arif Buzovnalı, Əliəsgər Vaygir, Hüseyn Kürdoğlu, Zəlimxan Ysaqub, Sona Xəyal, Zəki İslam, Yaşar Cahid, Kamil Sərbəndi, Kərəm Kürqıraxlı, Vüqar Nakam, Nazim Qail, Cavid Murtuzoğlu, Vahab Məhəmmədi, Aşıq Məhbub Xəlili, Nurəddin Dərafərin, Aşıq Əhməd Rüstəmov, Əsəd Hüseyni, Übeyd Rəcəb (tacik), Azər Cəbiyev, Axund Hacı Soltan kimi şairlərin şeirlərini oxuyuruq. Göründüyü kimi, Hacı Soltan təkcə klassikləri deyil, onlarla birlikdə müasir şairlərin də əsərlərini bu kitaba daxil etmişdir ki, bu, gələcəkdə onların da ədəbiyyat tarixində xatırlanmasını təmin edəcək, bu həm də Hacı Soltanın təkcə klassik deyil, eyni zamanda müasir ədəbiyyatla da maraqlandığını, müasir poeziyamıza da dəyər verdiyini göstərir. Hacı Soltan ədəbiyyatşünasların eləmədiyi işləri görür. Akademik Bəkir Nəbiyev "Ağıl yaşda deyil, başdadır" adlı məqaləsində yazır: "Müasir əhval-ruhiyyəli bir din xadimi olan Hacının istedadının bir cəhətinə mənim xüsusi rəğbətim vardır. Bu da onun yüksək bədii zövq sahibi kimi ədəbiyyatşünaslıq elmi sahəsində səmərəli çalışmalarıdır" (sms. səh. 37).

Kitabın sonunda Əli Dəvaninin "İslam hekayələri" (İran 1419-1999) kitabından "Əbədi işıq" adlı hekayə və Hacı Soltanın qızı Zeynəb Əliyevanın "Qəhrəman oğul" adlı məqaləsi verilmişdir.

Kitab haqqında yazını Mirzə Dahi Almaslının Axund Hacı Soltana ithaf etdiyi şeirlə bitiririk:

Ey könül sirdaşım ilk arzum budur,
Peyğəmbər duası səninlə olsun.
Əhli-beyt işığı, vilayət nuru,
Quranın ziyası səninlə olsun.

Yaşa göz dolusu, ürək dolusu,
Sıxılma həyatın çətinliyindən.
Açılsın üfüqlər qarşında bir-bir,
Ellər ibrət alsın mətinliyindən.

Saflıq çeşməsidir hər şirin sözün,
Hər yeni kitabın ürfan çəməni.
Uca duyğularla qol-boyun oldun,
Sən sözü sevdikcə, söz sevdi səni.

Sevgidən yoğrulub, qardaş, həyatın,
Üzündə, gözündə, sözündə sevgi.
Sevgi bayrağını var etdikcə sən,
Səni yox eylədi özündə sevgi.

Sevgidir ilhamın, sözün bulağı,
Daim bulaq başı məskənin olsun.
Çirkini çirkinə yazmış Tanrımız,
Bütün gözəlliklər qoy sənin olsun!

## 15.DUAYİ-HEYDƏRİ və ya HƏZRƏTİ-ƏLİ (ə) ZİRVƏSİNƏ BİR BAXIŞ

2002-ci ildə Hacı Soltanın "Duayi-Heydəri və ya Həzrəti-Əli (ə) zirvəsinə bir baxış" adlı on beşinci kitabı "Tural-Ə" NPM-də çap olunmuşdur. Kitabın annotasiyasında qeyd olunduğu kimi bu tədqiqatçının oxucularla on beşinci görüşüdür. Kitabın mətni latın və kiril əlifbalarında verilmişdir. Tərtibçi kitaba yazdığı ön sözü Həzrəti-Əlinin (ə) "Şəhvət köləliyindən çıxan şəxs azaddır" kəlamı ilə başlayır və yazır: "Bu kitabın ərsəyə gəlməsinə səbəb mərhum Ustad Dərviş Əlisöhbət İmamverdi oğlunun (1927-1989) 1980-ci ildə mənə təqdim etdiyi və bu vaxta qədər heç yerdə çap olunmamış, haqqında cüzvi məlumat olan "Heydəri" duasıdır. "Duayi-Heydəri" adlanıb İmam Həzrəti-Əli ibn Əbu Talib haqqında olan bu dualar ikidir. Mərhum Dərviş Əlisöhbətin dilinin əzbəri olan hər iki dua cəmiyyətimizdə az tanınmışdır. Səbəb 70 il ərzində xalqın imanını möhkəmləndirən, insanların öz dininə və tarixi şəxsiyyətlərinə bəslədikləri məhəbbətlərini daha da artıran belə duaların kafirlər tərəfindən qadağan edilməsi olub. Öz fəzilət və savablları baxımından "Kumeyl", "Təvəssül", "Əhd", "Nadi-Əli" dualarına bərabər tutulan "Duayi-Heydəri" əsrlərdən bəri məclislərin bəzəyi olmuş və gündəlik dua kimi qəbul edilmişdi. Lakin bu duanın, xüsusən, cümə günü oxunması daha vacibdir. Mərhum Dərviş Əlisöhbətin verdiyi məlumata görə, bu dua Azərbaycan hökmdarı Şah İsmayıl Xətainin sarayında hər cümə günü

xüsusi ayinləri yerinə yetirməklə oxunarmış. Bu duanı və İmam Əlinin (ə) bəzi fəzilətlərini çap etməyimizin daha bir gözəlliyi Həzrəti-Əli (ə) aşiqlərinə öz sevgilərini ifadə etmək imkanı verə bilməyimizdir" (səh.3-4). Sonra müəllifin Əli (ə) haqqında şeiri verilmişdir.

Kitaba ardıcıl olaraq daxil edilmiş "Dua haqqında", "Duanın qəbul olunması şərtləri", hər iki duanın ərəb dilində və ərəb əlifbasında mətni, "Duanın faydaları", hər iki duanın transkripsiyası və Azərbaycan dilində ixtisarla tərcüməsi, "Nadi-Əli" duasının transkripsiyası və Azərbaycan dilində tərcüməsi, duanın fəzilətləri, Həzrəti-Əlinin namazın qünutunda oxuduğu duanın transkripsiyası, "Duayi-Əli" və onun tərcüməsi, "Təvəssül" duasından bir parça və onun tərcüməsi, Həzrəti-Əlinin (ə) Ramazandan sonra fitr bayramında oxuduğu xütbələrin transkripsiyası və tərcüməsi, "Əmirəl-möminin Əlinin (ə) ziyarətinin fəziləti", Əlıinin (ə) doğulduğu yerdə oxunan dua, qəbrinin ziyarəti zamanı oxunan duanın transkripsiyası və tərcüməsi, "Əmirəl-möminin Əlinin (ə) salavatı"nın transkripsiyası və tərcüməsi, "Əlinin (ə) hirzi", "Həzrəti-Əlini (ə) yuxuda görmək", "Həzrəti-Əlinin (ə) cümə günü namazı, "Əlinin (ə) ziyarətnaməsi, "Həzrəti-Əlinin (ə) Peyğəmbərə (s) salavatının transkripsiyası və tərcüməsi, "Hirzi-Həzrəti-Əli (ə)", "Fəyyaz duası"nın transkripsiyası və tərcüməsi doğrudan da Əli (ə) aşiqləri üçün dəyərli töhfələrdir.

Həzrəti-Əli qədəmgahında mənim müəllimim olmuş, olduqca savadlı, imanlı, təqvalı din xadimi kimi tanıdığım Hacı Vasif Şeyx Arif oğlu "Əli (ə) şairi və Əlişünas alim" adlı

məqaləsində yazır: “Axund Hacı Soltan ağa bir din xadimi kimi, həmçinin bir əhli-beyt şairi kimi də nəinki Azərbaycanda, hətta respublikamızın hüdudlarından kənarda da tanınıb sevilmişdir. Əsərlərinin ən əsas mövzusu İmam Əli (ə) olmuşdur. Daha dəqiq desək, o əksər hallarda Əli (ə) şairi və Əlişünas bir tədqiqatçı kimi təqdim olunur. Yəqin ki, Hacının çoxsaylı kitabları haqda digər müəlliflər söhbətlər açacaq və öz məqalələrində müəyyən şərhlər aparacaqlar…” (sms.səh.28).

Hacı Soltanın kitaba daxil etdiyi “Qədiri-Xümm” adlı məqaləsi Həzrəti-Əlinin (ə) “Başqasına qul olma, Allah-təala səni azad yaratmışdır” hədisi ilə başlayır. Burada Peyğəmbərin (s) sonuncu həcc ziyarətindən qayıdarkən Cənabi-Cəbrailin (ə) ona Allahın əmri ilə enərək, “Maidə” surəsinin 67-ci ayəsini nazil etməsindən, namaz vaxtı Peyğəmbərin (s) xütbəsindən, Əlini (ə) öz yerinə xəlifə təyin etməsindən, hamının Əlini (ə) təbrik etməsindən bəhs edərək, hər il zilhiccə ayının 18-dən 25-ə kimi bir həftəni müsəlmanların bu günü bayram etməsini diqqətə çatdırır və hamını təbrik edir.

Hacı Soltan kitabda Həzrəti-Əlinin (ə) yeddi fəzilətini qeyd edir və onları Peyğəmbərimizin (s) hədisləri ilə möhkəmləndirir:

1.Səmavi evlənmək, yəni Allahın əmri ilə Əlinin Fatimə ilə evləndirilməsi;

2.Xilafət rütbəsi, yəni Əlinin (ə) xəlifə olması;

3.Üzüklə sədəqə vermək, yəni Əlinin (ə) məsciddə namaz qılarkən, heç kəsin saymadığı dilənçiyə işarə ilə üzüyünü verməsi;

4.Xalça hədisi, yəni Peyğəmbərin (s), Əlinin (ə), Ənəs ibn Malikin xalça ilə uçaraq “Əshabi-Kəhv”in məqamına getmələri;

5.Qardaşlıq, yəni “Hücurat” surəsinin 10-cu ayəsi “Yalnız möminlər qardaşdırlar” nazil olduqda, Peyğəmbərin (s) ənsarla mühacirlər arasında qardaşlıq yaratdıqdan sonra, Əlini (ə) özünə qardaş etməsi;

6.Mübahilə ayəsi, yəni “Ali-İmran” surəsinin 61-ci ayəsinin nazil olması, Əhli-beytin (ə.m.) mübahiləyə getməsi, xristianların qorxuya düşüb geri çəkilmələri. Peyğəmbərin (s) “Əli mənə nisbətdə mənim özüm kimidir” hədisi;

7.”Dəhr” surəsinin nazil olması, yəni Həsən və Hüseyn xəstələnəndə Əlinin (ə) və Fatimənin (s.ə) onların şəfa tapması üçün üç gün oruc tutmaları, iftar vaxtı fəqir, əsir və yetimin qapıya gəlmələri, onların öz yeməklərini verib, su ilə iftar etmələri Allahın xoşuna gəlmiş və “Dəhr” surəsinin səkkizinci ayəsini nazil etmişdir: “Onlar öz iştahları çəkdiyi, özləri yemək istədikləri halda yeməyi (Allah) rizası qazanmaq üçün yoxsula, yetimə və əsirə yedirərlər”.

Hacı Aydın Nəsiri “O yaşayır yaşatmaq üçün” adlı məqaləsində yazır: “Axund Hacı Soltan İmam Əli (ə) xəttində olan təriqət məstanı və o şahın müştaqlarındandır. O, qüvvətli hala və ali himmətə malikdir. Hacı Soltan həmişə ariflər və sufilər xanəgahına xüsusi nəzərlərlə tamaşa etmiş, qəlbinin məhbub və məşuqunu və həqiqəti “ənəlhəq”də müşahidə edib onun gözəllik hisslərindən ilhamlanıb maye götürərək şeirlərində əks etdirmişdir” (sms. səh 118-119).

Kitabda Seyyid Əzim Şirvaninin şeirlərindən sonra Əli (ə) ilə bağlı "Digər hədislər", "Quran tapşırmanın hikməti", "Qədir gecəsinin bir hikməti" və bəni-üməyyənin hakimiyyət dövrü, Malik Əştər haqqında yazılar verilmişdir. Bütün bunlar İslam dininin tarixini öyrənmək istəyənlər üçün dəyərli yazılardır.

Hacı Soltan kitabda "Hədisi-qüdsi"dən əhli-sünnənin imamətlə bağlı 503, 505, 508, 513, 516, 518, 520, 521, 524 və 528-ci hədisləri də verilmişdir. Sonra Əli (ə) ilə bağlı söhbətlər, Əlinin (ə) mənzum nəsihətləri, onun "Divanından bir neçə cümlə" diqqətə çatdırılmış, kitaba digər dualar da daxil edilmişdir.

Burada "Həzrəti-Əlinin (ə) möcüzələri"nə də yer ayrılmışdır. Burada Novruz ilə bağlı maraqlı yazı da diqqəti çəkir. Filologiya elmləri doktoru, Xalq yyazıçısı Əzizə Cəfərzadə "İslam mədəniyyətinin carçısı" adlı məqaləsində yazır: "... Məni ilk tanışlıq aylarımızda maraqlandıran bu oldu ki, daha doğrusu heyrətə gətirən bu oldu ki, mən Hacı Soltanla münasibətlərimizdə, onunla rəsmi görüşlərdə, adi həyati üz-üzə görüşlərdə özümü təkcə din xadimi ilə deyil, həm də geniş dünyagörüşünə malik bir ədəbiyyatçı, alim, tədqiqatçı, ədəbiyyat tariximizin bilicilərindən biri ilə qarşılaşmış gördüm" (sms. səh 29-30).

Sonda Hacı Soltanın şeirləri və xatirə şəkilləri verilmişdir.

Yazımızı Zülfüqar Həbibinin Hacı Soltana həsr etdiyi bir qəzəl ilə yekunlaşdırırıq:

Ey adına layiq gözəl insan, Hacı Soltan,
İzzətli, ləyaqətli müsəlman, Hacı Soltan.

Zinət verib Allah səni bu Badkubəyə,
Hər türlü gözəlliklərə şayan Hacı Soltan.

Öz namını məşhur elədin sadəliyinlə,
Bu hüsnünə şahiddi bu dövran, Hacı Soltan.

Əxlaqü ədəbdən sənə bol-bol verib Allah,
Xoş halına, ey sahibi-iman, Hacı Soltan.

Keçmiş bütün ömrün həmi məsciddə sərasər,
Əhsən sənə, ey talibi-Quran, Hacı Soltan.

Rəbbim səni hifz eyləsin hər türlü bəladan,
**Mövla nökəri**, aşiqi-Yəzdan Hacı Soltan.

Əlbəttə ki, məmnundu bu dostluqdan Həbibi,
Şe'rim belə qalmış sənə heyran, Hacı Soltan.

# 16.ALLAH EŞQİ, İNSAN EŞQİ, SÖZ EŞQİ

Hacı Soltanın on altıncı kitabı “Allah eşqi, insan eşqi, söz eşqi” adlanır. Kitab 2003-zü ildə “Ozan” nəşriyyatında dərc edilmişdir. Müəllif kitabı anası Əzizə Mahmud qızının ruhuna ithaf etmişdir. Kitabın redaktoru Arif Əşrəf Buzovnalıdır. Şair Ənvər Nəzərli kitaba “Ziyalı, din xadimi, tədqiqatçı, şair” adlı ön söz yazmışdır. Məqalədə Hacı Soltanı gəncliyindən tanıdığını bildirən müəllif, onunla bağlı görüşlərindən, Buzovna kəndində keçirən təziyə məclisindən, Hacı Soltanın natiqliyindən, dini savadından, klassik şeiri bilməsindən, illər keçdikcə onunla əlaqələrinin genişlənməsindən, dostluq münasibətindən  bəhs edir. Ənvər Nəzərli Hacı Soltanın ilk kitablarından söz açaraq, onu bir tədqiqatçı kimi təqdim etməyə çalışır və yazır: “Hacı Soltan həm də şairdir. İlahi eşq ilə yaşayan, yazıb-yaradan şair Hacı Soltan ətrafında baş verən hadisələrə, xalqa nümunə olan şəxsiyyətlərə, onların fəaliyyətinə biganə qalmır, öz münasibətini bildirir, şeirlər həsr edir. Onun “Divan”ı buna əyani sübutdur.

Möhtərəm oxucular. Axund Hacı Soltanın əlinizdə tutduğunuz növbəti kitabı da İslam dininə, xalqa və vətənə məhəbbət və xidmətin bariz nümunəsidir. Mən bu yığcam müqəddimədə kitabın məziyyətləri barəsində danışmır, ona qiymət verməyi sizin öhdənizə buraxıram” (səh. 6).

Hacı Soltanın kitabı anasına ithaf olunduğu kimi, kitabda gedən ilk şeir də “Ay ana” adlı qəzəldir. Anasını vaxtsız itirən, indisə analı xatirələrlə yaşayan şair yazır:

Əfsus, əfsus ki, səni vaxtsız itirdim, ay ana,
Səni son mənzilə çiynimdə ötürdüm, ay ana.

Körpə vaxtı necə ağuşə alardın məni sən,
Elə də həsrəti ağuşə gətirdim, ay ana.

Varlığında ürəyin şərbət içirdərdi mənə,
Yoxluğunda əlimə zəhri götürdüm, ay ana.

Şad idim, səndən alıb güc, yaşayırdım xoşbəxt,
Sənsiz ömrü elə bil, başə yetirdim, ay ana.

Yazdı eşqim kitabında neçə min xətt mehrin,
Yoxsa bu babdə mən bircə sətirdim, ay ana.

Ananın yoxlığu insanı edirmiş vaqif,
Bu həyat məktəbini indi bitirdim, ay ana.

Soltanın nitqinə əzbərdi bu söz ömrü boyu:
Əfsus, əfsus ki, səni vaxtsız itirdim, ay ana!

Kitab iki hissədən ibarətdir. I hissənin I fəslində "Müxtəlif şeirlər" verilmişdir. "Münacat", "Məhəmməd (s)", "Könlümdə Əlidir", "Əli", "Əlidir", "Qəsidə-tilavət", "Peyğəmbər nəsli", "Əbdülmüttəlib", "İmam Həzrəti-Əlinin oğulları", "Əbu Talibin", "Həmzeyi-Seyyidüş-şühəda", "Üveys Qərən olsun", "Bilal", "Həzrəti-Salman", "Qəmbər", "Əbazər", "Malik Əjdər", "Müslim ibn Əqil", "Qeysi-Müsəhhər", "Muxtar ibn Məsud", "Xanım Xədicə", "Əli qızı Zeynəb", "Hicab",

“Həzrəti-Abbas Cəngi”, “Sev” adlı şeirlərdə Əhli-beyti, səhabələri vəsf eləyən müəllif, oxucunun gözləri qarşısında bir-bir müqəddəs insanların portretini çanlandırır. Hər şeirdə Hacı Soltanın islami dəyərlərə, müqəddəs şəxsiyyətlərə olan dərin sevgisini və hüsn-rəğbətini görürük.

Məsumlardan, övliyadan sonra Hacı Soltanın Vətənlə, xalqla bağlı şeirləri gəlir. Kitaba daxil edilmiş “Qəhrəmanlıq nəğməsi”, “Qəhrəmanlıq tarixi”, “Vətən şərqisi”, “Qarabağdır”, “Xocalı faciəsi”, “31 mart azərbaycanlıların soyqırımı günüdür”, Qarabağın azadlığı uğrunda gedən döyüşlərdə şəhid olmuş Buzovna igidlərinin xatirəsinə həsr olunmuş “Şəhidlik nümunədir”, “Azərbaycan əsgəri”, “Qan ağlayır əşarımız”, “Həsrət şərqisi”, “Vətən”, “Şəhidlik”, “Vətən olsun”, “İslamımızın”, “1937-ci il repressiya qurbanlarına”, “Apardı”, “20 yanvar”, “20 yanvarın 13-cü ildönümünə”, “Şəhid alimlərimiz”, “Abidəsiz tariximiz”, İbrət dərsi”, “Azərbaycan xalq cümhuriyyətinin banilərinə”, “Var igidlərin adı”, Təbriz”, “Bakı” və s. şeirlərində şairin vətənə, xalqa məhəbbətinin, millət, torpaq təəssübkeşliyinin obrazlı təqdimini görürük. Hacı Soltanın yazılarında olduğu kimi, məclislərdəki çıxışlarında da bu sevgisini, rəğbətini görürük. Onun od-alovlu nitqində, qəlbinin dərinliyindən süzülüb gələn səmimi hisslər insanları heyrətə gətirir. Akademik Ziyad Səmədzadə “Möminlik insanlığın tacıdır” adlı məqaləsində Hacı Soltanın dini, elmi və ədəbi fəliyyətindən söz açaraq yazır: “Şübhə yoxdur ki, Abşeronun ab-havası, İslam ənənələrini daim uca tutan Bakı kəndlərində poeziya və muğam gecələri, təziyə məclisləri, müdrik ağsaqqallarla görüş bu yaradıcı insana

öz müsbət təsirini göstərmişdir.

Bir faktı da qeyd edim ki, söz-söhbətləri ilə məclislərin yaraşığı olan Hacı Soltan öz yaradıcılığında vətəni daim tərənnüm edir, dinin özünəməxsus xüsusiyyətlərinə, məntiqinə, psixoloji gücünə xüsusi həssaslıqla yanaşır. Hacı Soltanda həm yüksək möminlik, həm də gözəl insani cəhətlər var. Bu cəhətlər onun dostlarının, yaxınlarının, ümumiyyətlə, onunla təmasda olan insanların ona böyük hörmətlə yanaşmasına zəmin yaradır" (sms. səh. 45).

Kitabda gedən "Yükü", "Hikməti təbliğ", "Novruz bayramı", "Söz", "Təvazö", "Əməl", "Kitab", "Ədəb", "Həkim", "Nəsihət" və s. bu kimi şeirlərdə ədəbi-əxlaqi dəyərlərimiz obrazlı şəkildə işıqlandırılmışdır.

Müəllifin "Namaz", "Qədr gecəsi", "Ruzi-ehya", "Merac", "Qurban bayramı", "Məbəs bayramı", "Qədir-Xum" bayramı" və s. dini-ürfani şeirlərdə, eləcə də Kərbəla faciəsini əks etdirən növhələrdə İslami dəyərlərimiz öz məzmunlu, obrazlı əksini tapmışdır.

Hacı Soltanın bu kitabında klassik şeirimizin bir sıra janrlarında qələmə alınmış əsərlər toplanmışdır ki, bu da şairin istedadının göstəricisi kimi qiymətlidir. Bunlardan "Qəzəlimüəmma", "Müsəbbə", "Müsəddəs", Müsəmmən", "Tərkibbənd", "Saqinamə", "Vücudnamə", "Bahariyyə" və s. göstərmək olar. Hacı Soltan bir çox klassik şairlərin əsərlərini təxmis etmiş, bəzi əsərlərə nəzirələr yazmışdır ki, onlar da kitabda yer alır. Xalq şairi Zəlimxan Yaqub "Haqqın işığında döyünən ürək" adlı məqaləsində yazır: "Nizamidən başlamış günümüzə kimi nə qədər xalq sevgisi, məhəbbəti qazanmış

şəxsiyyətlər, əhli-ürfan varsa, onların heç biri Hacı Soltanın diqqətindən yayınmayıb. Bu qiymətli cəhət də onu elin-obanın, az qala alimlər ordusunun sevimlisinə çevirib.

Hansı mövzuya əl atıbsa Hacı Soltan, orada bir dünya yaradıb, açılmamış səhifələr açıb, görünməmiş qatları görüb, çox qaranlıq sirlərə aydınlıq gətirib, endikcə enib, ucaldıqca ucalıb, mədəniyyət tariximizə bir-birindən qiymətli əsərlər verib. Sevməsən sevilməzsən! Nizamini, Füzulini, Nəsimini, Xətaini - İslamın, Şərqin fikir bahadırlarını özündən çox sevən bir qələm əhlini sevmək ulu Tanrının, Qadir Allahın yaratdığı bütün varlığı, kainatı sevməkdir” (sms.səh. 41).

Kitaba müxtəlif sənətkarlara, alimlərə, dostlara ithaf olunmuş şeirlər də daxil edilmişdir. Sonda “Xətai ilə üz-üzə” poeması və “Hacı İsgəndər pyesi də verilmişdir.

Yazımızı Nüşabə Məmmədovanın Hacı Soltana ithaf etdiyi “Soltanı gördüm” rədifli şeiri ilə yekunlaşdırırıq:

“Dünya pəncərədir” deyib bilənlər,
Nə çoxdur iz qoyub, baxıb keçənlər.
Alimlər, şairlər, şahlar, ərənlər,
Məsumlar içində Soltanı gördüm.

Çoxdur gördüklərim,oxuduqlarım,
Heyran olduqlarım, tanıdıqlarım.
Adını hörmətlə sanadıqlarım
İmzalar içində Soltanı gördüm.

Batində gizlənmiş incidir saf söz,
Ləldir, sədəfdir, mərcandır saf söz.
Dənizdir, dəryadır, ümmandır saf söz,
Qəvvaslar içində Soltanı gördüm.

Bəzən öyrənəndir, bəzən öyrədən,
İmanı Qurandır, sevgisi Vətən.
Hərzə danışmasın hər yoldan ötən,
Ustadlar içində Soltanı gördüm.

Həmi Kərbəlayi, həm də Hacıdır,
İmamlar başının zəfər tacıdır.
Nüşabə Soltana kiçik bacıdır,
Doğmalar içində Soltanı gördüm.

03.10.2008.

# 17.MƏHƏMMƏD ƏMİN RƏSULZADƏ VƏ İSLAM

Hacı Soltanın "Məhəmməd Əmin Rəsulzadə və İslam" adlı on yeddinci kitabı 2003-cü ildə "ADMİU"-nun mətbəəsində nəşr olunmuşdur. Kitabın redaktoru Arif Əşrəf Buzovnalıdır. Kitab Məhəmməd Əmin Rəsulzadənin "İqbal" qəzetindəki məqaləsindən bir parça ilə açılır: "Yadımdadır, məscidə çox gedərdim. Namaz mənə şər'ən vacib olmadığı zamanda belə bir çox qəza namazları keçən ağsaqqalların etmədiyi ibadətlərin icrasına həvəsli idim. Ramazan gecələrində məscidə gedir, sübh açılana kimi namaz qılardım – gecə namazı. Ən çox həzz aldığım yer məscid idi. Bir zamanlar məktəbə, sonra mətbəəyə nə kimi bir həvəslə gediyordımsə, o vaxt məscidə də öylə bir həvəslə gediyordım. Məsciddə qazanılacaq savabların hamısına məzhər olmaq da müntəhayi-amalım idi" (səh. 3).

Yazının altında Hacı Soltanın bu dördlüyü verilmişdir:

Bu xalqın tarixi, bilmə, sadədir,
Qolu gah qandallı, gah azadədir.
"Bir kərə yüksələn üçrəngli bayraq
Daha enməz!" – deyən Rəsulzadədir.

Hacı Soltan "Məhəmməd Əmin Rəsulzadə və İslam" adlı əsərini M.Ə.Rəsulzadənin "Dəvət" dərgisindən "Ya Rəbb" adlı şeiri ilə başlayır, sonra yazır: "Bu dünya dinlər üzərində qurulmuş bir dünyadır. Ta qədimdən bu günə qədər bütün

ictimai, siyasi və sosial quruluşlar bu və ya digər şəkildə öz bünövrələrini ya dini motivlər üzərində qurmuş, ya da sırf dini quruluşda fəaliyyət göstərmişlər. Dinin böyüklüyü bəzən o həddə qədər yüksəlmişdir ki, bəzi dövrlərdə dindən mənfi əməlləri törətmək fikrilə də istifadə etmişlər. Buna baxmayaraq, dünyada mövcud olan əsas dinlər sülhün, barışığın, əxlaqın, qısası, insanda bütün müsbət keyfiyyətlərin bütövləşməsinin carçısı və təbliğatçısı olmuşdur. Allah-təalanın insanlara bəxş etdiyi ən böyük töhfə isə İslam dinidir. Bu din, sonuncu böyük din olmağı ilə bərabər Allahın insanlara verdiyi ən kamil dindir". Müəllif əsərdə Qurani-Kərimdən, Məhəmməd (s) peyğəmbərdən, Həzrəti-Əlidən (ə) söz açmış, islami dəyərlərin bəşəriyyətə verdiyi faydaları diqqətə çatdırmışdır. Tarix boyu böyük hökmdarların, dövlət başçılarının islami dəyərləri qoruduğunu, idarəçilikdə onlardan istifadə etdiyini xüsusi vurğulayan tədqiqatçı islami əsasların təkcə Şərqdə deyil, Qərbdə də öyrənildiyini, hətta tədris edildiyi, "Qərbdə böyük bir islamşünaslar ordusu yaranmışdır" qənaətini bildirir. Sonra XX əsrin yeni ab-havasından bəhs açır və bu ab-havanın Azərbaycanda yaratdığı vəziyyəti təhlilə çəkir, onun bir müsəlman ölkəsi və Şərqə açılan qapı kimi diqqət mərkəsində olduğunu, belə bir zamanda  Azərbaycanın bütövlüyünün, milli mənafeyinin qorunması məsələsinin zəruriliyini qeyd edir və yazır: "Bu məsələni dərindən düşünən Azərbaycan mütəfəkkirlərindən biri və öncülü Məhəmməd Əmin Rəsulzadə idi" (səh.10).

Hacı Soltan Şərqdə ilk Azərbaycan Cümhuriyyətinin yaradıcısı olan Məhəmməd Əmin Axund Hacı Əliəkbər oğlu

Rəsulzadəni istedadlı alim, şair kimi təqdim edir, onun qəzet və dərgilərdə çap olunmuş məqalələrindən, şeirlərindən sitatlar verərək, onu bir islamşünas kimi araşdırır. Kitabda

Aç qulağın, bir eşit bu sözləri, ey bilfüzul,
Elmə rağib olginən, qafildilər küllən cühul.
Hər nə var dünyada bil ki, elmilən olmuş hüsul,
Fəzli-elmi bilgilən şər'ilə olmuşdur qəbul.
Olmasın qafil xəlayiq eyləyib Quran nüzul.

Bu təriqətdə nə qədri çəkdi zəhmət Müstəfa,
Söylədi əl-elmi-elmani və fis-sin bərməla...

(səh.12)

deyən Rəsulzadənin Quranla, Məhəmməd (s) peyğəmbərlə, Həzrəti-Əli (ə) ilə, onların hədisləri ilə, "Nəhcül-bəlağə" ilə bağlı dövri mətbuatda çap olunmuş dəyərli fikirlərini oxuculara çatdıran müəllif, 71 il ömür sürən bu mütəfəkkir insanın bənzərsiz xarakterini, elmi dünyagörüşünü açıqlayır.

Rəsulzadənin "Həzrəti-Əli (ə) şəxsiyyətini ideal insan kimi səciyyələndirən" bu şeirinə

Ey olan aşiq Əli övladınə,
Bir qulaq ver sən Əli fəryadınə.
Kim o sərvər söyləyir bu nəğməni:
"Alim həyyü cahilin yoxdur cani".

(səh.17)

müraciət edən müəllif onun "öz elmi, bədii, siyasi irsində İslama və xüsusən də Əli (ə) şəxsiyyətinə daha çox söykəndiyini" diqqətə çatdırır. Bu kitab işıq üzü gördüyü zamanda insanların, xüsusən gənclərin savadını, biliyini artırmaq üçün dəyərli vəsaitlərdən biri olmuşdur. Elmira Rəhimova "İnamlı və imanlı insan" adlı məqaləsində yazır: "Mən tarix müəllimiyəm. Çalışıram ki, mövzusundan asılı olmayaraq dərslərimi vətənpərvərlik, əxlaq, milli, elmi, vətəndaşlıq tərbiyəsi üzərində qurum. Bu zaman bəzi mənbələrə müraciət etməli oluram. Əlimin altında olan əsas mənbələrdən biri də Hacı Soltanın çoxsaylı kitablarıdır. Onun "Şah İsmayıl Xətai", "Məhəmmədəmin Rəsulzadə və İslam", "İslam idman antologiyası", "Azərbaycan dərvişləri və rövzəxanları", din, əxlaq və s. haqqında yazdığı kitablar müxtəlif mövzuların tədrisində köməyimə gəlir" (sms. səh. 115).

Əsərdə müxtəlif tarixi hadisələrin şərhinin, müxtəlif tarixi şəxsiyyətlərin fikirlərinin səsləndirildiyinin şahidi oluruq. Hiss olunur ki, Hacı Soltan bu əsəri yazmaq üçün təkcə M.Ə.Rəsulzadənin həyat və yaradıcılığını, ədəbi və siyasi fəaliyyətini deyil, onunla bağlı tarixi şəxsiyyətlərin də həyat yolunu araşdırmış və oxuculara yeni söz deməyə çalışmışdır.

Hacı Soltan Rəsulzadənin islami mərasimlərə də diqqət etdiyini, Peyğəmbərimizin, imamlarımızın mövlud və şəhadət günlərinin qeyd olunmasında maraqlı olduğunu da xüsusi vurğulayır və yazır: "Rəsulzadə "Məbəs"lə yanaşı "Mövludi-Əli", "Eydi-fitr", "Novruz" və s. bayramların vacib olduğunu qeyd edir və buna məslək işi kimi baxır. Rəsulzadə İslamın müqəddəs bayramı olan "Qurban bayramı"nı etiqadın və

inamın bayramı kimi səciyyələndirir, onu digər bayramlardan ayırır və üstün tutur" (səh.31).

Əsərdə Rəsulzadənin bir sıra Azərbaycan ziyalıları, o cümlədən Nəriman Nərimanov, Mirzə Fətəli Axundov, Hacı Zeynəlabidin Tağıyev və başqaları haqqında dəyərli fikirlərindən də sitatlara yer verilmiş, Rəsulzadənin ziyalılara olan hərarətli münasibəti dəyərləndirilmişdir.

"Yaşıl qələm" cəmiyyətinin fəaliyyətinə də toxunan müəllif yazır: "Rəsulzadə və silahdaşlarının fəaliyyəti "Yaşıl qələm"də də ciddi şəkil almışdı. Bu ədəbi cəmiyyət İslam və istiqlal, Azərbaycan xalqının milli mənəvi intibahı məsələlərinə aydınlıq gətirərək ədəbi axtarışların istiqamətini aydınlaşdırırdı". Tədqiqatçı Müsavat partiyasının binasında keçirilən iclasda iştirak edən 48 ədib və mühərririn, 34 şairin adlar göstəricisini də burada oxuculara çatdırmışdır. Kitab haqqında "İqtisadiyyat" qəzeti redaksiyasının "Allaha yaxın olanda" adlı yazısında oxuyuruq: "...Axund Hacı Soltan həm çox səriştəli tədqiqatçıdır, həm də onun əsərləri kütləvilikdən əlavə, elmi siqlətli əsərlərdir. "Məhəmməd Əmin Rəsulzadə və İslam" kitabı da hörmətli müəllifin elmi axtarışlarının uğurlu nəticəsidir. Kitab qarşıya qoyulmuş mövzunun etibarlı əksidir. Hiss olunur ki, müəllif Məhəmməd Əmin Rəsulzadə haqqında söz demək üçün başqalarının görmədiyi (bəlkə də çox əhəmiyyət vermədiyi) mövzunu araşdırmış, oxuculara müsavat başqanının ömür dünyasından çox nadir səhifələri göstərə bilmişdir. Axund Hacı Soltan yeni əsərini Məhəmməd Əminə məhəbbət və ehtiramla yazmış, danılmaz faktlar və sənədlərlə göstərmişdir ki, xalqa xidmət Allah yolundan,

Haqq dərgahından keçməlidir. Belə olduqda, insanın inamı da, əqidəsi də saf və möhkəm olur" (sms. səh. 292).

Hacı Soltan imkan daxilində Rəsulzadənin islamla bağlı bütün məqalələrini təhlilə cəlb etmişdir. Bəzən hətta müxtəlif məsələlərdən bəhs redən məqalənin dinlə bağlı hissələrini belə nəzərdən qaçırmamışdır. Rəsulzadənin Kərbəla faciəsi ilə bağlı fikirləri daha diqqətəşayandır. Müəllif onun İmam Hüseyn (ə), ümumilikdə bu faciə ilə bağlı bir sıra yazılarını araşdırmış, dərin, tərbiyəvi fikirlərini bir neçə yerdə sitat verərək, öz qənaətini açıqlamışdır. Tədqiqatçı "Rəsulzadə, yeri düşdükcə, Kərbəla hadisələrinə toxunur və Həzrəti-Hüseyn ibn Əliyə (ə) məqamı gəldikcə öz məhəbbətini bildirir" yazır və sonra "İqbal" qəzetindəki məqalədən sitatlar verir. Həmin sitatlardan birini oxucuların diqqətinə çatdırırıq: "Əqidə, amal və məsləki yolunda ölümünə razı olub nəfsini fəda edən kim olursa-olsun, böyükdür. Və bu böyüklük təqlidəşayan və təhsinə müstəhəqdir!

Aşura günü bizə böylə bir əxlaq tərbiyəsi vermək iqtidar və səlahiyyətində ikən eyvah ki, biz onu başqa dürlü qandıq, hər şeydə olduğu kimi burada da narəftə bir yola düşdük. Hüseyn əleyhissəlam inandığı və etiqad elədiyi fikri üstündə ölməyincə özünün əbədi bir rəhmətə nail ola bilməyəcəyini göstərmiş ikən, biz "mən-mənə, o-ona, o - o yana" timsalından dörd əlli yapışıb səadətdarını üç-dörd qətrə göz yaşı müqabilində veriləcək qədər ucuz bir şey sandıq" (səh. 70). Rəsulzadənin bu fikrini təhlil edən Hacı Soltan "Rəsulzadə "üç-dörd qətrə" göz yaşı deməklə İmam Hüseyni (ə) yalnız ağlamaqla yad edib əməldə onu təkrar etməyə cəhd etmə-

yənləri, hidayətdən kənar olanları nəzərdə tutur və əməllə İmama edilən xidməti İslama edilmiş xidmət hesab edir" (səh. 71) qənaətinə gəlir.

Hacı Soltan əsəri Əhməd Cavadın "Bismillah" rədifli qoşması ilə yekunlaşdırır və bunu "İslamın tərəqqisi uğrunda bundan belə görəcəyi işlərə çağırış və təməl" hesab edir.

Əsərin sonunda zəngin ədəbiyyat siyahısı verilmişdir.

Kitaba "Unudulmuş qəhrəman" adlı əsər və Hacı Soltanın şeirləri də daxil edilmişdir.

Yazımızı Hacı Arif Buzovnalının Hacı Soltandan etdiyi təxmisi ilə tamamlayırıq:

Ey özün bəndə sayan, neməti-ifnadan keç,
Elmi-eşq istəsən əvvəl bu əlifbadan keç.
Mənəviyyata bəzək vur, zərü zibadan keç,
"Gər Əli aşiqisən, cümlə bu dünyadan keç,
Tut Əli damənini, müshəfi-dəryadan keç".

Həq kəlamdır, Əlinin eşqinə xəlq oldu həyat,
Sən də cəhd et nə yaratsan, onun eşqilə yarat.
Vaqif ol aliliyin sirrinə, kamilliyə çat,
"Əhli-İslamə yəqin babi-Əlidəndi nicat,
Özgə bir kəsdə səxa yoxdu, bu xülyadan keç".

Şeyx Əli, şah Əli, şafi Əli, şakir Əlidir,
Qeyb Əli, var Əli, batin Əli, zahir Əlidir.
Qəhr Əli, mehr Əli, qabil Əli, qadir Əlidir,
"Yer Əli, göy Əli, əvvəl Əli, axır Əlidir,
Sözü duymaqdan ötür mənbeyi-mənadan keç".

Xabi-qəflətdə nə yatmaqdı bu, ey qafil, oyan,
Görməyirsənmi fəlakətlə dolub cümlə cahan.
Özgə bir hal ilə xoşbəxtliyinə yoxdu güman,
“Əli eşqilə dönür yazə ömür fəsli-xəzan,
Uyma hüsnə, xəzan istə, güli-rənadan keç”.

Özün inkar eləyər kim onu etsə inkar,
İki aləmdə xəcalətdə qalar çar-nacar.
Əlisiz olmaz ibadət də qəbul, ey dindar,
“Gecə-gündüz Əli zikrin elə, ta halın var,
Amma cəhd eylə nə gerçək, nə də röyadan keç”.

Arifin qəsdi bu mövzuda nə dərsdir, nə bilik,
Özünü tut kiçik, amma sözünü bilmə kiçik.
Qeyri-mümkündü simü zərlə müəbbəd dirilik,
“Soltanın dürrünə istərsən əgər müştərilik,
Sənə dünya yetirən ləli-müsəffadən keç”.

# 18.HƏZRƏTİ-ƏLİ (ə) KİMDİR

Hacı Soltanın növbəti kitabı "Həzrəti-Əli (ə) kimdir" adlanır. Kitab 2004-cü ildə "Tural" NPM-də çap edilmişdir. Kitabın redaktoru Leyla Nazimqızıdır. Kitabın annotasiyasında oxuyuruq: "Həzrəti-Əli (ə) kimdir" kitabı Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadənin İslam dininə sevgi bəsləyən, mənəvi paklığı uca tutan, ulu adət-ənənələrimizi yaşadan dəyərli və qədirbilən oxucular ilə on səkkizinci görüşüdür".

Hacı Soltanın Həzrəti-Əli (ə) ilə bağlı bir neçə kitabı vardır. Bu kitablar dindarların, Əli (ə) aşiqlərinin stolüstü kitablarıdır. Çoxları bu kitabları əldə etmək istəyir. Şair Kərəm Kürqıraxlı "Hacı Soltan şəxsiyyətinə və ziyalılığına vurğunluğum" adlı məqaləsində yazır: "...Mən o kitabların bir neçəsini oxumuşam və hələ onda rayonda, ucqar bir kənddə yaşayırdım. Bizim kəndimizdə və qonşu kəndlərdə olan dindarların bu kitablardan xəbəri vardı. Onlar hamısı növbə ilə o kitabları dönə-dönə oxuyurdular. Hətta 80-90 yaşında olan mömin dindarlar indi də Hacıyla nə vaxtsa görüşüb onu ziyarət etmək arzusuyla yaşayırlar" (sms. səh. 123-24).

Kitab "Nəhcül-bəlağə"dən sitatla və Hacı Soltanın "Həzrəti-Əli (ə) kimdir" adlı bəhri-təvili ilə başlayır. Bu, müəllifin ən gözəl əsərlərindən biridir. Qazi Axund Hacı Əhməd Şeyx Qüdrət oğlu "Gözəl insan, alicənab ruhani" adlı məqaləsində Hacı Soltanın dini fəaliyyətindən bəhs edərkən onun yaradıcılığına da toxunaraq yazır: "Axund Hacı Soltan gözəl insan və alicənab bir ruhanidir. O, müxtəlif mövzuları

əhatə edən çoxlu kitabların müəllifidir. Və həmçinin əruz vəznində və bəhri-təvil səpgisində rəvan şeirlər inşa edən istedadlı bir qələm sahibidir...” (sms.səh.22).

Sonra Həzrəti-Mühəmmədin (s) Həzrəti-Əlinin (ə) kimliyini bəyan edən 51 fikri verilmiş və şairin Əli (ə) haqqında hədisləri əhatə edən bir qitəsi təqdim edilmişdir:

Əli Allaha vəlidir,
Əli Allahın əlidir.
Əlidir ləngəri-aləm,
Əlidir cövhəri-Adəm.
Əlidir şahi-vilayət,
Ona vəhy olub imamət.
Onu hər biləndi aqil,
Onu bilməyəndi cahil.
Əlidir möcüzi-Yəzdan,
Əlidir sahibi-ürfan.
Əlidir fatehi-Xeybər,
Əlidir saqiyi-Kövsər.
Əlidir zahirü batin,
Əlidir şeyxi-səlatin.
Əli gahi-İliyadır,
Əli gahi-Şintiyadır.
Kainat sədəf, Əli dürr,
Əli cani-Müstəfadır,
Əli taci-“Hələta”dır.

səh.12.

“Qurani-Kərimdə Həzrəti-Əli (ə) barəsində gələn ayələrin bir qismi haqqında” adlı yazıda “Maidə” surəsi 3, 55-56, 67-ni; “Tövbə” surəsi 19-u; “Əhzab” surəsi 33ü; “İnsan surəsi”ni; “Ali-İmran” surəsi 61-i; “Şura” surəsi 23-ü”; “Vaqiə” surəsi 10-u; “Səcdə” surəsi 18-i şərh edərək, onların Həzrəti-Əliyə (ə) aid olduğunu sübuta yetirmiş və digər surələrin də Əliyə (ə) aid olan ayələrini qeyd etmişdir.

“Həzrəti-Əli (ə) və elm” adlı yazıda Peyğəmbərin (s) Əli (ə) haqqında 24 fikri verilmiş və yazı iki hədislə yekunlaşmışdır. “Yəhudilərin böyük alimi ilə mübahisə”, “Məsihi aliminə qaneedici cavab” və “İslam tarixinin başlanğıcının təyin olunması” kimi yazılarda da Həzrəti-Əlinin (ə) səciyyəvi cəhətlərini, aliliyini açıqlayan məsələlərə toxunulmuşdur. Müəllif Həzrəti-Əlinin (ə) divanından İmam Həsənə (ə) nəsihətini tərcümə edərək kitaba daxil etmiş, eyni zamanda Əli (ə) haqqında 3 qitəsini də oxuculara təqdim etmişdir.

Tarix üzrə elmlər doktoru Təvəkkül Səlimov “Kamilliyin zirvəsində” adlı məqaləsində yazır:”Hacı Soltan Allahın, Əhli-beytin, On dörd məsumun, Həzrəti-Əli əleyhissəlamın aşiqidir. Zənnimcə, imdiyə qədər təkcə Azərbaycanda yox, bütün müsəlman aləmində Həzrəti-Əliyə olan eşqini bu qədər çox əsərlərində, şeiriyyatında sevgiylə, məhəbbətlə yad və vəsf edən ikinci bir şəxs yoxdur...” (sms. səh.68).

“Həzrət Əlinin (ə) qəzavətləri”ndən bəhs açan müəllif onun haqqında 7 fikri vermiş və əyani vəsait kimi dörd hədisi misal göstərmişdir. Sonra yenə də Əli (ə) divanından “Nə incit, nə inci” adlı şeirin tərcüməsini və Əli (ə) haqqında 3 qitə vermişdir.

“Həzrəti-Əlinin (ə) şücaəti” adlı yazıda 24 fikri verən müəllif əyanilik üçün “Xeybərin fəthi” hədisini də kitaba daxil etmiş, yenə də Divandan “Əlinin Əmr Əbu Dəvuda cavabı”nın tərcüməsini və 3 qitə təqdim etmiş və Bədr savaşını təsvir etmişdir.

Kitabda “Həzrəti-Əmirəlmöminin Əli (ə) ibni-Əbu Talibin ad, ləqəb və künyələri” haqqında da məlumat verilmişdir. “Əlinin (ə) cavanlıq illəri”, “İmam Əlinin (ə) hicrəti”, “Qureyş Əlini (ə) təqib edir” adlı yazılarda İslam dini tarixindən bir sıra faktlar açıqlanmışdır. Kitabı oxuduqca, dəyərli məlumatları öyrəndikcə, öz-özlüyündə düşünürsən ki, nə yaxşı Azərbaycanın belə din xadimləri var. Onun əsərlərindən oxucular çox şey öyrənir. Tarix üzrə fəlsəfə doktoru Yusif Dirili “Ziyalı kimi tanıdım və sevdim” adlı məqaləsində Hacı Soltana olan hüsn-rəğbətini bildirərək, onun şəxsiyyətindən və bir tədqiqatçı kimi, şair kimi əsərlərinin dəyərindən bəhs edir və yazır: “Elmi-tədqiqat xarakterli əsərlərində dini mövzulara bitkin çalar gətirən, cəmiyyətdə islam dininin, düzgün və dolğun qavranılmasında yetərincə bilik nümayiş etdirən Axund Hacı Soltan Əlizadə mükəmməl poetikasında sözünü ciddən deməyi bacaran ürfan əhlidir. Mənə elə gəlir ki, onun bütün başabaş yaradıcılığı gücgəlməkdən, demək xatirinə cəhddən təmamən kənar məsələdir. Yəni bu işdə o, ulu dədələrimiz kimidir. İlahinin, Haqqın göndərdiklərini çatdırır, vəssəlam! Sözsüz ki, vergi hər adamın işi deyil. Necə deyərlər, Tanrı dağına baxıb, qarını əsirgəmir. Bu mənada Hacı Soltan Hüseynqulu oğlunu Allahın xoşbəxt bəndəsi saymaq olar” (sms. səh. 127-128).

“Həzrəti-Əli (ə) cənablarının fəzilətlərinin bir qismi” yazısında onun 24 fəzilətini qeyd edən müəllif qeyd edir ki, “Bunlardan əlavə Rəsuli-Əkrəm (s) buyurmuşdur: “Allah-təala mənə beş şey əta qılmışdır:

1.Mənə kəlamlar məcmuu əta qılıb, Əliyə isə elmlər məcmuu.

2.Məni nəbi (peyğəmbər), Əlini isə vəsiy seçib.

3.Mənə Kövsəri, Əliyə isə Səlsəbili əta qılıb.

4.Mənə vəyh, Əliyə isə ilham əta qılıb.

5.Mənə Meracı əta qıldı, Əlinin üzünə isə asimanların qapısını açdı, belə ki, mənim gördüklərimi o da gördü və mənim baxdıqlarıma o da baxdı”.

“Xasiyyəti və əxlaqı”, “Əlinin (ə) möcüzələrindən bir qismi”, “Şəklü şəmaili”, “Vəfatı” kimi yazılarda Həzrəti-Əlinın (ə) həyat fəaliyyətinə bir səyahət edən müəllif “İmamın (ə) ictimai xidmətləri”ndə “yetimlərə və fəqirlərə yardımı”ndan, “qulları azad etməsi”ndən, əkinçilik və ağac əkməsi”ndən, kəhriz qazması”ndan, “məscid tikməsi”ndən, “məkanların və mülklərin vəqf edilməsi”ndən söhbət açmışdır. Qəhrəman Cəbrayılov “Əli (ə) şəminin pərvanəsi” adlı məqaləsində yazır: “Hacı Soltan Əlizadə şərəfli və məhsuldar ömrünün bu gününə qədər yazıb-yaratdığı və bundan sonra da oxucuların, dindarların, əhli-xibrənin mühakiməsinə və diqqətinə bəxş edəcəyi əsərləriylə min-min nəslin həyat yoluna iman işığı saçacaq. Əli (ə) eşqinin aliliyini onlara bir daha irşad edəcəkdir” (sms. səh. 95-96).

Hacı Soltan istər dini kitabları olsun, istər tədqiqat işləri olsun, heç bir kitabında poeziyanı unutmur, öz şeirlərindən, həm də müxtəlif klassik və çağdaş şairlərin şeirlərindən

istifadə edir. Bu kitabın sonunda da onun şeirləri verilmiş, bu şeirlərdə onun dini görüşləri, Əhli-beyt (ə.m.) sevgisi öz poetik əksini tapmışdır. Hacı Sara Zair "Mənalı ömrün səhifələri" adlı məqaləsində Hacının həyatından, dini fəaliyyətindən bəhs edir, çap olunmuş kitablarını təqdim edərək yazır: "Bütün bunlardan əlavə, Hacı Soltan yüzlərlə ədəbi-tənqidi, elmi-nəzəri, publisist məqalələrin müəllifi və neçə-neçə kitabların redaktoru, rəyçisi və ön söz müəllifidir. Xatırlatmalıyam ki, yazıçılıq fəaliyyəti ilə yanaşı, Hacı Soltan incə ruhlu qəzəllər, qəsidələr yazan şair təbiətli bir insandır. Onun vətənpərvər, ilahi şeirləri dillər əzbəri olmuş və bu şeirlərə çoxsaylı dini nəğmələr, mahnılar qoşulmuş, xanəndə və dərvişlər neçə-neçə sürud hazırlayıb musiqi bəstələmişlər" (sms.səh.151).

Yazımızı Rüstəm Tofiqin Hacı Soltana həsr etdiyi Əhli-beyt (ə) sevgisini əks etdirən bir qəzəli ilə yekunlaşdırırıq:

Bir aşiqi-biçarə əzm etdi bu meydanə,
Dastani-məhəbbətdən nəql eyləyə məstanə.

Nəymiş bu məhəbbət bəs, qəlb içrə **Əli** eşqi,
Çox aşiqi bu eşqi döndərdi qəzəlxanə.

Bir aşiqimiz vardır, məclisdə səbəbkardır,
Ol eşq təriqindən teyy eylədi mərdanə.

Ol məsti-Ələst olmuş, canan ona qəsd olmuş,
Bir məqsəd üçün gəlmiş möhnət dolu dövranə.

Bir qəsd ilə hər adəm dünyayə sübut eylər,
Öz dininə xidmətçün qatlaşdı bu hicranə.

Həqq ismini zikr eylər, axır günü fikr eylər,
Döndərməz onu Xaliq məhşərdə pərişanə.

Hər ləfzi həqiqətdir, sidq onda bir adətdir,
Getmiş çün imamət tək bir şanlı dəbistanə.

Söz gəldi təmam oldu, bir mədh məram oldu,
Şahanə gərək tərif şah tək Hacı Soltanə.

Ey başımızın taci, tac üstdə guhər haci,
Əfv et, səni vəsf etdi Rüstəm kimi divanə.

21.12.2008.

# 19.AZƏRBAYCANIN QADIN ŞAİRLƏRİ VƏ İSLAM

Hacı Soltanın on doqquzuncu kitabı "Azərbaycanın qadın şairləri və İslam" adlanır. Kitab "Tural"-NPM-də 2004-cü ildə nəşr edilmişdir. Kitabın redaktoru Arif Əşrəf Buzovnalıdır. Kitab filologiya elmləri doktoru, professor, xalq yazıçısı Əzizə Cəfərzadənin əziz xatirəsinə ithaf edilmişdir və Hacı Soltanın Əzizə xanımın vəfatına həsr etdiyi şeirlə başlayır. Müəllifin özünə ana qədər yaxın bildiyi insanın vəsfində yazdığı şeirin ilk və son bəndlərini burada veririk:

Dünyasın dəyşdi Əzizə xanım,
Verdi küləklərə öz nəfəsini.
O, Vətən qızıydı, torpaq qızıydı,
Torpaq geri aldı xəzinəsini.

Onun hər bir sözü, hər bir əməli,
Var nə qədər cahan, var olacaqdır.
Soltanın qəlbində olan heykəli
Bir gün Vətənində qoyulacaqdır.

(səh. 3-4)

Hacı Soltanın bu kitabı digər kitablarından bir qədər fərqlənir. Hər dəfə islami dəyərlərdən, tarixi şəxsiyyətlərdən danışan müəllif bu dəfə Azərbaycanın şair qadınları haqqında bəhs açmışdır. Burada həm Əhli-beyt (ə.m.) şairlərinin, həm el şairlərinin, həm də müasir şairlərin yaradıcılığını tədqiq edən araşdırıcı böyük dairəni əhatə etməyə çalışmışdır. Xalq şairi Zəlimxan Yaqub "Haqqın işığında döyünən ürək" adlı

məqaləsini bu fikirlərlə bitirir: "Hacı Soltanı mən ona görə çox sevir və yüksək qiymətləndirirəm ki, kimdən danışır-danışsın, onun dili yox, ürəyi danışır, kimdən yazır-yazsın, qələmin mürəkkəbi ilə yox, ürəyin qanı ilə yazır. O, Həzrəti-Əli (ə) haqqında, Şah Xətai haqqında, Azərbaycanın dərvişləri və rövzəxanları haqqında, böyük şairlər haqqında yazanda da, dini və dünyəvi təfəkkürü birləşdirə bilir. Ziyalı, alim, dinşünas, şair, tədqiqatçı sözlərinin hansını onun adının yanında yazsan, Hacı Soltan adına yaraşır. Yaraşır ona görə ki, onun mənəvi dünyası Alah sevgisi, peyğəmbərlər nuru, "Quran" işığı, söz sehri ilə gözəlləşib. Ulu Tanrı bu gözəlliyi sevgili qardaşımızdan almasın" (sms. səh.42).

Kitabı adəti üzrə "Bismillah"la başlayan Hacı Soltan girişdə islami dəyərlərdən söz açmış, Qurani-Kərimdə qadına verilən qiyməti vurğulayaraq, Əhli-beyt (ə.m.) aşiqi olan şair qadınlardan bəhs edərək yazmışdır: "Şairələr Kərbəla hadisələrinə, İmam Hüseyn (ə) faciəsinə çox diqqətlə yanaşmış, Əli (ə) qızı Həzrəti-Zeynəbi (ə) özlərinə nümunə saymışlar. Hələ Peyğəmbər (s) zamanında İslamı müdafiə və təbliğ edən Ümmi-Hani, Hind binti-Əsəsə, Safiyyə binti-Əbdül-Müttəlib, Naim binti-Səid, Ümmi-Loğman kimi qadın şairlər də var idi və onların sonrakı dövrlərdə yazıb-yaradan xanımlara etdiyi təsir də çox əhəmiyyətlidir. Bu mənbələrdən qidalanan Azərbaycan və Şərq dini ədəbiyyatı müasir dövrə qədər öz vacibliyini və parlaqlığını itirməyib" (səh. 7).

Müəllif iki dünya xanımlarının xanımı Fatimeyi-Zəhradan (s.ə) güclü qələm sahibi kimi söz açmış və Xanımın atası Peyğəmbərin (s) qəbrini ziyarət edərkən dediyi beytlərdən misallar göstərmişdir:

Ey üzünü torpaq altında gizlədən kəs,
De görüm, mənim nalə və fəğanımı eşidirsənmi?
Əgər eşidirsənsə, bil:
Canıma o qədər dərd, bəla çöküb ki,
Əgər günlərin üstünə o bəlalar düşsə,
Qara gecələr kimi olar.

(səh. 8)

Kitaba “Yeddinci əsrin şairi İbni-Hüneynin yuxusu” da daxil edilmişdir.

Hacı Soltan Həzrəti-Zeynəbdən də əhatəli söz açmış, onun anası kimi İslama sədaqətlə xidmətindən danışmış, İslamın və Quranın mükəmməl təbliğatçılarından olmasını vurğulamış və Kərbəla qəhrəmanı kimi rəşadətindən bəhs etmişdir. Burada Yezidin arvadı Hindənin fədakarlığı da qələmə alınmış, onun Yezidə qarşı çıxması, onu rüsvay etməsi diqqətə çatdırılmışdır.

Müəllif Həzrəti-Əli (ə) dövründə yaşayıb-yaradan qadın şairlərə kitabda yer vermiş, Sövdə Həmədaninin Həzrəti-Əli (ə) haqqındakı şeirini təqdim etmişdir:

Tanrı salamı o ruha olsun ki,
Onun peykərini (bədənini) topaq aldı.
Ədalət və insaf da onunla dəfn edildi.
Tanrı ilə peyman bağlamışdı ki,
Onun yerinə heç bir əvəzi qəbul etməsin.
Heç bir əvəzi seçməsin.
Onun pak vücudi iman və haqq ilə
Yaranmış və uyğunlaşmışdı.

(səh.15)

Hacı Soltan Azərbaycanın qadın şairlərindən söz açarkən Məhsəti Gəncəvinin Allahla bağlı rübailərindən ikisini təqdim edərək, onların şərhini vermişdir.

Heyran xanımın farsca beytlərini, həm də onların tərcüməsini vermişdir: "Bu yazıq Heyranın nəsəbini soruşsan, o dinin şahı, Allahın şiri İmam Əlinin (ə) xidmətçilərindəndir. Onun nisbəti Naxçıvan əşrafına çatsa da, əslində Dünbüli nəslindəndir" (səh. 17). Kitabda Heyran yaradıcılığına daha çox yer ayıran müəllif onun Ramazanla, Quranla, Peyğəmbərlə, Kərbəla faciəsi ilə, İmam Hüseynlə (ə) bağlı şeirlərindən sitatlar vermiş və onları şərh etmişdir.

Kitabda tatarlar tərəfindən satın alınıb Türkiyəyə aparılan Gülşad xanımın bir şeiri verilmişdir. Şeirdə "Ya İlahi, dərman elə bu dərdə" deyən şair durnalarla Əcəm elinə salam göndərir.

Ağabəyim Ağabacıdan söz açan Hacı Soltan onun  məşhur "Yaddan çıxmaz Qarabağ" bayatısını, və bizimçün yeni olan bir beytini verir:

Əgər düşsə güzarım bir zaman kəlisayə,
İmana gətirərəm o kafər qızlarını.

(səh. 26)

Kitabda Güllər Pərisi (1790-1925) adlı şairin qoşmasından sitat verən müəllif onun evdar qadın olduğunu, 135 il ömür sürdüyünü qeyd edir:

Qadir Allah, gəl rəhm eylə bu çağa,
Qoyun necə tab gətirsin bıçağa?
Qoyalar qəbirə, bükələr ağa,
Nəkraillər sual etsə, nə deyim?

(yenə orada)

Kitabda Aşıq Pərinin Həzrəti-Əli (ə) ilə bağlı şeirlərindən bəndləri, Allaha müraciətlə yazılmış qoşmasını, Qönçəbəyimin Həzrəti-Əliyə (ə) və İmam Rzaya (ə) həsr olunmuş şeirlərindən bəndləri verən Hacı Soltan Azərbaycanın qadın şairlərinin Əhli-beytə (ə.m.) olan sevgisini oxuculara əhatəli şəkildə açıqlamışdır. Maraqlı faktlardan biri də budur ki, 1826-cı ildə yazılmış "Tarixi-Nadir" adlı əlyazmanın bir vərəqində Abbasqulu ağa Bakıxanovun qızı Tuğra xanımın məşhur şair olduğu qeyd olunmuş və bir beyti verilmişdir. Əhli-beytə (ə.m.) məhəbbəti əks etdirən bu beyti tədqiqatçı kitaba daxil etmiş və şairin Fatimeyi-Zəhrayə olan münasibətini təqdir etmişdir:

Tuğra xanımam mən, bu cahan içrə əzizəm,
Abbasqulu ağa qızı, Zəhrayə kənizəm.

(səh.28)

Hacı Soltan kitabda görkəmli Azərbaycan şairi Xurşidbanu Natəvanın yaradıcılığına geniş yer ayırmışdır. Onun qəzəllərindən beytlər, Nəvvaba ünvanlanmış şeirini, Kərbəla müsibətinə həsr etdiyi "gəlməsin" rədifli növhəsini və bir məsnəvisini vermiş, eyni zamanda Cəfərqulu xanın Natəvana həsr etdiyi fars dilində şeirindən bir beyti tərcüməsi ilə birlikdə oxuculara təqdim etmişdir:

Fatimeyi-Zəhrayə kəniz olan
Xurşidbanu Mələklə diz-dizə əyləşir.

(səh.34)

Müəllif əsərində Fatimə xanım Kəminə yaradıcılığından da bəhs etmişdir. Kəminə öz dövründə "Mirzə" deyə müraciət olunan yeganə qadın şairdir. Burada onun "əsmai-hüsnadan" – Allahın gözəl adlarından istifadə edərək yaratdığı "bilmişəm" rədifli qəzəlindən beytlər verən tədqiqatçı Kəminənin islami dəyərləri, Kərbəla müsibətini əks etdirən şeirlərindən də söz açmış və nümunələr vermişdir. Hacı Soltan Fatimə xanımın Türkiyədə təhsil aldığını və Anadolu şair qadınları ilə şeirləşdiyini də diqqətə çatdırmış və həmin şairlərdən Şərəf xanımın, Nəsibə Səfvətin, Əhməd paşanın qızı Fitnət xanımın yaradıcılıqlarına da müraciət etmiş və şeirlərindən nümunələr vermişdir. Fitnət xanımın "Allah eşqinə" adlı müxəmməsini bütövlükdə təqdim edən müəllif şeirin Kəminə xanımın yaradıcılıq nümunələri ilə çox oxşar oğduğunu da vurğulamışdır.

Tədqiqatçı yazır: "XIX əsr qadın şairlərin simasında Azərbaycan ədəbiyyatına böyük xəzinə bəxş olundu. Ziba xanım Ləli, Mah xanım, Mahtab xanım, Fatimə Şirvanlı, Aşıq Həmayıl, Aşıq Bəsti, Qəmərbəyim Şeyda, Pərnaz, Zeynəb Zərbəli qızı, Püstə Şikar qızı, Cahansuz, Başxanım Şəfi qızı, Güləndam, Gülgəz Maqsud qızı, Leyli Əzizbəy qızı kimi söz sahibləri məhz XIX əsr boyu Azərbaycan ədəbiyyatında estafetçi rolunu oynayaraq ədəbi dini ənənələri yaşatmaqda, inkişaf etdirməkdə səy göstərdilər" (səh. 41).

Kitaba Mirhəmzə Seyid Nigarinin müridlərindən olan Şah Nigar xanım Rəncurun şeirləri də daxil edilmişdir ki, bu əsərlərdə İlahi eşqin tərənnümünü görürük. Şairin "görmədim", "qılma" rədifli və s. qəzəllərində, ərinin və yeganə qızının ölümünə yazdığı mərsiyələrdə islami dəyərlərə, Allaha,

Həzrəti-Əliyə (ə) olan münasibəti diqqəti çəkir.

Tədqiqatçı Salman Mümtazın təzkirəsindən götürdüyü məlumata görə, Nurşərəf xanımın Xətai aşiqi olmasını vurğulayan Hacı Soltan onun M.F.Axundzadənin əmisi Hacı Əliəsgərin qızı, yəni Tubu xanımın bacısı olduğunu da diqqətə çatdırır. Burada Xətaidən söz düşmüşkən, müəllif onun hərəmlərindən Həyat xanımın və Cahan xanımın da şairlik təbləri olduğunu vurğulamış və onların Xətaiyə xitabən dedikləri beytləri tərcümələri ilə birgə təqdim etmişdir.

Kitaba Leyli xanımın bir münacatı daxil edilmişdir ki, tədqiqatçı onu Azərbaycanın hüdudlarından uzaqlarda olan azərbaycanlı şair hesab edir.

Hacı Soltan Cənubi Azərbaycanda yaşayıb-yaradan onlarla qadın şairin adını sadalayır ki, onların çoxu bizə tanış deyildir və müəllifin bu qədər məlumatı haradan və necə aldığı maraq doğurur. Hacı Soltan harda yeni bir imza tapırsa, onun əsərini atır sandığına. Hansı kitabdasa mütləq həmin nümunəni oxuculara təqdim edir. Yəqin ki, İranın Azərbaycan vilayətlərində səfərdə olan zaman cənub qadın şairlərinin əsərlərini də toplamış, bu tədqiqat əsərində bizə çatdırmışdır. Hacı Vasim Məmmədəliyev "Yorulmaz tədqiqatçı" adlı məqaləsində yazır: "Hacı Soltan narahat tədqiqatçıdır. O daim arayıb-axtarır, oxuculara nə isə yeni bir söz demək istəyir və çox zaman buna nail olur. Bu isə, təbii ki, gərgin axtarışlar, yuxusuz gecələr, günlərlə oturub işləmək, qısası, ağır zəhmətə qatlanmaq bahasına başa gəlir. Fikrimizcə, Hacı Soltanın həyatda daim narahat, bir qədər qayğılı görünməsinin əsas səbəbi elə budur" (sms. səh. 177).

Kitabda Aşıq Mələksimanın, Aşıq Şirinbəyimin, Aşıq Sə-

nəmin şeirlərindən nümunələr verən müəllif, şifahi xalq ədəbiyyatında Ağcaqız, Ülkər, Dilşad, Sona Axundova, Maral Nəbizadə, Qızyetər, Əsmər, Aşıq Nabat, Aşıq Sona, Dostuxanım kimi aşıq xanımların yaradıcılığında da islami dəyərlərin əks olunduğunu, onların Əhli-beyt (ə.m.) sevgini diqqətə çatdırmışdır.

Burada bakılı qadın şairlərdən şair Seyyid Zərgərin həyat yoldaşı Məşədixanım Leylinin məlum iki qəzəlindən söz açılmışdır. “Sabunçulu qız” kimi tanınan şairin 28 bənddən ibarət “Beytullah” rədifli mürəbbəsi Kəbə ziyarətinin təsviridir. Bunu poema da adlandırmaq olar. Əsərdən müəllifin savadlı olduğu hiss olunur.

Təbrizli Pərvin Ehtisaminin məzar daşına yazdığı epitafiya da kitabda yer alır:

Qara torpaq olub indi yasdığı,
Şe’rin dan ulduzu şair Pərvinin.
Bu zalım zamanın zəhər çanağı
Əlindən düşmədi sözü şirinin.

Ey dost, sən xatırla onu hər zaman,
Axı, qəbirdə də qalıb nigaran.
Bəlkə fatihədir, yasindir, inan,
Bir anlıq sevinci belə qəmginin.

(səh. 55)

Kitabda Ümmügülsüm Sadıqzadənin, Gülnarə Ağazaman qızının, Məşədi Xeyrünnisa xanım Suğranın, Hökümə Əliyevanın, Elnarə Buzovnalının yaradıcılığından söz açan müəllif

bəzilərinin şeirlərindən örnəklər vermişdir.

Kitaba daxil edilmiş Fatimeyi-Zəhranın (s.ə.) kənizi olmuş Fizzə xanım ilə bağlı hədis, İmam Cəfəri Sadiqin (ə) kənizi Hüsniyyə xanımın Bağdad alimləri ilə bəhsi, onunla bağlı "İki müsəlman", "Abbas üstün idi, yoxsa Əli", "Peyğəmbərin məsum olması" adı ilə verilmiş hədislər də maraq doğurur.

Kitabda xalq şairlərimizdan Nigar Rəfibəylinin, Mirvarid Dilbazinin yaradıcılığından örnəklər, Mədinə Gülgünün bir misrası və Həkimə Büllurinin münacatı da verilmişdir.

Yazımızı Güləmayil Muradın Hacı Soltana həsr etdiyi "Hacı" rədifli şeiri ilə bitiririk:

Adam var ziyası, düzü, görünmür,
Sən isə ziyalı insansan, Hacı.
Sözlərin içində sözü görünmür,
Söz sədəf, sən isə ümmansan, Hacı.

Hərənin nəyəsə imkanı vardır,
Qoşması, nağılı, dastanı vardır.
Hətta meyxananın heyranı vardır,
Sən gözəl qəzələ heyransan, Hacı.

Hər sərvət sahibi bəxtəvər deyil,
Və hər bəxtəvərsə mötəbər deyil.
Çox soltan görmüşük, heç nökər deyil,
Sənsə soltanlara Soltansan, Hacı.

# 20.ƏLİ (ə) HARADADIR

2005-ci ildə "Tural"-NPM-də Hacı Soltanın "Əli (ə) haradadır" adlı iyirminci kitabı dərc edilmişdir. Kitabı ustadı, dostu Dərviş Əlisöhbət İmamverdi oğluna ithaf edən müəllif elə kitabı onunla çəkdirdiyi şəkillə açır. Kitabın redaktoru Arif Əşrəf Buzovnalıdır. Klassik ədəbiyyatı sevənlər üçün nəzərdə tutulan bu kitabda Hacı Soltanın dini əsərləri toplanmışdır. Bakı İslam Universitetinin rektoru Hacı Sabir Həsənli "Söz fədaisi" adlı məqaləsində yazır: "Hacı Soltan son dərəcə üstün və kəsərli bir qələmə malikdir. Qısa bir zaman kəsiyində tərtib və çap etdirdiyi onlarla maraqlı kitablar, müasir dünyamızda İslamın müxtəlif sahələrə baxışını əks etdirən yazılar, şeir topluları bu yorulmaz və əzmkar 50 yaşlı cavan insanın nə qədər böyük istedada malik olmasına aşkar bir dəlildir.

Sözə dəyər vermək, ilahi sözə söykənərək söz demək Hacı Soltanı başqalarından fərqləndirir, onu ucaldır, onu sevdirir. Çoxlarını çox yerdə görmək mümkündür, lakin az görünüb çoxluğun yaddaşında və hüsni-nəzərində qalmaq hər kəsə nəsib olmur. Bunun üçün Allah-təalanın məhz çoxlarına vermədiyi keyfiyyətlərə sahib olmalısan. Mən Hacı Soltanı həmin seçilmişlərin sırasında gördüm və görməkdəyəm" (sms. səh. 25).

"Əli könlümdədir" adlı poema Allahın adı ilə və allaha münacatla başlayır:

Eşq olsun o uca Pərvərdigarə,
Bütün yaranmışa ondadır çarə.
Həmd olsun rəhimli böyük Allaha,
Şükr olsun şəfqətli ulu dərgaha.
O baqi varlığa tutub üzümü,
Sütunsuz göylərə dikib gözümü,
Sidq ilə hər zaman edirəm dua,
Arzu-istəyimə eyləsin riza.

Hacı Soltan Allaha üz tutub dua edir ki, ilhamını şövqə gətirsin, gözəl kəlamlarla Peyğəmbər (s) şəninə söz söyləsin, müqəddəs Nəcəf şəhərinə üz tutub Əlini (ə) vəsf eləyə bilsin. Müəllif Əli (ə) aşiqi olduğunu, bu eşqdə sadiqliyini, Əli (ə) sehrinə düşdüyünü qeyd edərək yazır:

Açdın Məhsətinin müəmmasını,
Qəssab cavanmərdin macərasını.
Yuxuda görüb bir fəqir səni,
Bir kəlmənlə oldu o fəqir ğəni.
Gördüm təbliğ edir Heydər sözünü,
Mehmet Akif yazıb hünər sözünü
Ki, ondan söz açıb Məhəmməd Hadi,
Dilində vird olub Əlinin adi.
Seyyid Yəhya Bakuvi çün bavüqar
Əli deyib “xəlvət”də, həm aşikar.
Minlərlə şairin, dərviş-məddahın,
Qumri, Qüdsi, Dəxil, Raci, Sərrafın,
Seyyidin, Sabirin şüarı olub,

Ənbiya, övliya vüqarı olub.
Üstəlik Qərbin də dilində əzbər,
Ən ali ad kimi çəkilir Heydər.
Kordova, Kornikuy, Dangiri, Volter,
Tomas Karlil kimi çoxu yerbəyer.
Bəşərə Əlini ediblər meyar,
Tarixdə bu cürə xeyli misal var.
Adəmdən Xatəmə hər aqil insan
Əlini millətə veribdir nişan...

Şair arzu etsə də, Əlini vəsf etməyə qüdrəti çatmadığını etiraf edir, hətta dua edir, Allahdan təbinə qüvvət istəyir ki, Əli (ə) onun bu işindən incik olmasın, yazdıqlarına görə Əlinin (ə) yanında xəcalətli olmasın. Münacatda Allaha müraciət edən şair ara-sıra müxtəlif şairlərin, Əli aşiqlərinin Əli (ə) ilə bağlı fikirlərini də nəzmə şəkir, Əlinin (ə) tərifini verir, sonda yenə də Allahdan, Peyğəmbərdən (s), Fatimeyi-Zəhradan (s.ə.), hər bir imamdan (ə.m) ayrı-ayrılıqda təvəqqe edir ki, onun istəklərini Əliyə (ə) çatdırsınlar. Məsnəvi formasında yazılmış münacat belə bitir:

Ya Sahibəz-zaman, Mehdiyi-Xuda,
Ya İmami-zində, yoluna fəda.
Səndən isə budur qəlbin niyyəti,
Yetir muradına bəşəriyyəti.
Qurulsun dünyada təxti-ədalət,
Əlini tanısın bəşər, nəhayət.
Ya Əli, nitqim yox edim xitabı,

Hansı söz vəsf etsin sən tək cənabı.
Bilmirəm mənzilim hara olacaq,
İstəyim bir səni görməkdi ancaq.
Bu dünyada ali tək səni bildim,
Səninçün yaşadım, səninçün öldüm.
Yenə ömür versə Həqq mənə əgər,
Səninçün yaşayıb-ölməyə dəyər.

Əsərdəki bəzi sözlərin izahı kitabın sonunda verilmişdir.

Münacatdan sonra Əli (ə) haqqında növhə verilmiş və arada Əlinin (ə), Həsənin (ə), Hüseynin (ə), Şah İsmayıl Xətainin, Hacı İskəndər Əbuzər oğlunun və müharibədə şəhid olanların şəkilləri verilmişdir.

Ərdəbil şairlərindən Əsqər Şahi "Ədib və şair qardaşım" adlı məqaləsində yazır: "Hacı Soltan Əhli-beyt (ə.m.) vəsfində şeir yaratmağı, ədəbi mövzularda əsər yazmağı, mədəni sahələrdə addım atmağı, habelə şair əxlaqi ilə fəaliyyət göstərməyi həqiqətə həyan durmağa güclü səbəblər bilmişdir. Demək olar ki, o bütün istedadını, Haqq yolunun xidmətçisi olmaq məqsədilə irəli sürmüşdür..." (sms. səh.17).

Kitaba daxil edilmiş ikinci poema "Kərbəla karvanı" adlanır və münacatla başlayır. Şair yazır:

Təbə nizam eylə, Xuda, Hüseynimin eşqinə,
Şe'rim edə ahü nəva Hüseynimin eşqinə.

Münacat 11 beyt qəsidə şəklində yaılmış və məsnəvi formasında davam etdirilmişdir. Burada da Qurandan, hədis-

lərdən istifadə edən müəllif Hüseynin (ə) vəsfini verir, Kərbəla faciəsindən bəhs edir, bu faciənin mahiyyətini açıqlamağa çalışır. Burada İmam Hüseynin (ə) məqamlarını bir-bir şərh edən Hacı Soltan röyasında gördüyü bir ixtiyarın dediklərini nəzmə çəkərək yazır:

Dinlə, on məqamı agah edim mən,
Ta İmam Hüseyni tanıyasan sən.
Birinci məqamı budur o Şahın,
Əldən qoymaz yerə vəfa silahın.
Çün ruzi-Ələstdə bağlayıb peyman,
Xuda ilə bir əhd etmişdi səhman.
Bir əhd ki, özüldü ən böyük dərdə,
Buna dözməmişdi bir peyğəmbər də...

Hacı Soltan Hüseynin ikinci məqamını onun atasının, anasının, babasının kimliyi ilə bağlayaraq, onları vəsf edir və sözünü belə yekunlaşdırır: “Kimdə var bu qədər ali mərtəbə, Allah istəyiylə yetə mətləbə”.

“Üçüncü məqamı Şahi-cahanın Budur ki, batini odur Quranın” yazan müəllif yenə Qurana müraciət edir, “Hüseynə şəhadət verdi “Hələta” deyir və digər surələrdəki ayələrdən də bəhs açır.

Dördüncü məqamla o xülqi-xalis
Oldu hürriyyətə, vəhdətə bais.
İslam əzəl budur - ən azad dindür,
Ruhu, əqidəsi azadlarçündür.

Şair Yəzidin insanları qula çevirdiyini, haram işlər gördüyünü və öz pisliklərini ört-basdır etmək üçün Hüseynin (ə) ona beyət etməsinə çalışdığını, lakin bunu qəbul etməyən İmamın (ə) İslamı diriltmək üçün Kərbəlaya üz tutduğunu, özünü, övladlarını, yaxınlarını qurban verdiyini, ondan sonra Zeynəbin Yezidin gizli mətləbini faş etdiyini, daha sonra Muxtar Səqəfinin əli ilə zülm xanəsinin tarümar edildiyini poetik dillə verir və fikrini belə yekunlaşdırır: "Azadlıq verilmir, alınır ancaq, istəyir əqidə olsun, ya torpaq".

Beşinci məqamı qəhrəmanlıqdır,
Meydanda igidlik, pəhləvanlıqdır.
Hüseyn övladıdır Şiri-Xudanın,
Bir kəlmə bəsidir cümlə cahanın.

deyən müəllif Hüseynin (ə) uşaqlıqdan meydan açdığını, Peyğəmbər (s) önündə nizə fırlatdığını, Əli (ə) ilə məşq etdiyini, daha sonra Kərbəla meydanındakı şücaətlərini qeyd edir və onun vəfa əhlinin qibləsi, Mərvə və Səfanın ziynəti, həqqin tacı, Allahın vəlisi olduğu bildirərək fikrini tamamlayır: "Allah növhəxandır öz imaminə, Hüseynə bəndə ol, Allah naminə".

Altıncı məqamı həqqə təqvası,
Ədəb, mərifəti, irzi, həyası.
Tərbiyə almışdı Şahi-mərdandan,
Ədəb öyrənmişdi Həzrət-Zəhradan.
Ustadı Mühəmməd Müstəfa idi,
Cümlə mələk ona aşina idi.

yazan şair Allah aşiqi olan Hüseynin (ə) iffətdə, ismətdə, ədldə, taətdə bəşərə sərvər olduğunu, oruc-namazı ilə bəşəriyyətə nümunə olduğunu, həyatı ilə insanlara firuiddini öyrətdiyini, ölümüylə təqvaya həyat verdiyini, bəşəri vicdanla üz-üzə qoyduğunu poetik obrazlarla nəzmə çəkmişdir.

"Yeddinci məqamı ədalətidir, Zülmə güc gəlməyə cəsarətidir" deyən müəllif Hüseyn (ə) şəhadətinin ədlə zəmanət olduğunu qeyd edir.

Səkkizinci məqam elmi İmamın,
Əsrarı mübhəmdi çox bu məqamın.
Hüseyn bəşər üçün elmə məbəddir,
Elə bu kəlmədə məna bihəddir.
Kim ki, alim kimi bəhs edir dindən,
Gərəkdir su içə Hüseyn əlindən.
Elmi peyğəmbərdən öyrənib daim,
Mürtəza onunçün söyləyib "alim".

"Doqquzuncu məqam əbədiyyəti, Qiyamət günündə səlahiyyəti" deyərək, onun məhşər günündə insanlara şəfaətçi olacağından, İmamın (ə) dostlarının sorğusuz behiştə girəcəklərindən, Hüseyn (ə) aşiqlərinin ricası ilə Allahın bəzi günahkarları bağışlayacağından bəhs edən şair yazır:

Hüseynin bayrağı qalxar vətəndə,
Zamanın sahibi Mehdi gələndə.
Dünyada O eylər qiyamət bərpa,
Zühur ilə olar ədalət bərpa.

“Hər kəsə aiddir onuncu məqam, Onu ziyarətdir sonuncu məqam” deyə Hüseyn (ə) ziyarətinin böyük nemət olmasından, onun zəvvarlarının Allah tərəfindən mükafatlandırılacağından bəhs açan müəllif, bu on məqamın bütün imamlara (ə.m.) şamil olduğunu da qeyd edir. Bir gün özünün də şəhadətə yetəcəyini düşünən, “Yetişsin bu səda Hacı Soltana Ki, daha qalmayıb dözüm hicrana” arzusu ilə yaşayan şair sonda həmin xəyala qayıdaraq yazır:

Necə gəlmiş idi qeybdən o nur,
Necə olmuşdusa yoxluqdan zühur.
Elə də bir anda çəkildi getdi,
Sözünü qurtarıb məni tərk etdi.

Şair daha sonra yaşadığı xoş anlar üçün Allaha üz tutub dualar etdiyini qeyd edir, aşiqi olduğu Hüseynin adını bütün bəşərə yayacağını, onun adıyla yazıb-yaradacağını bildirir, poemanı “Biz nökərik, sənsə başımıza tac” misrası ilə bitirir.

Doğrusu, poema mənə çox təsir etdi, ona görə də bir qədər geniş bəhs açdım. Poema təsirli olduğu qədər də oxucunu elmi cəhətdən qidalandıra biləcək bir əsərdir. Fikrimi Rəhimağa İmaməliyevin Hacı Soltan haqqında bir cümləsi ilə ifadə etmək istəyirəm: “Müəllifin rəngarəng üslubda yazıları, yetkin və bitkin fikirləri onun söylədiyimizdən də daha dərin, daha çox yaradıcılıq imkanlarına malik olmasını ehtimal etməyə bizə imkan verir” (sms.səh. 185).

Ondan sonra “Hüseynim” adlı növhə gəlir.

Kitabdakı növbəti poema “Xətai ilə üz-üzə” adlanır. Poemada məsnəvi forması ilə qoşma bir-birini əvəzləyir. Əsər

"Münacat"la başlayır. Burada Hacı Soltan Allaha müraciət edir, Ona aşiq olduğunu, onun verdiyi ilhamla əlinə qələm aldığını, Peyğəmbərin (s) ona görə həyata qədəm qoyduğunu, Əlinin (ə) Onun vəslinə görə can verdiyini, Həsənül-Müctəbanın (ə) Ona görə zəhəri şərbət kimi içdiyini, İmam Hüseynin (ə) Onun eşqiylə Kərbəla çölünü qanıyla suvardığını obrazlarla qeyd edir və fikrini belə tamamlayır:

Qoyma yarı yolda qalsın kəhərim,
Nurundan nur alıb, yansın əsərim.
Yəqin istəyincə olar bu mətləb,
Sən mərhəmət etsən, imkan versə təb.
Bir əsər doğulub gələr cahana,
Lütfü kərəm etsən Hacı Soltana.
Əsərim aləmə salar səs-səda,
Şübhəsiz sayəndə sənin, ey Xuda!

Hacı Soltan xəyalən Təbrizə getdiyini, bir şahın sorağına düşdüyünü qeyd edir, Təbrizin baharını, Şah sarayını vəsf edir, Şah İsmayıl Xətainin şahlıq dövrünü, onun rəiyyətlə rəftarını, şücaətlərini, Hürrün qəbrini açmasını, peşimançılığını poetik lövhələrlə qələmə alır, "doğrusu" rədifli qəzəlini verir. Burada Həbibidən, Füzulidən, Sultan Səlimin günahlarından bəhs açan müəllif ürəyindəki təəssüfü oxucularla bölüşür. Əsər Xətainin şeiri ilə bitir. Füzuli Ramazanoğlu "Xeyirxahlıq şəriətin açarıdır" adlı məqaləsində Hacı Soltanın mənalı həyat yoluna güzgü tutur, onun dini fəaliyyətini işıqlandırır və Xətaiyə olan sevgisini belə dəyərləndirir: "Hacı Soltanın qəlbində heç kimdə görmədiyim, eşitmədiyim

müqəddəs bir Xətai məhəbbəti var. Kiminlə söhbət etməsindən asılı olmayaraq sözünün əvvəlində də, axırında da Şah İsmayıldan, onun möhtəşəmliyindən, əzəmətli və tarixi şəxsiyyət olmasından bir-birindən maraqlı söhbətlər edir. Bu ulu hökmdarın, şairin, sərkərdənin portretlərini böyütdürüb şagirdlərə, tanıdığı, tanımadığı adamlara paylayır. Özü də təmənnasız" (sms.səh. 233).

Azərbaycanın məşhur hökmdarı, ana dilini dövlət dili elan edən, insanları bir bayraq altında birləşdirməyə çalışan, imanlı bir Azərbaycan oğlunun rəşadətini, şücaətini əks etdirən bu əsər həm bədii siqlətinə görə, həm də tarixi əhəmiyyətinə görə maraq doğurur. Burada Hacı Soltanın həm şairlik istedadı, həm də dini, elmi dünyagörüşü diqqəti çəkir. Tanınmış səhnə ustası Kərbəlayi Ramiz Əzizbəyli deyir: "...Hacı Soltan əxlaqın, mənəviyyatın gözətçisidir. Əlində Qurani-Kərim, ürəyində Əli (ə) rəhmi, dilində müqəddəs kəlam insanlara işıq paylayır. Mən özümü xoşbəxt sayıram ki, Hacı Soltanın məclisində iştirak edib, onunla yaxından tanış oldum. bircə onu başa düşə bilmirəm ki, Azərbaycan elminin öndərləri belə bir alimə necə olur ki, biganə qalırlar..." (sms. səh.159).

Kitabdakı növbəti əsər "Hacı İskəndər" adlı ikipərdəli üç şəkilli mənzum pyesdir. Müəllif əsərin əvvəlində qəhrəmanını həm nəsrlə, həm də nəzmlə təqdim edir: "1918-ci ildə ermənilərin Azərbaycanda və xüsusən də Bakıda törətdiyi vəhşiliklərə cavab olaraq xalq ordusu yarandı. Bakıətrafı kəndlərin əhalisindən ibarət olan ordunu xalq qəhrəmanı, buzovnalı Hacı İskəndər Əbuzər oğlu təşkil etdi və silahlandırdı. Onun və dövrəsinə yığışmış vətənpərvər oğulların sayəsində er-

mənilər darmadağın edildi və Türk ordusu ilə birləşən xalq düşmənin hegemonluğuna və vəhşiliklərinə son qoydu. Xalqın qarşısında gedən Hacı İsgəndər idi" (səh. 67). Amma bu barədə qələmə alınmış başqa məlumatlar da vardır ki, orada başqa adamların adı çəkilir...

Kitabdakı sonuncu əsər "Sən nəyi gözləyirsən" adlı pyesdir. Əsər iki pərdə, dörd şəkildən ibarətdir. Pyes vətənpərvərlik mövzusunda yazılmışdır, buradakı hadisələr həm Moskvada, həm də Bakıda cərəyan edir.

Şair, publisist Gülarə Munis "Sözün sehri, sözün sirri" adlı məqaləsində yazır: "...Onun 2005-ci ildə nəşr olunmuş "Əli (ə) haradadır" kitabının üzərində xüsusilə dayanmaq lazımdır. Bu kitabda müəllif münacat, qəzəl, qəsidə və növhələrlə yanaşı ilk dəfə olaraq qələmini dram əsəri üzərində də sınadı. Kitabda olan "Hacı İsgəndər" adlı mənzum pyesi və vətənpərvərlik mövzusunda yazılmış "Sən nəyi gözləyirsən" adlı pyesi oxucuların ixtiyarına verilmişdir..." (sms. səh. 321).

Kitab maraqlıdır. Poemalar sənətkarlıq baxımından daha güclüdür. Pyeslər yəqin ki, Hacı Soltanın ilk qələm təcrübələridir. Kitabın adı düzgün seçilməmişdir.

Yazımızı Rüstəm Tofiqin Hacı Soltana yazdığı və onun Əli eşqinə işarə etdiyi bir qəzəli ilə bitiririk:

Ey göz, gözəl can görürəm surət içində,
Baxdıqca bax, ol surətə sən heyrət içində.

Ol bəndeyi-eşq, aşiqi-giryan Hacı Soltan,
Məhbub sorağıyla gəzir firqət içində.

Bildim nə qədər var nəfəsi, əşki dayanmaz,
Zikr etmədədir yarını hər fürsət içində.

Həqq aşiqidir, məscidü meyxanə nə bilsin,
Hər zərrədə çün Həqqi görür kəsrət içində.

Vəslin qəmidir yandıran ol məsti-Ələsti,
Gözlər gecə-gündüz o günü həsrət içində.

Allahü Məhəmməd dedi, zikr etdi zəbanı,
Yaş tökdü **Əli** eşqi ilə xəlvət içində.

Bir aşiqi mədh eylədi min şövq ilə Rüstəm,
Adəm necə məst olmasın ol halət içində?

04.10.2008.

## 21.BİR ŞƏMSƏN, ALƏM SƏNƏ PƏRVANƏ, HÜSEYNİM

Hacı Soltanın “Bir şəmsən, aləm sənə pərvanə, Hüseynim” adlı iyirmi birinci kitabı 2005-ci ildə “Tural”-NPM-də nəşr olunmuşdur. Kitab Azərbaycanın azadlığı, bütövlüyü və tərəqqisi uğrunda həyatını qurban vermiş bütün şəhidlərin ruhuna ithaf edilmişdir.

Kitabın redaktoru Arif Əşrəf Buzovnalıdır. Annotasiyada oxuyuruq: “Bu kitab müəllifin “Şəhadət yolu” (Bakı-2000) əsərinin təkmilləşdirilmiş variantıdır. Kitabda Kərbəla faciəsinə və İslamın dahi şəxsiyyətlərinin şəhadətinə həsr edilmiş növhələr toplanmışdır. Kitab geniş oxucu auditoriyası və klassik ədəbi irsi sevənlər üçün nəzərdə tutulmuşdur”.

Kitabın əvvəlində “Allah-təalaya xitab”, “Peyğəmbər (s) növhəsi”, “Ya Mühəmməd (s)”, “Növheyi-İmam Əli (ə)”, “İmam Əlinin (ə) fəziləti”, “İmam Əlinin (ə) şəhadəti”, “Yenə də şəhadəti Əli (ə)”, “Fatimeyi-Zəhra (s.ə) növhəsi”, “İmam Hüseyn (ə) növhəsi”, “Aşura günü”, “Hüseynim” adlı əsərlər verilmişdir ki, bunlarda Hacı Soltanın Əhli-beytə (ə) olan sonsuz məhəbbəti, islami dəyərlərə möhkəm bağlılığı bütün aydınlığı ilə açıqlanmışdır. Şair yazır:

Bir şəmsən, aləm sənə pərvanə, Hüseynim,
Eşqində olubdur hamı divanə, Hüseynim.

Sən nuri-Xudasən, şəfəqin aləmə nemət,
Qanındı sənin taci-nübüvvətdəki ziynət.

Sən "Qalu bəla"də götürüb cami-şəhadət,
Oldun nə ki, var qəmlərə biganə, Hüseynim.

Dünya səmərindən uca tutdun bu cəfani,
Sən çəkmək üçün gəlmədin aləmdə səfani.
Təlqin elədin ümmətüvə sidqü vəfani,
Etdin əməl əhdindəki peymanə, Hüseynim.

Şeyx Əbdül Mahmudbəyli "Hacı Soltan axundun 40 illik yubileyi şərəfinə" yazdığı məqalədə sözdən bəhs açır Füzuli kəlamına müraciət edir və Hacı Soltana müraciətlə yazır: "Mənim məslək və əqidə qardaşım! Sən özün də İlahi rizasilə bu müqəddəs kəlamların, sözün, yazının və dilin bətnindəsən. Sən özün də bu müqəddəsliyi yazan, yaradan, kamilləşdirən və təbliğ edən söz, dil, yazı və qələm əhlisən. Rəbbimiz sənin kimi insanları xəlq etməklə həm dünyamızı, həm də insanları pis, bəd, məkrli və xəyanətkar əməllərdən qorumaq üçün yaradıb..." (sms.səh. 98).

Kitaba daxil edilmiş "Aşura növhəsi" adlı bəhri-təvil də maraq doğurur. Hacı Soltanın bir şair kimi şeirimizin bir çox janrlarında məharət göstərdiyinin şahidi oluruq.

Həzrəti Abbasa (ə), Əli Əkbərə (ə), Cənabi-Zeynəbə (ə), Səkinəyə (ə), Qasimə (ə), Leylayə (ə), Rübabə (ə), İmam Zeynalabidinə (ə), İmam Rzaya (ə), İmam Həsənə (ə), İmam Məhdiyə (ə) həsr edilmiş əsərlərdə də şairin məhəbbəti, hüsn-rəğbəti, eyni zamanda İslam tarixi ilə bağlı elmi, savadı diqqəti çəkir. Bu əsərlərdə müəllif insanları Əhli-beyt (ə.m.) kimi dözümlü olmağa, dünyaya görə axirəti satmama-

ğa çağırır. Hacı Soltanın bütün dini şeirlərində islami dəyərlərin təbliğini görürük. Aydın Hüseynzadə “Axund Hacı Soltan” adlı məqaləsində yazır: “Hacı Soltan İslam mübəlliği kimi ümdə vəzifəsini onda görür ki, İslamı, onun adət-ənənələrini müasirləri arasında geniş yaysın. Qurandakı dərin mənaları bütün çalarları ilə adamlara elə çatdırsın ki, dedikləri ürəklərə təsir etsin, eşidənləri düşündürsün, onların mənəvi aləminə bir saflıq, təmizlik gətirsin, hamını pis əməllərdən, Allah-təalanın qadağan etdiyi əməllərdən uzaqlaşdırsın” (sms. səh.290).

Şair “Ğafilləri məzəmmət” adlı şeirdə yazır:
Ğafil, şühəda qanınə məna nə bilirsən?!
Gülzari-Hüseyn, qönçeyi-rəna nə bilirsən?!

Bu Kərbübəla dəşti deyil hər kəsə meydan,
Çün xuni-Xudadır yerə bu cari olan qan.
Oğlun qana olmub Əli Əkbər kimi ğəltan,
Sən ahü nəva, matəmi-Leyla nə bilirsən?!

Kitaba daxil edilmiş Allah-təalaya, on dörd məsuma və onların övladlarına həsr edilmiş əsərlərdən əlavə Əmir Muxtara (ə), Ayətullah Seyyid Məhəmməd Baqir Həkiminin şəhadətinə və ümumi Kərbəla müsibətinə, islami dəyərlərə, vətənə, şəhidlərə həsr edilmiş əsərlər də təqdirəlayiqdir. “Vətən şərqisi”ndə müəllif yazır:

Hər zaman rahi-Vətən rahi-şəhadətdi mənə,
Ölə bilsəm onun uğrunda, səadətdi mənə.

Cümlə möminlərə aləmdə vüqardır bu Vətən,
Hər zaman sadiq olan dildə şüardır bu Vətən.
Həmi sərvət, həmi dövlət, həmi vardır bu Vətən,
Vətənin sevgisi dünyada şərafətdi mənə.

Müəllif kitabın sonunda yazır: "Hörmətli oxucu! Növhə ədəbiyyatımızın və qədim islam mədəniyyətinin ayrılmaz hissəsi olduğundan heç bir müsəlman bu şeir növünə və növhələrin istifadə edildiyi dini mərasimə biganə qala bilməz. Bu gün tarixi mövzuda yazılan hər bir əsər əslində tarixi keçmişimizi arayıb-araşdırmağa edilən cəhd və dahi tarixi şəxsiyyətlərimizə olan məhəbbətin təzahürüdür. Mənim də bu mövzuda qələmə aldığım şeirləri qəlbimin harayı və məhəbbətimin, sevgimin nümunəsi kimi qəbul etməyinizi istərəm" (səh. 134).

Sonda Sofu Bilanın Hacı Soltana yazdığı və İmam Hüseynə işarə etdiyi məsnəvisini veririk:

Allahın adıyla götürdüm qələm,
Yəni ki, fikrimi şərh edə biləm.
Möminlər Allaha itaətkardır,
Könlümdə birinin şah yeri vardır.
Mən ondan öyrəndim xeyli hikməti,
Daha çox anladım çox həqiqəti.
Allahın adıyla doldum, bəzəndim,

İslami eşq ilə hey tazələndim.
Rəbbinin eşqiylə doludur o şəxs,
Rəbbi öz sevgisin etmiş ona bəxş.
Hacıdır, qazidir, həm də şairdir,
Cəmi fəallığı dinə dairdir.
Allahın Quranı, Rəsulun yolu,
Həqiqət yoludur, nur ilə dolu.
İmamlar höccətdir sonluğa qədər,
Başqa yol küfrdür, sonluğu kədər.
Allahın elmiylə ucalan kişi,
İslamı tərənnüm etmək vərdişi.
Ona qüvvət verir, güc verir müdam,
Həm yaxşı mömindir, həm yaxşı adam.
Özünü **Hüseyn**ə eyləyən fəda,
O, Hacı Soltandır, o Əlizadə.
Elmdə, helmdə başda durandır,
Qəlbində Allahdır, əldə Qurandır.
Çox zaman gözündən ataraq xabı,
Yazıbdır gör neçə dini kitabı.
Yorulmaq bilmədən gəzib elləri,
İslama döndərib çox könülləri.
Dərvişləri, şairləri tapıbdır,
Toplayaraq gözəl kitab yapıbdır.
Hüseyni mədh etmək onun arzusu,
Bu adla qaynayır gözlərində su.
İmamın eşqiylə gəlib ərsəyə
Neçə poemalar, növhə, mərsiyə.
Özü halal adam, yolu müqəddəs,

Mənim diqqətimi çəkməyib əbəs.
Onun yazdığı tək yaza bilsəydim,
Kərbəla işini yoza bilsəydim,
Yəqin ki, özümü sayardım xoşbəxt,
Hüseyni sevməyən bədbəxtdir, bədbəxt.
Mən Soltanı xoşbəxt hesab edirəm,
Mən də haq yolunu tutub gedirəm.
İnsan gərək öz Rəbbini hey ansın,
Bu eşq ilə Soltan kimi hey yansın.
Üz tutub göylərin tək sahibinə,
Ondan rica etdim mən dönə-dönə.
Bu Hacı Soltanın olsun köməyi,
Çox yaşatsın, artsın halal əməyi!
Bu kişi cənnəti qazanıb, məncə,
Ondan uzaq olsun əzab, işkəncə!
Sofunun duası müstəcəb olsun,
Siz də deyin: Olsun, çox əcəb olsun!

15.10.2008.

## 22.QARABAĞ AZAD OLAN GÜN

2006-cı ildə "Ozan" nəşriyyatı Hacı Soltanın "Qarabağ azad olan gün" adlı iyirmi üçüncü kitabını çapdan buraxmışdır. Kitabın redaktoru Arif Əşrəf Buzovnalıdır.

Kitab "Münacat"la açılır. Şair yazır:

Ya Rəb, məni xar eyləmə insan qabağında,
Göstərmə günahkar məni dövran qabağında.
Ən ali kəlamdır bizə göndərdiyin hər söz,
Qurandı silah möminə şeytan qabağında.
Dünya Əlisiz qaldı bu ondandı yəqin ki,
Kafərlər at oynatdı müsəlman qabağında.
Ya Rəb, bilirəm bir gün olar vəslinə imkan,
Əyməz məni qəm möhnəti-hicran qabağında.
Səndəndi nicat aləmə mən zərreyi-ələm,
Xövf eyləmərəm Nuh kimi tufan qabağında.
Bir ondan ötür ruzini kəm eyləmə, ya Rəb,
Ev sahibi xar olmaya mehman qabağında.
Öz nəfsimə güc gəlməyə yardım et, ilahi,
Ağ olsun üzüm həşrdə divan qabağında.
Güc ver bizə, üsyan eləyək zülmə Hüseyn tək,
Şahim necə durmuşdusa üdvan qabağında.
Olsun Qarabağ torpağı azad bizə yar ol,
Başlar sinəyə enməyə düşman qabağında.
Soltan səni səslər yenə, imdadə yetiş ki,
Qalxanə dönək Azəribaycan qabağında.

Kitaba daxil edilmiş “Odur”, “Dəvətlə gəldim”, “Allahə görə”, “Allahı tanı”, “On dörd”, “Tələs”, “Tələsmə” kimi şeirlərdə şair Allaha olan inamını, sevgisini, hər işi Allah xatirinə görməsini, On dörd məsuma (ə.m.) olan münasibətini obrazlı şəkildə oxuculara çatdırır.

Kitabda Peyğəmbərə (s) və qızı Fatiməyə (s.ə), imamlara (ə.m.) və onların övladlarına, ümumilikdə islami dəyərlərə həsr edilmiş bir-birindən maraqlı əsərlər Hacı Soltanın Əhlibeytə (ə) olan dərin sevgisini açıqlayır.

Kitabdakı vətənpərvərlik mövzusundakı şeirlərdə vətənə, xalqa, millətə məhəbbət, torpaq təəssübkeşliyi diqqəti çəkir. Şair “Qarabağ marşı”nda yazır:

Biz səninçün can verməyə hazırıq,
İsmətimiz, vüqarımız Qarabağ.
Yad əllərdə əsarətin çox çəkməz,
Qələbədir şüarımız, Qarabağ!

Şairin sonda dediyi “Ya əvvəlki yurd yerimiz olacaq, Ya olacaq məzarımız Qarabağ”, eləcə də vətənpərvərlik mövzusunda qələmə aldığı digər şeirlərindəki “Hacı Soltan “Asılar şanlı vətən bayrağı əlbət Şuşada”, “Vətən olmazsa, bilinməz bəşərin ünvanı”, “Soltan, tutub üz Xaliqə sən eylə duanı, Səhman edəcək O ulu ustad Qarabağı”, And yeridir Soltanın, Hazırdı verə canın. Qəbul et bu qurbanın, Azərbaycan bayrağı”, “Vətən övladına güvənir vətən, Biz bir olaq, Azərbaycan yaşasın”, “Namusdur, vicdandır, vüqardır vətən”, “Olacaq xalqıma bayram Qarabağ azad olan gün” kimi misralar insanları vətən uğrunda mübarizəyə səsləyir. Şair Ənvər Nəzərli “Ziyalı din xadimi, tədqiqatçı, şair” adlı mə-

qaləsində Hacı Soltanın həyatından, dini fəaliyyətindən, tədqiqat işlərindən və poeziyasından söz açır, “Qarabağdır” rədifli qəzəlindən sitat verərək şairin duyğularını belə dəyərləndirir: “Hacı Soltan qarabağlı deyil, zəngəzurlu da deyil. Hacı Soltan vətənpərvər azərbaycanlıdır. O azərbaycanlı ki, sinəsində düşmənə nifrət, torpağa, yurda məhəbbət gəzdirir. Bu isə sevən, ağlayan, inildəyən bir ürəkdir – kövrək Hacı Soltan ürəyi” (sms. səh. 193).

Yazımızı Nazim Salaminin Hacı Soltana ithaf etdiyi bir şeirlə bitiririk:

Həyatda xeyirxah əməllərinlə
Hamının gözündə ucaldın, Hacı,
Sən elin, obanın qədrini bildin,
Bu yolda Tanrıdan güc aldın, Hacı.

Mərama çatmayır cahil olanlar,
Öyüd-nəsihəti eşitməz onlar.
Ləlin xiridarın tapıb sorarlar,
Elmdə, sənətdə iz saldın, hacı.

Dünya boşalacaq, dünya dolacaq,
Söz mülkü cahanda hakim olacaq.
Şam əgər yanırsa, o yaşayacaq,
Ömrünü şam edib sən yandın, Hacı.

Yazıb-yaratmaqdır eşqin, həvəsin,
Ötsün qumri kimi hər zaman səsin.
Özünə, ailənə ziyan dəyməsin,
Görsünlər yüz yaşda qocaldın, Hacı.

# 23.HƏZRƏTİ-ƏLİ (ə) VƏ AZƏRBAYCAN

Hacı Soltanın "Həzrət Əli (ə) və Azərbaycan" adlı iyirmi ikinci kitabı 2006-cı ildə "Ozan" nəşriyyatında çap edilmişdir. Kitabın redaktoru Arif Əşrəf Buzovnalı ön sözdə yazır: "Öz böyüklüyünü dərk edən xalq yenilməzdir. Azərbaycan xalqının yenilməz xalq olması üçün sadəcə öz kimliyini bilmək, tarixini mənimsəmək kifayətdir. Bu baxımdan, Axund Hacı Soltan Əlizadənin "Həzrəti-Əli (ə) və Azərbaycan" kitabı çox maraqlı və təqdirəlayiqdir. Müəlllif çox müxtəlif mənbələrdən istifadə edərək, İmam Əli ibn Əbu Talib (ə) və Azərbaycan bağlılığı ilə yanaşı etnoqrafik məqamlara da toxunmuş, hadisələri tarixi abidələrlə uzlaşdıraraq ilk baxışda pərakəndə, amma diqqət kəsildikdə ümumi xətt üzrə yüksələn zəncirvari silsilə şəklində bir əsər meydana çıxarmışdır. Müəllifin qayəsinin Azərbaycançılıq olduğu barizdir" (səh. 3).

Hacı Soltanın "Həzrəti-Əli (ə) və Azərbaycan (tarixi-etnoqrafik məlumatlar və şərhlər)" adlı yazısı Qurani-Kərimin "Məryəm surəsinin 96-ci ayəsi ilə başlayır: "Həqiqətən, iman gətirib yaxşı işlər görənlər üçün Allah (ürəklərdə) bir sevgi yaradacaqdır. (Allah həm özü onları dost tutacaq, həm də onların məhəbbətini möminlərin qəlbinə salacaqdır). Sonra müəllif Füzuli şeirinə müraciət edir:

...Əli dəxalət edər kainatın işlərinə,
Buna icazə veribdir o Xaliqi-Subhan.
Bu varlıq aləmi tutmazdı öz yerində qərar,
Onun vilayətinə bağlı olmasaydı cahan.

Hacı Soltan müxtəlif xarici ölkələrdə Həzrəti-Əlinin (ə) adı ilə bağlı ziyarətgahlardan və digər mədəniyyət abidələrindən söz açaraq, alim və şairlərin fikirlərindən də sitatlar verir, "Amma buna baxmayaraq, Azərbaycan Əli (ə) ilə bağlı yer və abidələrin sayına görə digər ölkələrdən heç də geri qalmır və əksinə bəlkə daha irəlidədir. Azərbaycanda da müxtəlif abidələr dövründən və memarlıq üslubundan asılı olmayaraq bu və ya digər şəkildə Əlinin (ə) və onun övladlarının (ə.m.) adı ilə vəhdətdədir. Qısa olsa da bir neçəsini qeyd edirik" yazır və məsumlarla bağlı bəzi ocaqların adlarını sadalayır (səh. 12).

Kitaba daxil edilmiş "Abu-zərə (Abi-dərdə) türbəsi", "Sığdaş məscidi", "Ata otağı", "Daşdan çıxan su", "Çinar piri" adlı ayrı-ayrı yazılardan oxucular dəyərli məlumatlar ala bilirlər.

Kitabda verilmiş bir çox əfsanələr, rəvayətlər, dastanlardan parçalar və s. müəllifin fikirlərinin daha aydın qavranılmasına kömək edir. Xalq yazıçısı Əzizə Cəfərzadə "İslam mədəniyyətinin carçısı" adlı məqaləsində yazır: "Hacı Soltan ruhanidir, axunddur. Onun dini ədəbiyyat, islamiyyətin yetmiş il bəlalı sovet dövründə zorla xalqa, millətə unutdurulan ədəbi haqqında kitablar yazması heç də təəccüb doğurmaz və doğurmur da. Həm də bu kitablarda Hacı Soltan gəncliyinə baxmayaraq, çox sadə, anlaşıqlı dildə dinin elə mürəkkəb qayda-qanunlarını, tarixini, şəxsiyyətlərini işıqlandırır ki, bu gün millətə bu çox lazımdır və zəruridir. Hacının çıxışları da öz dərin məzmunu, genişliyi, tam müasirliyi dinləyiciləri razı salır demək azdır, çox şey öyrədir. Bunlar hamıya məlum həqiqətlərdir" (sms. səh. 29).

Müəllif kitabın maraqlı olması üçün arada müxtəlif şair-

lərin şeirlərindən istifadə etmişdir: İbn Ərəbi, Nəbahani, Fərəzdəq, Dibil Xizai, İmam Rza (ə), Şafi, Seyyid Həmiri, Höccətül-islam Nəyyir Təbrizi, Həssan ibn Sabit, Həmzeyi-Seyyidüş-şühəda, Əmmar Yasir, Hücr ibn Ədi, Mühyəddin Həfsəni, Qərib, Həqir, Rumi, Əbu Nüvas, Seyyid Yəhya Bakuvi, Nizami Gəncəvi, Aşıq Alı, Qurbani, Füzuli, Nəsimi, Xətai, Sultan Süleyman Qanuni Mühibbi, Qazi Bürhanəddin, Məhvəşi, Ümmi Sinan, Nakam, Ağa İsmayıl Zəbih, Üryan, Şəhriyar, Həkim Hidəci, Miskin Abdal, Qul Hümmət, Qumri Dərbəndi və laədri.

"Ətrafa və özünə nəzər" adlı yazıda Rum surəsinin 42-ci ayəsi, "Nəhcül-bəlağə"dən İmam Həsənə (ə) vəsiyyət, Əlinin (ə) Divanından parça verilmişdir.

"Həzrəti-Əlinin qeybindən xəbər verməsi", "Həzrəti-Əlinin Müaviyənin qələbəsi və zülmlərindən xəbər verməsi", Həzrəti-Əlinin döyüşdən əvvəl Zus-Sədiyyənin öldürülməsini xəbər verməsi", "Həzrəti-Əlinin öz qətlini xəbər verməsi və İbn Mülcəmi tanıtması" kimi yazılarda Həzrətin lədünni elm sahibi olduğunu bizə sübut edən müəllif "Ərşi-Əlada Allah və Peyğəmbərin (s) adından sonra Əlinin (ə) adının yazılması" adlı yazıda bir daha onun məqamının yüksək olduğunu vurğulayır.

Hacı Soltan Həzrəti-Əlinin (ə) Divanından "Keçmiş şahların, sultanların vəsiyyəti"ni, "İmam Zaman ağanın (ə) duası"nı və şeirlərini də təqdim etmişdir. "İmam Əlinin (ə) kəlamlarından", "İmam Əli (ə) meracda Peyğəmbər (s) ilə birlikdə idi", "Bizdən başqa digər planetlərdə (ulduzlarda) yaşayış varmı", "İmamın fəziləti və sifəti ilə xüsusi əhatəli bir fəsil", "İmamlar Yerin təməlləridir", "İmamət", "Xəlifəni, imamı

"kim təyin etməlidir" və s. yazılarda həm müəllifin, həm də müxtəlif alimlərin dəyərli fikirləri ilə tanış oluruq.

"Hindistanda Əli (ə) məktəbini yaradan azərbaycanlılar olub" adlı yazıda Hindistanda İslamı yayan məşhur azərbaycanlılardan söz açan tədqiqatçı bu işdə səfəvilərin, o cümlədən Xətainin rolunu yüksək dəyərləndirir.

Kitabda verilən "Həzrəti-Əlinin (ə) Azərbaycan hakiminə göndərdiyi məktub", "İmam Əli (ə) Azərbaycan şairi Şəhriyarı çağırır", "Şiələrə görə İmam Əli (ə)", "İmam Əli (ə) adı ilə bağlı nələr var" adlı yazılarda da müəllif Azərbaycan tarixinin qaranlıq guşələrinə çıraq tutaraq, oxuduqlarını, eşitdiklərini analiz edib, fikirlərini oxucularla bölüşmüşdür. Burada tarixçi akademiklərdən Nailə Vəlixanlının, Məşədi xanım Nemətin dəyərli əsərlərindən də istifadə edilmişdir.

Hacı Soltan həm bir din xadimi kimi, həm də peşəkar tədqiqatçı kimi daim oxuculara yeni bir məlumat çatdırmağı sanki özünə borc bilir. Ömrünü yeni məlumatlar, elmi dəyərlər axtarışına həsr edən tədqiqatçı oxucu gözündə kitabdan-kitaba bir mərtəbə ucalır. Şeyxülislam Allahşükür Paşazadə "Gözəl insan, böyük alim, nəcib şəxsiyyət" adlı məqaləsində yazır: "Bu bir həqiqətdir ki, həyat adlanan zaman kəsiyində hər bir bəşər övladı yalnız öz istedadı, bacarıq və zəhməti sayəsində müəyyən məqama, layiq olduğu yüksəkliklərə ucala bilir, ad qazanır. Bu mənada, elm, din xadimi olmaq şərəfli qismətdir.

Parlaq zəka sahibi olan Hacı Soltan bütün mənalı ömrünü ürfan elminə, yaradıcılığa həsr etmişdir. o, nadir fitri istedada malik din xadimi olmaqla yanaşı dəyərli elmi-ədəbi əsərlərin müəllifi kimi də tanınır" (sms. səh. 5).

Kitaba İbn Sinanın, Hafiz Şirazinin, Ğiyaməli Şəbaninin, Xətainin, Möhtəşəm Kaşaninin, Əbdülxalıq Cənnətinin, Hacı Mailin, Hacı Baba Pünhanın, Mirzə Mahmud Şirvaninin, Dilsuz Təbrizinin, Aşıq Valehin, Qasım bəy Zakirin, Fatimə xanım Kəminənin, Heyran xanımın, Pir Sultan Abdalın və başqalarının Həzrəti-Əli (ə) ilə bağlı şeirləri də verilmişdir. Kitaba ara-sıra ayələr, hədislər, dualar da daxil edilmişdir.

Bütün bunlar Hacı Soltanın nə qədər geniş axtarışda olduğunu, kitabın ərsəyə gəlməsində çəkdiyi zəhmətin nə qədər böyük olduğunu açıqlayır.

Kitabdakı “Üş göy məscid” adlı diqqəti çəkən yazıda Bakıda, Təbrizdə və İrəvanda olan dini ocaqlardan bəhs edilmişdir.

Kitabda Qarabağla bağlı yazılar da yer alır. Hacı Soltanın “Xocalı” şeiri, Həsən İxfa Əlizadənin “Şuşa şəhərinin tarixi” əsərindən verilən maraqlı məlumatlar da maraq doğurur.

“Abbasilər xilafəti dövründə öz şeirləri ilə Əhli-beyti (ə.m.) vəsf edən bəzi şairlər haqqında” adlı yazıda Seyyid Himyəri, Əbu Nüvas, Əbül-Ətahiyə, Əbu Təmmam, Dibil Xüzai, Səlvi, İbn Ər-Rumi kimi şairlərin həyatı haqqında dəyərli məlumatlar alırıq.

Bir sıra yazılardan sonra müəllifin yenə də Həzrəti-Əliyə (ə) qayıtdığının şahidi oluruq. “Yenə də Həzrəti-Əli (ə) barəsində”, “İmamın bəzi xüsusiyyətləri”, “İmam Əlinin kəlamlarından, “Günaha mane olan məhəbbət” kimi yazıları oxuyuruq. Bildiyimiz kimi, kitabın 112-ci səhifəsində də “Həzrəti-Əlinin (ə) kəlamlarından” adlı yazı vardır. Yenidən 347-ci səhifədə eyniadlı yazını verməkdənsə, həmin kəlamları birləşirib bir yazıda vermək olardı. Ümumiyyətlə, kitabda

bir xaos hökm sürür, digər kitablara nisbətən burada sistemsizlik daha qabarıq hiss olunur ki, bu da yazıların çoxluğundan və rəngarəngliyindən irəli gəlir. Müəllif hər şeydən danışmaq istəyir. “Birini qoyub, birini götürür”, bütün bildiklərini, eşitdiklərini, oxuduqlarını oxucuya çatdırmağa çalışır.

Yenə də ziyarətgahlara, məscidlərə qayıdan Hacı Soltan bir çox dəyərli abidələrdən söz açır. Burada “Məqami-İbrahim”, “Bəqi qəbristanlığının mütəhhər qəbirləri”, “Şühədayi-Ühüd qəbristanlığı”, “Mədinə məscidləri, “Nəcəfdəki Vadis-səlam qəbristanlığı”, “İmam Sadiq məqamı”, “İmam Mehdi məqamı” və s. haqqında məlumat alırıq. Eyni zamanda ziyarət etdiyimiz bəzi məqamlar bizi xəyalən həmin yerlərə aparır.

Yenə də Həzrəti-Əliyə (ə) qayıdan müəllif “Əlinin (ə) təvəllüdündən sonra”, “Əlinin (ə) imaməti”, “Əlinin (ə) şəhadətindən qabaq dedikləri”, “Əlinin (ə) bəzi fəzilətləri”, “İmam Sadiqin (ə) zamanına qədər Əlinin (ə) qəbrinin gizli qalması”, “Əlinin (ə) məzarının ilk çağları”, “Əlinin (ə) evi”, “Əlinin (ə) ziyarətgahı”, “Nəcəf Dini Elmlər Akademiyasının tarixi”. “Əlini (ə) ziyarət etməyin fəzilətləri”, “Əlinin (ə) ziyarətnaməsi” və s. yazılarda Həzrətin haqqında maraqlı məlumatlar öyrənmək olur.

Müəllif burada “Hənnanə məscidi”, “Hindi məscidi”, “Kaşiful-Ğita Nəcəfdə”, “Nəcəfdəki şiə alimlərinin və məşhur şəxsiyyətlərin məzarları”, “Nəcəfül-əşrəfdəki məscid və elmi mədrəsələr”, “Kufənin coğrafiyası və tarixi”, “Kufə məscidinin əməlləri”, “Əlinin (ə) mehrabı” kimi yazılar da Həzrəti-Əli (ə) haqqında fikirlərin genişlənməsinə, dərinləşməsinə, inkişaf etdirilməsinə imkan yaradır. Dəfələrlə gəzdiyimiz

ziyarətgahlar haqqında oxumaq adama maraqlı gəlir, həmin yerləri bir də xatırlayırsan, kino lenti kimi göz önündən gəlib keçir.

Hacı Soltan kitaba "Suriyanın Dəməşq şəhərində dəfn olunan müqəddəslərin ziyarətgahları"nı da daxil etmişdir.

Doğma kəndinə çox bağlı olan Hacı Soltan kitaba "Buzovna kəndinin məscidləri və onların müxtəsər tarixi", "Buzovnadakı məscidlərin və ziyarətgahların fəaliyyətində "İmam Rza (ə) Məşhədi-Qərib" məscidinin rolu", "Buzovnanın müqəddəs türbələrinin kitabələrindəki yazılardan" adlı məqalələrini də daxil etmişdir.

Qafqaz Müsəlmanlarının XI qurultayında "Müasirlik və milli-mənəvi dəyərlər" mövzusunda elmi-praktik konfranda Hacı Soltanın çıxışı olan "İslami dəyərlər və Azərbaycan poeziyası" adlı yazıda klassiklərimizin Quran, hədislər, məsumlar, din və elm haqqında fikirlərinin təhlili və şərhi də maraq doğurur. Kitaba Hacı Soltanın "Danış", "Əli kimdir", "Əlidir dövlətü varım", "Əli", "Əlidir" və s. şeirləri daxil edilmişdir.

Sonda zəngin ədəbiyyat siyahısı verilmişdir.

Yazımızı Rüstəm Hacıyevin Hacı Soltana həsr etdiyi olduqca siqlətli, gözəl bir şeiri ilə tamamlayırıq:

Minbər yenə nurlandı xurşidi-məlahətdən,
Vaizlərə naz satdı hər dəm bu şərafətdən.

Ol nur şədid oldu, aləmdə pədid oldu,
Aləm də cədid oldu ol feyzi-lətafətdən.

Soltan Əlizadə, çox ünlü və çox sadə,
Ömr eyləyir azadə bu köhnə imarətdən.

Ey başımızın tacı, minbərdə gühər Hacı,
Canlar gühərin acı, sən sir səxavətdən.

Ey aqilü fərzanə, ey aşiqi-divanə,
Huşyar, həmi məstanə, bəlli bu əlamətdən.

Sirr idi, əyan oldu, soltani-zaman oldu,
Aşkarda nihan oldu, qurtuldu əsarətdən.

Ol aşiqi-pabəstə, Soltani-dili-xəstə,
Təxt etdi həsir üstdə, tac qoydu qənaətdən.

Ol dürrfəşan natiq, ol nitqi rəvan natiq,
Ol eyni-bəyan natiq bas aldı bəlağətdən.
Can gülşəninə girdi, hər səcdədə gül dərdi,
Ta durdu xəbər verdi qəddilə qiyamətdən.

Minbərlər ona həsrət, ol nitqə qoyub minnət,
Qüdrət var isə əlbət dərs almış imamətdən.

Zehnində **Əli** fikri, nitqində Əli zikri,
Həm ismi-Əli şükri, varmı bu kəramətdən?

Çatdı səsi hər yanə, Bağdadü Xorasanə,
Bəxş oldu bu dövranə dövrani-vilayətdən.

Rüstəm gəlib ilhamə, sətr eylədi bir namə,
Heyrətdə qalıb xamə təbriki-vilayətdən.

## 24.KÜRDƏXANI

Hacı Soltanın "Kürdəxanı" adlı iyirmi dördüncü kitabı 2008-ci ildə "Qarabağ" nəşriyyatında işıq üzü görmüşdür. Kitabın şərik tərtibçilərindən biri də Hacı Casim Əlisöhbət oğlu Muxtarovdur. Kitabın annotasiyasından məlum olur ki, kitab onun təşəbbüsü ilə hazılanmış və sponsorluğu ilə nəşr olunmuşdur. Kitabın redaktoru Hacı Arif Buzovnalı, elmi məsləhətçiləri şair Kərbəlayi Ənvər Nəzərli, akademik Vasim Məmmədəliyev, professor Nisəxanım Ağayeva, mayor Abbasqulu Abbasquluyev, doktor Aydın Əlizadədir. Kitabda gedən materialları Məşhədi Qasim Əlisöhbət oğlu Muxtarov və Nazim Nəcəf oğlu Quliyev toplamışdır.

Kitab Hacı Soltanın "Bəsirət əhli görür" adlı ön sözü ilə açılır. Kürdəxanı ilə yaxın əlaqələri olduğunu, Əlisöhbət kişi ilə dostluğunu diqqətə çatdıran müəllif dini dəyərlərdən söhbət açır və Həzrət Əlidən (ə) sitat verərək, kitabın yazılma məramına gəlib çıxır, təşəbbüsçünü təqdim edərək yazır: "... Bu gün Kürdəxanı haqda tərtib olunan bu kitabın da təşəbbüskarı və hamisi Hacı Casimdir. O, mənə belə bir kitabın yazılmasının vacibliyini bildirib, mənim ona köməkliyimi xahiş edəndə çox sevindim. Elinə, obasına, tarixinə, dininə bağlı insan həqiqətən də böyük insandır. Bu kitabın tərtibində, əlbəttə, müəyyən qüsurlar, nöqsanlar olacaqdır. Çünki bu, Kürdəxanı haqqında tərtib olunan ilk toplu, atılan ilk addım və görülən ilk təşəbbüsdür. Ümidvaram ki, bu kitab Kürdəxanı haqda yazılan gələcək əsərlər üçün ilk qaynağa çevriləcək və bu mənbədən oxucular istifadə edib faydalanacaqlar" (səh. 4-5).

Növbəti yazı tarixçi Təvəkkül Səlimovun "Kürdəxanı həqiqətləri" adlı yazısıdır ki, kürdəxanılı şair Dadaş Vasifin bir beyti ilə başlayır. Kürdəxanı kəndinin tarixi, coğrafi, iqtisadi, mədəni səciyyəsini verən müəllif kəndi iki min il yaşı olan qədim yaşayış məskəni kimi təqdim edir, arxivlərdən əldə etdiyi elmi məlumatları oxucuların diqqətinə çatdırır.

Professor Nisəxanım Ağayevanın "Bıçaqçı yolu", Kərbəlayi Ənvər Nəzərlinin "İgidlər, qəhrəmanlar məskəni" adlı yazılarında da bir sıra tarixi faktlar açıqlanmışdır. Ümumiyyətlə, hər üç müəllifin məlumatlarında səhvlər olmasına baxmayaraq, hər halda hər kəs bildiyi qədər danışa bildiyindən, bunları məqbul hesab etmək olar.

Kitabın növbəti məqaləsi Hacı Məhəmmədəlinin "O hamımızın dostu idi" adlanır ki, burada kürdəxanılılar haqqında maraqlı xatirələr yer almışdır.

Kitaba tarixçi Əli Əsgərzadənin, Əlyazmalar İnstitutunun sabiq direktoru Məmməd Adilovun, Balaəli Vəliyevin, İdris Əliyevin, Abbasqulu Abbasquluyevin, Vəli Həbiboğlunun, Hacı Hafiz Sadıqovun, Müşfiq Zeynalovun, Səftər Sultanovun, Məşhədi Quluməmmədin, Çırağəli Balağa oğlunun, Məşhədi Elşad Nərimanın, Hacı Ağayar və Hacı Əlibalanın, N.Bədəlovun, Rüstəm Tofiqin, Əliyyənin, Hənifə Kərbəlayi Əmiraslan oğlunun, Şahbazova Böyükxanım Eyvaz qızı və Şahbazov Hüseyn Eyvaz oğlunun, Zemfira Rzayevanın, Hacı Casimin, Şeyxülislam Hacı Allahşükür Paşazadənin, Hacı Arif Buzovnalının yazıları da daxil edilmişdir.

Hacı Soltan "Əli (ə) aşiqi və Hüseyn (ə) əzadarı" adlı yazısını belə başlayır: "Məndən soruşsaydılar ki, bir müdrik

alimin nümunə üçün adını bizə nişan ver, o zaman da Əbu Əli ibn Sinanın, Şeyx Bəhaəddin Amulinin adlarını bildirərdim.

Məndən soruşsaydılar ki, bir mütəfəkkir dahi şair adı nişan ver, o zaman Nizami Gəncəvinin, Məhəmməd Füzulinin adlarını bildirərdim.

Məndən soruşsaydılar ki, bir vaizin, hikmət sahibinin adını nişan ver, o zaman Əbazər Qəffarının, Bəhlul Danəndənin adlarını bildirərdim.

Məndən soruşsaydılar ki, bir mömindən bizə soraq ver. O zaman öz zəmanəmizin nurani şəxslərindən olan Dərviş Əlisöhbət Kürdəxanılını və Hacı Həbib Əbdüləhəd oğlunu nişan verərdim" (səh. 203).

Kitabda Kürdəxanı kəndinin alimləri, şairləri, sənətçiləri, ağsaqqalları, şəhidləri, xeyriyyəçiləri haqqında maraqlı məlumatlar toplanmışdır. Müəllif hər bir şəxsiyyət haqqında yazarkən onu digər insanlara örnək ola biləcək insan kimi təqdim edir. Sanki bu insanlar haqqında yazmaq təkcə onları tanıtmaq üçün deyil, həm də oxucuları bu əqidədə, bu xarakterdə tərbiyələndirmək üçün lazım imiş. Hacı Soltan həmişə buna çalışır və insanlara, xüsusən də gələcək nəslə elmi, dini dəyərlərlə birgə həm də tərbiyə verməyə nail olur. Akademik Ziyad Səmədzadə "Möminlik insanlığın tacıdır" adlı məqaləsində yazır: "Daha bir vacib məsələ isə el içində, məclislərdə olan insanın savadlı olmağıdır. Çünki cəmiyyətin inkişafı və eyni zamanda bütün sahələrdən yeniliklərin əldə olunması elm və təhsillə sıx bağlıdır. Həmçinin elm və təhsil güclü tərbiyəedici vasitədir. Bu mənada Hacı Soltan öz zəkası,

təfəkkürü, biliyi ilə seçilib və sevilməkdədir.

O daim öz yaradıcılığında milliliklə dünyəviliyin vəhdətinə xüsusi önəm verir, müasir cəmiyyətimizi ayıq-sayıq olmağa, bu gün və sabah miqyasında düşünməyə, keçmişin ibrət dərslərini tam öyrənməklə gələcəyin qapılarını açmağa səsləyir" (sms.səh.46).

Şairlərin şeirlərindən nümunələr, eyni zamanda görkəmli adamlar haqqında müasir şairlərin qələmə aldılğı şeirlər də kitabı zənginləşdirmişdir.

Kitab Hacı Casimin "Kitab haqqında son söz"ü ilə bitir. Müəllif yazır: "Bismillahir-rəhmanir-rəhim! Məni həmişə bir fikir narahat edib. Bu fikir, bu narahatçılıq kəndimin tarixi, bu günü və gələcəyi ilə bağlıdır. Dünyamızın gərgin və mürəkkəb vəziyyətini, insanların bir-birinə qarşı laqeydliyini və inamsızlığını gördükcə düşünürəm ki, görən bizdən sonra gələn nəsil ulu babalarının keçdiyi tarixi yolu, yaratdıqları adət-ənənələri, qoyub getdikləri mənəvi irsi unutmayacaqlar ki?! Və yaxud bu sərvətlərin unudulmaması üçün bizlər nə etmişik və ya nə etməliyik?! Axı, bu kəndin Məşhədi Adilləri, Axund Qasimləri olub, torpaqlarımızı qanları, canları bahasına qoruyublar. Kəblə Hüseynlər kəndin təəssübünü çəkib, Məşhədi Məzahirlər, Məşhədi Hüseynağalar imanları, kişilikləri ilə kəndin iftixar mənbəyinə çevriliblər. Biz onların ənənələrini yaşatmalı, gələcək nəslə çatdırmalıyıq. Ona görə də Kürdəxanı kəndi haqqında bir ensiklopedik toplunun tərtib olunmasını vacib bildim. Allaha şükür ki, dünya halalzadə insanlardan xali deyil. Bu nəcib insanların mənə kitabın hazırlanmasında xeyir-dua verməsi adi təşəbbüsün reallığa

çevrilməsinə səbəb oldu" (səh. 422-423).

Bu kitabın çapı Hacı Soltanın 50 illik yubileyinə təsadüf edir, yubileyə həsr olunmuş şeirlərdən birini burada veririk:

Gəlmişik 50 yaşın təbrik edək Soltanın,
Ömrü təqvayə edən bəxş, gözəl insanın.

Ol qədər qəlbi təmiz, Tanrıya vurğundur ki,
Tanrlı da vermiş ona sözlə dolu ümmanın.

Həm gözəl xadimi-din, həm də gözəl şairdir,
Axtaran tapmaz onun nitqdə bir nöqsanın.

Tədqiq etmiş nə qədər şairi, alimləri o,
Fövtə verməz bir anın əldə olan imkanın.

O hələ yetkin ikən eşqi ilahiyyat olub,
Çox gözəl şərh eləyir ayələrin Quranın.

Qismət olmuş ona ən ülvi ziyarətgahlar,
Ol hidayət yolu ki, pak eləmiş imanın.

Hacı Soltan, sənə Azər diləyir sağlamlıq,
Yüz yaşında bu qonaqlarla olaq mehmanın.

# 25.MƏN ƏLİ (ə) ŞAİRİYƏM

Hacı Soltanın "Mən Əli (ə) şairiyəm" adlı iyirmi beşinci kitabı 2008-ci ildə "Qarabağ" nəşriyyatında çap olunmuşdur. Kitabın redaktoru və ön söz müəllifi Hacı Sara Zairdir. Kitab şairin bir dördlüyü ilə açılır:

Müsəlmanəm, deyirəm: La ilahə illəllah,
Mühəmməd ümmətiyəm, sərvərim Rəsulallah.
Əmanətim Mühəmməd itrəti və Qurandır,
Ağam hər iki cahanda Əli vəliyullah.

Hacı Soltanı Əli aşiqi kimi təqdim edən, onun xarakterik cəhətlərini oxucuların diqqətinə çatdıran Hacı Sara Zair kitaba yazdığı ön sözə belə başlayır: "Axund Hacı Soltan Hüseynqulu oğlu Əlizadə Əli (ə) aşiqi, Əli (ə) məddahı, Əli (ə) nökəri, Əli (ə) şiəsi və Əli (ə) şairidir.

Hacı Soltanın eşqi Əli (ə) eşqi, rəhmi Əli (ə) rəhmi, məktəbi Əli (ə) məktəbi, zikri Əli (ə) zikri, fikri Əli (ə) fikri, yolu Əli (ə) yolu, süfrəsi Əli (ə) süfrəsidir.

Hacı Soltanın niyyəti Əli (ə), diqqəti Əli (ə), məqsədi Əli (ə), söhbəti Əli (ə), özü demişkən "şöhrəti" və "dövləti" Əlidir (ə).

Hacı Soltan Əli (ə) dostudur, Əli (ə) dostlarının dostudur. Bu dostluq dildə deyil, sözdə deyil, əməldə isbat olunmuşdur.

Hacı Soltan Əli (ə) adını təkcə qapısının zəngində, qolunun saatında, üzüyündə, telefonunda yox, ən əsası qəlbində daşımağı bacarır..." (s.4).

“Həbibəllah” adlı qəzəldə Peyğəmbərimizin (s) tərifini verən müəllif burada həm Əlidən (ə), həm Hüseyndən (ə), həm Məhdidən (ə.f) bəhs edir və yazır:

Əliyyəl-Mürtəza meydanıdır bu, Zülfüqar istər,
Əli əhli-həqiqətçün yanan şəmdir, Həbibəllah.

Kitabdakı şeirlərin nəinki özündə, hətta böyük əksəriyyətinin adında Əli (ə) var. Məsələn, “Ya Vəliyullah”, “Ya Əliyyəl-Mürtəza”, “Ya Əmirəl-möminin”, “Vəsiyy”, “Əli (ə)”, “Əlidir”, “Şahım Əlidir”, “Mövla Əlidir”, “Rahi-Əlidir”, “Fikri-Əlidir”, “Ya Əli”, “Əlidən”, “Əli eşqi”, “Əli nuru”, “Əli nəsli”, “Əli vəsfi”, “Əli zikri”, “Əli elmi”, Əli şeiri”, “Əli səbri”, “Əli rəhmi”, “Əli dəsti”, “Əli zərbi”, “Əli adı” , “Əli dostu”, “Əli qəbri”, “Əli şiəsidir”, “Könlümdə Əlidir”, “Növheyi-İmam Əli”, “Şəhadəti-İmam Əli”, “Əli kimdir”, “Əlidir dövlətü varım”, “Əli məktəbidir”, “Əli süfrəsində”, “Əli ayağı”, “Əli yolunda”, “Vilayət”, “Ələvi”, “Ya Mürtəza, ya Mehdi”, “Mən Əli şairiyəm”, Heydəri-Kərrar olsun” və s. əsərləri göstərmək olar. Bir neçə adda hətta bir neçə şeir vardır. Kitabda Əliyə (ə) həsr olunmuş qəsidələr də vardır. “Mömin sayılan hər kəsin ünvanı Əlidir, Təqvadə mükəmməl olanın canı Əlidir”mətləli, “Vird elə Allahı hər an eşqi-davərdən danış, aləmi xəlq eyləyən nuri-münəvvərdən danış” mətləli qəsidələri qeyd edə bilərik. Hacı Sara Zair ön sözdə yazır: “Axund Hacı Soltanın yazdığı şeirlərdə Allah, Peyğəmbər (s), Əli (ə) eşqi, Əhli-beyt (ə.m.) sevgisi daim diqqəti cəlb etmişdir. Elə buna görə də, onun ilahi şeirlərinə çoxsaylı dini sürud qrupları, dərviş və məddadhlar neçə-neçə nəğmə-sürud hazırlamış, musiqi bəstələmişlər” (səh.6).

Kitabdakı mövludnamələr də öz məzmunu, bədii siqləti cəhətdən diqqəti çəkir. Həzrəti-Əlinin (ə) mövludu münasibəti ilə yazılmış bu əsərlərdə də müəllifin Əliyə (ə) olan sonsuz sevgisini, ehtiramını görürük:

Müjdə, ey əhli-müsəlman, Əli dünyayə gəlib,
Yəni dünyadə fəzilət sözü mənayə gəlib.

Bir zaman idi ki, Kəbə evini nur aldı,
"Ya Əli" kəlməsi hər aləmə avaz saldı.
Düşdü bütlər yerə ol dəm hamı pamal qaldı
Ki, Xuda kölgəsi əmr ilə bu məvayə gəlib,
Müjdə, ey əhli-müsəlman, Əli dünyayə gəlib.

Kitaba Nəsimidən, Xətaidən, Füzulidən, Heyran xanımdan, Seyyid Əzim Şirvanidən, Əliəkbər Şahiddən təxmislər, mürəbbə, müxəmməs, müstəzad, bəhri-təvil kimi klassik janrlarda yazılmış əsərlər, Həzrəti-Əli (ə) müsibətini əks etdirən növhələr, Əli (ə) rəşadətini əks etdirən sürudlar, ibrətnamə, ruhiyyə kimi əsərlər və mənzum tərcümələr də daxil edilmişdir.

Müxtəlif janr, forma və şəkillərdə yazılmış bu əsərlərdə bir mövzu vardır: Əli (ə). "Məqamın aləmə darüş-şəfadır, ya Vəliyullah", "Ey adı dillərdə əzbər, ya Əliyyəl-Mürtəza", "Ya Əli" kim söyləsə, Həqdən gələr yüz min nida", "Batinin seyr elə, Qurandan ibarətdi vəsiyy", "Zülfüqar ilə salan aləmi səhmanə, Əli", "Elmi-ürfanı edən aləmə zahir Əlidir", "Xaliqə arif olan kimsə Əlidən dönməz", "Yoxdur Əlidən başqa mədədkar sənə, Soltan", "Küfri eləyən zirü zəbər fikri-Əlidir", "Saçdı nurun Yasinü Taha Əli mövluduna", "Diqqət elə, bil,

eşqi-Xudadır Əli eşqi", "Cümlə nəbiyə oldu xilaskar Əli nuru", "Quranda tapıb ali şərafət Əli nəsli", "Yox özgə işim, fikri-mədarım Əli vəsfi", "Həqqül-yəqini eylədi rəhbər Əli elmi", "Qurandan alır feyzini mütləq Əli şe'ri", "Bil ki, gətirir hər işə səhman Əli səbri", "Xoş ol kəsə qəlbində onun var Əli rəhmi", "Rəhmət dolu dərya kimi çağlar Əli rəhmi", "Etmiş yədi-beyzanı münəvvər Əli zərbi", "Soltan, hara Allah adını yazmalı olsan, Qoy sonda nida, Həqqə nidadır Əli adı", "Batil yuvasın eylər viranə Əli dostu", "Ənvari-cəlidir, Şahi-əzəlidir, Allaha vəlidir, Könlümdə Əlidir", "Heydər, Səfdər, Qəzənfər, Əli, Əli, Əli" və s. dolu misralar Hacı Soltanı həm Əli aşiqi kimi, həm də istedadlı bir şair kimi səciyyələndirir. Şair Ələmdar Mahir "Məntiqə əsaslanan ruhani alim" adlı məqaləsində Hacı Soltanı tədqiqatçı kimi səciyyələndirir, daha sonra yazır: "Şairliyinə gəldikdə isə, Hacı Soltanın yaradıcılığı əsl şair hünərinin təzahürüdür. Şeirlərinin rəngarəngliyi, bəhr müxtəlifliyi bir daha onun istedadlı bir şair olduğundan xəbər verən amillərdir" (sms. səh.54).

Hacı Soltanın "Əli könlümdədir" adlı poeması da kitabda yer alır. Kitabın sonunda verilmiş "Həzrəti-Əli (ə) kimdir", "Həzrəti-Əli (ə) və elm", "Həzrəti-Əlinin (ə) şücaəti", "Həzrəti-Əlinin (ə) qəzavətləri" adlı yazılar da maraqlıdır, oxucuların maariflənməsi üçün dəyərlidir.

Hacı Soltanın Həzrəti-Əli (ə) ilə bağlı bir neçə kitabı vardır. Ona görə də bəzən təkrar əsərlərə rast gəlinir. Hacı Soltan kitabı "Dua" adlı məsnəvi ilə bitirir. Kitabdakı əsərlər haqqında çox danışmaq olar. Hacı Soltanın hər kitabından bir kitab yazmaq olar.

Hacı Soltanın bu kitabı da yubiley ilində çap olunmuşdur.

Yazımızı Fəridə Ləmanın Hacı Soltana həsr etdiyi "Mübarək" adlı təbriknaməsi ilə tamamlayırıq:

Vətən oğlu, üzündə mən nur gördüm,
Sözlərində gövhər gördüm, dür gördüm.
Vallah, səni ocaq gördüm, pir gördüm,
Əlli yaşın mübarəkdir, mübarək!

Mən tanıdım səni uzaq yollarda,
Eşitdim şe'rini qardaş ellərdə.
Adın xoş çəkilir ballı dillərdə,
Əlli yaşın mübarəkdir, mübarək!

Qalaq-qalaq əsərlərin hikmətdir,
Bu ömürdə nələr yazdın, fürsətdir.
Hacı Soltan, yüz də sənə qismətdir,
Əlli yaşın mübarəkdir, mübarək!

Sizdən sayğı gördü Fəridə Ləman,
Həyatda daima olun kamiran.
Qiyməti biz deyil, verəcək zaman,
Əlli yaşın mübarəkdir, mübarək!

24.10.2008.

# 26.QƏDİRXUM HƏQİQƏTLƏRİ

Hacı Soltanın iyirmi altıncı kitabı “Qədirxum həqiqətləri” adlanır. Kitab 2011-ci ildə “Ozan” nəşriyyatında çap olunub, kitabın redaktoru Hacı Arif Buzovnalıdır. Kitab Azərbaycanın milli qəhrəmanı Seyyid Mübariz İbrahimovun və Fəid Əhmədovun unudulmaz xatirəsinə ithaf olunmuşdur.

Müəllif kitabın əvvəlində “Füssilət”, “Kəhv”, Cümə” və “Nisa” surələrindən ayələr vermiş, Allahdan Həzrəti-Əliyə (ə) salavat istəmiş, sonra şeir parçası təqdim etmişdir:

Bu kəlam ilə Rəsul hikmətə qoydu təməli,
Kimə mövlayəm əgər mən, ona mövladır Əli.

Qədiri-Xümmidə buyurdu Nəbi:
Xudanın sizlərdən budur tələbi.
“Fəhaza Əliyyun mövlahu” deyib,
“Bəlliğ” ayəsilə verdi tərəbi.

Kitabın I hissəsi “Həzrəti-Məhəmmədin (s) Qədir-Xum günündə oxuduğu xütbə” ilə başlayır. Xütbənin orijinalı və tərcüməsi verilmişdir. Sonra Qədir bayramında İmam Əlinin (ə) xütbəsi, daha sonra “Qədir-Xum” nədir sualına 55 cavab və ara-sıra əlaqədar şeir parçaları təqdim edilmişdir. Müəllif Qədir-Xum məscidi haqqında yazır: “Bu məscidin qibləyə tərəf sol səmti Rəsulullahın (s) Əlini (ə) canişinliyə təqdim edərkən durduğu yerdir və namaz qılmaq üçün məscidin digər guşələrindən üstündür. Ümumiyyətlə, bu məsciddə namaz qılmağın çox savabı var. Çünki Peyğəmbərin (s) Əlini (ə) xəlifə təyin etdiyi həmin yer haqqın aşkar olduğu yerdir”.

Kitabda maraqlı faktlardan biri də Həzrəti-Əlinin (ə) min adından yüz birinin sadalanmasıdır. "İmam Əlinin (ə) münacatı və onun tərcüməsi, "Həzrəti-Əli (ə) kimdir" sualına 52 cavab da diqqəti çəkir.

"Həzrəti-Əli (ə) və elm" adlı yazıda Həzrəti-Mühəmmədin (s) "Məndən sonra ümmətimin ən elmlisi Əli ibn Əbu Talibdir" və "Allah elmi 10 hissəyə böldü. Əliyə doqquz hissəsini, bütün insanlara bir hissəsini verdi və Əli bu bir hissəni də onlardan yaxşı bilir" sözlərini nəzərə çatdıran müəllif Əlinin (ə) elm sahəsindəki 25 vəzifəsini göstərir.

"Həzrəti-Əlinin (ə) qəzavətləri", "Həzrəti-Əlinin (ə) şücaəti", "Qədir-Xum", "Əmirəl-mömininin (ə) həyatından dərslər və ibrətlər" adlı yazılarda, adlarından göründüyü kimi, dəyərli məlumat almaq olur. Filologiya elmləri namizədi Vərağa Almasov "Qələmini belə çevirmiş mənəviyyat əkinçisi" adlı məqaləsində yazır: "Yeri gəlmişkən deyim ki, hal-hazırda "Həzrət Əli aşiqi Füzuli" monoqrafiyası üzərində gərgin iş apardığımdan Hacının indi artıq neçə-neçə kitaba çevrilmiş əsərlərinə ara-sıra üz tutmalı oluram və bu zaman onun yararlandığı qaynaqların çeşidini və çeşrisini görümlü biçimdə hiss edib duyuram. Belə ki, imam sayqısı, Əli sevgisi, müəllifin ruhuna hakim kəsilərək, Hacı Soltanın sultanına çevrildiyindən o, doğma diyarı qarış-qarış gəzmiş, Əli adına hər nə var, hamısını diqqət mərkəzində saxlamağa çalışmışdır. Bu zaman onun zəngin poeziya yaddaşı işə düşmüş, yeri gəldikcə o, Əli soraqlı ən müxtəlif beytlərlə kitablarını bəzəmişdir" (sms. səh.92).

Kitaba müxtəlif Azərbaycan və Türkiyə alimlərinin kitablarından hissələr də daxil edilmişdir. Qədir-Xumla bağlı məsələlərə aydınlıq gətirmək üçün bir çox dini kitabları araş-

dıran Hacı Soltan öz fikirləri ilə yanaşı başqalarının da fikirlərini vermiş və bununla da fikirlərinin əyani sübutuna nail olmağa çalışmışdır. Kitabın maraqlı cəhətlərindən biri də budur ki, tədqiqatçı bir fikrin bir neçə müəllif tərəfindən verildiyini diqqətə çatdırmış və mənbələri də dəqiq təqdim etmişdir. Tarix üzrə elmlər doktoru Təvəkkül Səlimov "Kamilliyin zirvəsində" adlı məqaləsində yazır: "Xoş o insanın halına ki, Allah fitrətdən ona kamillik cövhəri əta edib, o da İlahi ətadan faydalanmaqla zəhmət çəkib, bəşərin ən yaxşı mənəvi nemətlərinə yiyələnmək səyi göstərir. Fitrətlə zəhmət birləşəndə insanlıq ondan böyük fayda götürmüş olur.

Axund Hacı Soltan Hüseynqulu oğlu da zəmanəsinin nadir istedadlı kamil insanlarındandır. Onun istər həyatı, istərsə yaradıcılığına nəzər saldıqda bu qənaətə gəlirsən ki, Hacı Soltan hər kəsə nümunə olacaq bir şəxsdir. Çünki onun həyat yolu, elmi və bədii yaradıcılığı, ruhani alim özəlliyi hər adam üçün örnək olacaq qədər dəyərlidir. Onu bir neçə parametr üzrə səciyyələndirmək mümkün və vacibdir (sms. səh. 66).

Kitabın II hissəsi "Peyğəmbərin (s) əmri" ilə başlayır ki, bu əmr Əliyə "Quranı-Kərimi toplayıb tərtib etməsi tapşırığıdır. "Əlinin (ə) topladığı Quranın aqibəti"ndə isə müəllif təəssüflə insanların Əlinin topladığı Quranı qəbul etmədiklərini və həmin Quranın Peyğəmbərin tapşırığı ilə imamlara ötürüldüyünü, hal-hazırda Zamanın sahibində olduğunu qeyd edir. Burada Əlinin (ə) "Nəhcül-bəlağə", "Cəfr", "Fatimə müshəfi", "Camiə", "Divan" kitabları haqqındakı yazılarda müəllif oxucuları dəyərli bilgilərlə məlumatlandırır.

Kitaba bir sıra hədislər də daxil edilmişdir ki, bunlarda Həzrəti-Əli (ə) ilə bağlı həqiqətləri öyrənmək olar. Eləcə

də kitabdakı “İmam Əlinin (ə) fəzilətləri”, “İmam Əlinin (ə) qırx səhabəsi”, “İmam Əlinin (ə) mövludu və etikaf”, “İmam Əlinin (ə) qaydası” və s. bu kimi yazılarda da Əli (ə) haqqında olduqca maraqlı məlumatlar verilmişdir.

“Əmirəl-möminin Əli (ə) hamı üçün nümunədir”, “Hər kəs üçün ədalətin meyarı”, “Əli (ə) əməllərin mizanıdır”, “Əmirəl-möminin Əlinin (ə) ziyarətinin fəziləti” kimi yazılarda müəllif Əlinin (ə) bir sıra xüsusiyyətlərini açıqlayır, insanları ona oxşamağa çağırır.

Kitabda Əli (ə) ilə bağlı bir çox dualar verilmişdir. Burada həm Əlinin (ə) etdiyi dualar, həm də ona təvəssül edərkən oxunan dualar vardır. Həzrəti-Əlinin (ə) kəlamlarından söz açan Hacı Soltan onun hikmətli sözlərində tövbənin şərtləri, yeməklə bağlı fikirləri, ədəb qaydaları, müşküllərin dəfi və s. haqqında ətraflı bəhs etmişdir. Kitaba Peyğəmbərin (s) Əliyə (ə) vəsiyyətlərindən bir hissə də daxil edilmişdir.

Kitabda Məhdidən (ə.f) bəhs edən müəllif zühurun tezləşməsi üçün duaları, Əlinin (ə) zühur haqqındakı kəlamı, hətta Əlinin (ə) Həzrəti-Zəhraya təsəlli verməsi, gizlin dəfn mərasimi və s. haqqında da söhbət açmışdır. Burada Əli (ə) ilə bağlı sual-cavablar da yer alır ki, onlarda insanları maraqlandıran bir sıra anlaşılmaz sözlərə aydınlıq gətirilmişdir.

Kitabın III hissəsi “Peyğəmbərin (s) vəsisi ünvanı lüğət kitablarında, səhabələrin və tabeinlərin şeirlərində” adlanır və burada müxtəlif mənbələrdən götürülmüş şeirlərdən bədii və sətri tərcümələr yer alır: Həssan ibn Sabit, Neman ibn Əclan, Əbdüllah ibn Əbu Süfyan ibn Hərəs ibn Əbdül-Müttəlib, Əşəs ibn Qeys, Cərir ibn Əbdülllah Vəcli, Nəsr ibn Əclan Ənsari və s.

Kitabın IV hissəsi "Adlar, təxəllüslər və şeirlərdən nümunələr" adlanır. Burada Qul Nəsimi, Dədəmoğlu, Mirzə İsa Xəyali Ərdəbili, Nişat Şirvani, Məhəmməd Təqi Sidqi, Mirzə Əlixan Ləli, Şəkili Nəbi, Hüseyn Cavid, Əliağa Vahid kimi şairlərin şeirlərindən nümunələr verilmişdir.

Kitabın V hissəsində "Şeirlər" təqdim olunmuşdur. İlkin olaraq Əlinin (ə) dörd misrasının sətri tərcüməsi verilmişdir. Burada müxtəlif mənbələrdən götürülmüş Əli (ə) ilə bağlı Hüseyn Mənsur Həllacın, Əbu Əli ibn Sinanın, Xoca Əhməd Yasəvinin, Cəlaləddin Ruminin, Dəyaninin, Qul Əlinin, Sabirin, Şafeinin, Molla Mehrəlinin, Şeyx Mahmud Abbas Amulinin, Hassan ibn Sabitin, Seyyid Əli Nəği Hindinin, Qətran Təbrizinin, Həqiri Təbrizinin, Xalxalinin, Cənnətinin, Baba Tahir Üryanın, Mehmet Akif Ərsoyun, Qaracaoğlanın, Şeyx İbrahim Gülşəninin, Hacı Rza Sərrafın, Əndəlib Qaracadağinin, Aşıq Alının, Molla Cümənin, Miskin Abdalın, Əhmədinin, Əbülhəsən Racinin, Fəqir Ordubadinin, Salik Ordubadinin, Əliabbas Müznibin, Qasirin şeirləri və bir sıra türkcə, farsca şeirlər vardır. Şeyx Əbdül Mahmudbəyli "Hacı Soltan axundun 40 illik yubileyi şərəfinə" adlı təbrikində onun özünə müraciətlə yazır: "Rəbbimiz sənin kimi insanları xəlq etməklə həm dünyamızı, həm də insanları pis, bəd, məkrli və xəyanətkar əməllərdən qorumaq üçün yaradıb. Rəbbimizin yaratdığı, xəlq etdiyi sənin kimi kamil və halal bir insana, şükranlıq etmək, salamlamaq ulu Yaradana xoş gələn bir əməldir. Mən xoşbəxtəm ki, bu əmələ xidmət mənə nəsib oldu və sən varsan, sən mənim də qismətimə düşən qardaşımsan..." (sms.səh.98-99).

V hissənin sonunda "Növhələr" verilmişdir. Burada

Məlik, Paşa Əzadar, Əfsun, Zəbih, Nadi, Faiz, Məhdəvi, Xəyali, Qasım bəy Zakir, Hacı Soltan, Mirzə Həsib Qüdsi, Ocaq Nejad, Ələmdar Mahir, Hacı Arif Buzovnalı, Mirzə Dahi və b. şairlərin növhələri, eyni zamanda müəllifi bilinməyən ”Laədri” əsərlər vardır.

Kitab İmam Zaman Ağanın duası ilə bitir. Sonda 151 ədəbiyyat və qeydlər verilmişdir ki, bunlar tədqiqatçının nə qədər əziyyət çəkdiyini, davamlı axtarışlar apardığını bizə anladır.

Yazımızı Tahir Rəvanın Hacı Soltana həsr etdiyi “aşiqidir” rədifli qəzəli ilə tamamlayırıq:

Gözəl alimdü Hacı, Şahi-vila aşiqidir,
Həm **Əli** aşiqi, həm Ali-əba aşiqidir.

Çünki məhbubinə eşqilən ürəkdən vurulub,
Yoxdu bir kimsə gözündə, o, Xuda aşiqidir.

Gəldi dünya üzünə Şahi-vilayət günəşi,
O Həsən Əsgəridir, mahliqa aşiqidir.

Feyz alıb dinləmişəm eşqilə hər xütbəsini,
Uca Allahə sığınmış, üləma aşiqidir.

Qurulub məclis onunçün, Hacının ad günüdür,
Bu səbəbsiz deyil əsla, şüəra aşiqidir.

Oxuyur bəzmi-əza rövzə deyən növhələrin,
Cümlə eşq əhli üçün Kərbübəla aşiqidir.

Bir ömr sərf eləyibdir uca haqqın yoluna,
Ali bir yoldu, Rəvan, rəhnüma aşiqidir.

## 27.AZƏRBAYCANDA HƏZRƏT ƏLİ (ə) QƏDƏMGAHLARI VƏ ZİYARƏTGAHLARI

Hacı Soltanın iyirmi yeddinci kitabı 2011-ci ildə "Ozan" nəşriyyatında çap olunmuşdur. "Azərbaycanda Həzrəti-Əli (ə) qədəmgahları və ziyarətgahları" adlanan bu kitab Azərbaycanın milli qəhrəmanı Seyyid Mübariz İbrahimvun və Fərid Əhmədovun əziz xatirəsinə ithaf olunmuşdur.

Kitabın redaktoru Hacı Arif Buzovnalı, rəyçiləri Hacı İlham Kərim oğlu və Hacı Hafiz Kərbəlayi Nadir oğludur. Digər kitablardan fərqli olaraq, burada mündəricat əvvəldə verilmişdir.

Bu, Hacı Soltanın "Dünyanın yaddaşı" silsiləsindən II kitabıdır. "Həzrəti-Əli (ə) və Azərbaycan" adlı I kitab kimi bu kitab da geniş xucu kütləsi üçün nəzərdə tutulmuşdur.

Kitabın əvvəlində Həzrəti-Əlinin (ə) "Nəhcül-bəlağə" əsərindən bir parça, İmam Zeynəlabidinin "Səhifeyi-Səccadiyyə"sindən bir dua, Fərəc duası, Həzrəti-Əlidən (ə) hədis və Qurani-Kərimin "Məryəm surəsindən 96-cı ayəni təqdim edən müəllif sözünə belə başlayır: "İki aləmin şahı, bəşəriyyətin pənahı, Allah təbarək və təalanın təyin etdiyi imam Həzrəti-Əli ibn Əbu Talib (ə) haqda bütün yazılanlarla bərabər hələ nə qədər gizli sirlər qalmaqdadır.  O elə bir dahidir ki, Qiyamət gününə qədər həm Onun kəlamları, həm Onun haqqında buyurulan hədislər əsərlərdə öz əksini tapacaq və bəşəriyyəti hidayət edəcəkdir.

Həzrəti-Əli (ə) ilə bağlı dünyanın müxtəlif nöqtələrində əlamətlər və işarətlər vardır. Bizə məlum olanların ən məş-

hurlarını müxtəsər şəkildə nəzərdən keçirək...”.

Sonra Hacı Soltan müxtəlif mənbələrə müraciət edərək, Həzrəti-Əli (ə) ilə bağlı dünyanın müxtəlif yerlərində olan ziyarətgahları təqdim etmiş və oxucuları dəyərli məlumatlarla tanış etmişdir.

“Peyğəmbər və imamların “təkvini” vilayəti” adlı yazıda vilayətin nə olduğunu, iki qismə bölündüyünü qeyd edən müəllif “təşrii” və “təkvini” vilayət haqqında məlumat vermiş, bu zaman Quran ayələrinə və hədislərə istinad etmişdir.

“Ətrafa və özünə səfər. İbrətdən qəflətədək” adlı yazıda yenə Qurani-Kərimə, “Nəhcül-bəlağə”yə və Həzrəti-Əlinin (ə) Divanına müraciət edən araşdırmaçı səfərə, səyahətə çıxmağın faydalarından bəhs etmişdir. Burada Hacı Soltan öz şeirlərindən də vermişdir.

“Azərbaycanda Əli (ə) qədəmgahları” yazısı Əhlibeyt şairi Cəsur Narinin şeiri ilə başlayır. Burada müxtəlif yerlərdə olan qədəmgahları təqdim edən müəllif bir çox rəvayətlərə müraciət etmişdir. Kitabda oxuculara Azərbaycanda Əli adı ilə bağlı olan 46 məntəqə və kənd adı təqdim etmişdir.

Hacı Soltan kitabda Həzrəti-Əlinin (ə) otuz fəziləti haqqında əhatəli söhbət açmış, bu zaman Qurani-Kərimin ayələrindən, hədislərdən, xüsusən də Peyğəmbərin (s) qiymətli fikirlərindən istifadə etmişdir. Burada “Həzrəti-Əlinin (ə) imamətini sübut edən beş hədis” adlı yazı da diqqəti çəkir. Xalq artisti Alim Qasımov “50 yaşın mübarək, Hacı Soltan” adlı təbriknaməsində yazır: “...Səsinə, sözünə və ən çox da dinin musiqi ilə bağlı tərəflərinə gətirdiyi aydınlıq və izahlar, təhlil etdiyi qəzəllərin Quran ayəsi və hədislərlə uyğunluğu insanı, ələlxüsus da xanəndəni məftun və valeh edir. Bu

işıqlı insanın dərin biliyi və geniş məlumatı hamımız üçün əhəmiyyətli, eyni zamanda tədqiqat baxımından da öyrənilməli və əxz edilməli materialdır. Çox şadam ki, həyatda belə bir dost qazanmışam. Axundun moizələri, ifadə etdiyi şeirlər şəxsən mənim ruhumu təzələyir, paklaşdırır. Və Allahın insana verdiyi qüdrətin yüksəkliyinə qalxmağa sövq edir. Hacı Soltan həm din, həm ədəbiyyat, həm də mədəniyyət adamıdır...” (sms. səh.102).

Kitabdakı maraq doğuran hissələrdən biri də “Sənədlərin izahı”dır. Burada Babagil məqbərəsinə, Şirvan vilayəti və Xəmsə mahalına aid sənədlər təqdim olunmuşdur. Müəllif Əlyazmalar İnstitutunun arxivlərində olan bəzi sənədlərin təsvirini vermiş və sənədlərin yazıldığı tarixi şəraitdən bəhs etmişdir.

Kitabda verilmiş “Əli əleyhissəlamın “Əshabi-Kəhv” haqqında buyurduqları və yəhidilərlə söhbəti” adlı geniş və maraqlı yazıdan da dəyərli məlumatlar öyrənmək olur.

Kitabda “Alim və şair adlarının siyahısı” verilmişdir. Çox güman ki, bunlar əsərlərində Həzrəti-Əlidən bəhs edən şəxslərdir.

Kitaba Süleyman Cəlaləddinin, Məhəmməd Füzulinin, Molla Pənah Vaqifin, Salikin, Arifin, Seyyid Əbülqasim Nəbatinin, Əbdürrəhman Şairin, Hacı Yusifin, Hacı Soltanın Həzrəti-Əli (ə) ilə bağlı şeirləri, Səba oğlu Abdullahın əfsanəsi də daxil edilmişdir.

Burada “Əli əleyhissəlamın rəcəti”, “İmam Mehdi əleyhissəlamın mübarək əlamət və nişanələri”, “İmam Əlinin (ə) xatirələri, mələklərin zikri”, “14 Məsumdan hədislər”, “Rəziəddin Seyyid bin Tavusun vəsiyyətnaməsindən”, “Seyyid Əli Qazinin vəsiyyətnaməsindən”, “Həzrəti-Ayətullahül-üzma Mərəşi Nəcəfinin vəsiyyətnaməsindən”, “İmam Zaman (ə.f.)

ağanın Mərəşi Nəcəfiyə verdiyi tövsiyyələr" adlı yazılar da maraq doğurur və oxucuları məlumatlandırır. Hacı Sara Zair "Mənalı ömrün səhifələri" adlı məqaləsində yazır: "Həzrəti-Əli (ə) və onun övladlarına sonsuz məhəbbəti olan Hacı Soltan, sanki bütün həyatını varlığı ilə ilahi təyinatlı imamlara və onların yolunu davam etdirən müqəddəslərə həsr etmişdir" (sms.səh.148).

Hiss olunur ki, Hacı Soltan bu kitabı ərsəyə gətirmək üçün xeyli zəhmət çəkmiş, xeyli kitab oxumuş, tədqiqat işi aparmışdır. Kitabın sonunda müəllifin tərcümeyi-halı və kitablarının siyahısı, kitaba uyğun rəngli şəkillər və bəzi yazıların kserosurətləri və s. verilmişdir.

Yazımızı Arif Buzovnalının Hacı Soltanı səciyyələndirən bir qitəsi ilə bitiririk:

Yox fayda bu aləmdə əsərsiz yaşamaqdan,
Nə xoş ki, bu dünyada izin var, Hacı Soltan!

Bu xülq ilə yox bənzəyişin heç kimə, Xaliq
Bir kimsəni xəlq etmədi təkrar, Hacı Soltan!

Sən zülm ilə dəva elədin, həqqi yaşatdın,
Oldun hamı məzlumə tərəfdar, Hacı Soltan!

İnkar eləyər adəmizad olduğunu Həq,
Hər kim eləsə həqqivi inkar, Hacı Soltan!

Yazdın **Əli** eşqilə nə qüdrətli əsərlər,
Oldun bu məhəbbətdə inadkar, Hacı Soltan!

Nitqin, əməlin, varlığın ibrətdi bu xalqa,
Sənsən ədəbə, əxlaqa meyar, Hacı Soltan!

Sən yaz,yarat, əl çəkmə həqiqət səfərindən,
Az olsa da var şe'rə xiridar, Hacı Soltan!

Sərf eyləmisən ömrü bu millət, bu Vətənçün,
Tarix biləcək qədrivi aşkar, Hacı Soltan!

Elmə, ədəbə, şe'rə və İslamə dayaqsan,
Alilər olur kuyivə zəvvar, Hacı Soltan!

Bu cism kiçikdir belə eşqi daşımaqçün,
Bundan ürəyin təzyiqi artar, Hacı Soltan!

Qırdın yenə bir yarpağı ömrün ağacından,
Bir yaş da qocaltdı səni dəvvar, Hacı Soltan!

Ey kaş, fələyin çərxi muradınca dolansın,
Hər işdə sənə Xaliq ola yar, Hacı Soltan!

Arif səni bir şe'r ilə təbrikə gəlibdir,
Sənsən bu günə ali səbəbkar, Hacı Soltan!

21.12.2003.

## 28.BUNU HAMI BİLMƏLİDİR

Hacı Soltanın iyirmi səkkizinci kitabı “Bunu hamı bilməlidir” adlanır. 2011-ci ildə “Ozan” nəşriyyatında çap olunan bu kitab da Azərbaycan milli qəhrəmanı Seyyid Mübariz İbrahimovun və Fərid Əhmədovun əziz xatirəsinə ithaf olunmuşdur. Kitabın redaktoru Hacı Arif Buzovnalıdır.

Kitab bir sıra dini və şər’i qayda-qanunların toplusudur. Adından göründüyü kimi, bunlar hamının bilməli olduğu vacib dəyərlərdir. Kitabın əvvəlində “Nəhcül-bəlağə”dən parça, “Dua”, “Fərəc duası”, “İmam Əlinin (ə) min adından yüz biri”, “İslam nədir”, “Əhkamın növləri”, “Kəlmeyi-teyyibə”, “Kəlmeyi-şəhadət”, “Ərkani-din (üsuliddin və firuiddin)” və s. qeyd edən müəllif, həm də qəməri aylarının, Peyğəmbərimizin (s) atasının və 12 babasının, 12 imamın, Zamanın sahibinin dörd canişininin, Dəməşqdə və Hələbdə dəfn olunan müqəddəslərin adlarını oxuculara təqdim etmişdir. Müəllif göstərir ki, vacibat 32-dir:

Füruiddin-10,
Üsuliddin-5,
Sifati-sübutiyyə (Allahda olan sifətlər)-8,
Sifati-səlbiyyə (Allahda olmayan sifətlər)-7,
Ya oxuyub müctəhid ol,
Ya müctəhidə təqlid et (səh.16).

Burada azan, namazdan əvvəl və namazda olan hərəkətlər, vacib namaz, nafilələr, dəstəmaz, təyəmmüm, namazı

batil edənlər, şəklər, ehtiyat namazı, səcdeyi-səhv və s. namazla bağlı işlər, haram və nəcis olanlar, yemək yeyəndə müstəhəb və məkruh olanlar, Novruz bayramının əməlləri, abi-nisan suyuna oxunan surələr, həccin hökmləri, ehramda haram olanlar, heyvanların zikrləri, şad və müsibətli günlərimiz, Qurban duasının mənası və s. bu kimi məsələlər işıqlandırılmışdır. Hacı Soltan həmişə öyrənmiş və bildiklərini insanlara çatdırmaq fikrində qərarlı olmuşdur. İstər məsciddə, istər yığıncaqlarda, istərsə də kitablarda. Onun bu kitabı hər bir kəsin bilməli olduğu məlumatlarla zəngindir. Ocaq Nejad "Din qardaşım, qədim səmimi dostum" adlı yazısında Hacı Soltan ömründən söz açarkən yazır: "... Elə bir ömür ki, onun bir hissəsi şiə məmləkətində küfrlə mübarizədə keçmiş, dindarlığın qadağan olunmasının şahidi olmuş, həqiqi din təfəkkürlərini qorumaqda bir dövrdən başqa bir dövrə keçmişdir. Zənnimcə, onu mənəvi və dini irsi, əmanət olaraq bir nəsildən başqa bir nəslə ötürən və bu irsi həqiqi dindarlar kimi bəşər övladlarına çatdıran insanların bir nümunəsi adlandırsaq, yanılmarıq" (sms.səh.12).

Kitabda diqqətimi çəkən bir yazını qeyd etmək istəyirəm. "Qadınlara təklif olunan on sifariş (ixtisarla)" adlı bu yazı Ayətüllahül-üzma Seyyid Mühəmməd Hüseyni Şirazinin "Qadınlara nəsihətlər" kitabından alınmışdır:

1.Təqva.

2.Xoş əxlaq.

3.Təklif (kitab yazmaq).

Həzrəti-Zəhra (s.ə.) İslamda kitab müəllifi olan ilk qadın, Həzrəti-Əli (ə) isə kitab müəllifi olan ilk kişidir. Zəhranın

(s.ə.) kitabının adı “Müshəfi-Fatimə”, Əlinin (ə) kitabının adı “Kitabi-Əli” idi.

4.Mühazirə. Qadınlar məruzə etməyi, mühazirə oxumağı öyrənməlidirlər.

5.Camaat namazı qılmalıdırlar. Peyğəmbər (s) xanımlar üçün camaat namazı təşkil etmiş, Ümmü Vərqə adlı bir qadını o namaza imam təyin etmişdir.

6.Evlənmək.

7.İşləmək.

8.İmam Hüseyn (ə) məclislərində iştirak etmək.

9.Vəsiyyət etmək.

10.Fatimeyi-Zəhranın (s.ə.) həyatını özlərinə örnək etməlidirlər (səh. 48).

Həzrəti-Əlinin (ə) nəsihətini və İmam Zaman ağanın namazını qeyd edən müəllif peyğəmbərlərdən danışmış və Həzrəti-Əlidən (ə) geniş bəhs etmişdir.

Kitabda verilən maraqlı yazılardan biri də “Namaz qılmağın 29 mükafatı”dır: “Zəmir ibn Həbib nəql edir ki, İslam peyğəmbərindən (s) namaz barəsində soruşdular, buyurdu: “1.Namaz dinin vacib əməllərindəndir. 2.Allahın razılığına səbəb olur. 3.Peyğəmbərin yoludur. 4.Mələklərin məhəbbətini cəlb edir. 5.Hidayət və imandır. 6.Mərifət nurudur. 7.Ruzinin bərəkətidir. 8.Bədənin rahatlığıdır. 9.Şeytanın xoşuna gəlməyən əməldir. 10.Kafirlər müqabilində cihaddır. 11.Duanın qəbul olmasına səbəb olar. 12.Əməllərin qəbul olmasıdır. 13.Möminin axirət azuqəsidir. 14.Ölüm mələyinin yanında şəfaətçidir. 15.İnsanın qəbir dostudur. 16.Qəbirdə insan üçün istirahətdir. 17.Nəkir və Münkirin cavabıdır. 18.Qi-

yamətdə bədənin tacıdır. 19.Müsəlmanın üzünün nurudur. 20.İnsanın libasıdır. 21.Atəşlə insan arasında pərdədir. 22.Atəşlə insan arasında dəlildir. 23.Cəhənnəmdən nicat vasitəsidir. 24.Sirat körpüsündən keçiddir. 25.Behiştin açarıdır. 26.Hürul-eynin məhəbbətidir. 27.Behiştin qiyamətidir. 28.İnsanı ən yüksək məqama çatdıran namazdır. 29.Namazda Allaha təsbih, təhlil, təkbir, təmcid və təqdis olduğuna görə danışıq və duadır" (səh.51).

Hacı Soltan namazı yüngül saymağın bəlaları, hicri və miladi tarixləri, əbcəd hesabı, əsl müsəlmanın sifətləri, müsəlmanlıqda böyük günahlar, yuxu yozumları, İslamda ədəb qaydaları, Peyğəmbərimizin (s) hədisləri, İmam-Zamanın zühurunun əlamətləri, Qiyamətin əlamətləri, Qədir-Xum, Vilayət, Əlini (ə), İmam Mehdini (ə.f) tanıtdırmaq, ilahi hökmlər, Qədir gününün bəzi əməlləri və s. haqqında ayrı-ayrı yazılarda məlumat vermişdir.

Kitabda Hacı Soltanın şeirləri də yer alır. Kitab "Nüdbə" duası ilə yekunlaşır. Sonda müəllifin tərcümeyi-halı və kitablarının siyahısı verilmişdir.

Kitab adından da göründüyü kimi hamıya gərəkli vəsaitdir. İnsanlara şəriəti həm mədrəsədə, həm məsciddə, həm məclislərdə öyrədən Hacı Soltan, həm də ayrıca bir kitab yazıb nəşr etdirib oxucuların ixtiyarına vermişdir. Yüzlərlə gənci düz yola dəvət edən Hacının bu yaxşılıqlarını unutmaq mümkün deyildir. Bu mənada Əli Tağının Hacı Soltana həsr etdiyi qəzəl maraq doğurur:

Ey hüsnü günəşdən də münəvvər, Hacı Soltan,
Nitqindədü Allahü Peyəmbər, Hacı Soltan.

Sayəndə gəlir mən kimi çox bəndə nəmazə,
Şeytan ilə, ey hərb edən əsgər, Hacı Soltan.

Ey qafil olanlar, oxuyun, öyrənin ondan,
Hikmətli kitabətdi sərasər Hacı Soltan.

Eşqin yoluna ta ki, qədəm qoymuşuq əvvəl,
Sənsən bizə bu vadidə rəhbər, Hacı Soltan.

Mövludunu təbrik edirəm canü könüldən,
Xoş gəlmisən, ey aləmə zivər, Hacı soltan.

Sən Tağıyə səccadə hədiyyə edən andan
Oldu bu Əli çakəri-Heydər, Hacı Soltan.

# 29. HƏZRƏT ƏLİ (ə) QƏDƏMGAHI ZƏVVARLARIN GÖZÜ İLƏ

Hacı Soltanın tərtib etdiyi "Həzrəti-Əli (ə) qədəmgahı zəvvarların gözü ilə" adlı kitab Həzrəti-Əli (ə) qədəmgahının mütəvəllisi Hacı Arif Əhməd oğlunun əziz xatirəsinə ithaf olunmuşdur. Sayca 29-cu yerdə duran bu kitab 2011-ci ildə "Ozan" nəşriyyatında çapdan buraxılmışdır. Kitabın redaktoru Hacı Arif Buzovnalı, elmi məsləhətçiləri Axund Hacı İlham Səlimov, Hacı Nazim Məmməd oğlu, Hacı Maarif Hacı Arif oğlu, mütərcimlər Hacı Vasif Hacı Arif oğlu, Tahirə Davud qızı, Gültəkin Yusif qızıdır. Burada qədəmgahı son iyirmi ildə ziyarət edən zəvvarların rəyləri, arzu və istəkləri toplanmışdır.

Hacı Soltan hələ uşaq vaxtından Əli (ə) aşiqi olmuş, bu qədəmgahı da təkrar-təkrar ziyarət etmişdir. Böyüyüb din xadimi olandan sonra da həmin qədəmgahın yenidən qurulmasında, oradakı işlərdə yaxından iştirak etmiş, bu müqəddəs ocaqda dini mərasimlər, məclislər təşkil etmiş, gələcək nəslə islami dəyərlərin çatdırılmasında böyük rol oynamışdır. Qədəmgahın axundu və dəyərli müəllimlərindən olan Hacı Vasif Şeyx Arif oğlu "Əli (ə) şairi və Əlişünas tədqiqatçı" adlı məqaləsində yazır: "Axund Hacı Soltanı gənc yaşlarından tanıyıram. İlk öncə qeyd etməliyəm ki, Hacı Soltan rəhmətlik atam ilə dost olmuşdur. Atam onun xətrini istəyirdi. Şər'i məsələlərdə həmişə onunla məsləhətləşərdi. O vaxtlar "Əli ayağı – qədəmgahı"nda olan məclislərə, dini tədbirlərə Hacı Soltan ağa rəhbərlik edərdi. O, "Məşhədi-Qərib" məscidi ilə paralel "Əli ayağı – qədəmgahı"nda dini mərasimləri – moizə və namazları icra edərdi. Hətta mən

ona “Əli ayağı – qədəmgahı” tərəfindən “Həzrəti-Əli (ə) adına fəxri ali-dini mükafat”ın və “Əli ayağı”nın fəxri axundu” adının verilməsinin şahidi olmuşam” (sms. səh.27).

Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin, Azərbaycan Respublikasının baş naziri R.Hüseynovun, Ankara universitetinin doktor-professoru Şafaq Erelin, Milli Məclisin deputatı Səyyad Aranın və b. avtoqraf rəy və istəkləri kitabın cildinin iç tərəfində verilmişdir.

Hacı Soltanın kitaba müqəddimə əvəzi yazdığı “Həzrəti-Əli (ə) qədəmgahları” adlı yazı Qurani-Kərimin Məryəm surəsindən 96-cı ayə ilə başlayır. Həzrəti-Əli (ə) ilə bağlı olan ziyarətgahlardan bəhs açan müəllif təkcə Azərbaycanda deyil, hətta müxtəlif ölkələrdə olan məkanları, nişanələri də qeyd edir və Hacı Zeynalabidin Şirvanidən, Şeyx Abbas Qumidən, Ayətullahül-üzma Məkarim Şirazi və Ayətullah Cəfər Sübhanidən sitatlar verir. Sonra XVI əsr Azərbaycan şairi Həzininin “Hədisi-ərbəin” tərcümə əsərindən iqtibas etdiyi “Əl-hədisül-Hadi əşər” əsərini, sonda isə buzovnalı şair Məhəmməd İsmayıl Asinin iki qəsidəsini təqdim edir.

Kitaba daxil edilmiş şair, publisist Gülarə Munisin “Həzrəti-Əli (ə) qədəmgahı məscid-ziyarətgahının möcüzələri” adlı yazısı da maraq doğurur. Adından da göründüyü kimi məqalədə bir sıra möcüzələrdən bəhs edilir. Qədəmgahda şəfa tapanların özlərinin və yaxınlarının dilindən verilən etiraflar bu ziyarətgahın doğrudan da böyük möcüzələrə qadir olduğunu əyani şəkildə sübut edir. Gülarə xanım hətta 4 yaşında öz başına gələn bir əhvalatı da qeyd edərək, qorxudan dili tutulduqda qədəmgahda yatırıldığını və dilinin açıldığını bildirir. Canlı şahidlərin söylədikləri bir daha Həzrəti-Əlinin (ə)

böyük kəramət sahibi olduğunu göstərir. Gülarə Munis yazısını qədəmgaha həsr etdiyi “yeridir” rədifli qəzəl ilə yekunlaşdırır.

Sonra Hacı Soltanın “Əli yolunda”, Hacı Arifin”Həzrəti-Əli qədəmgahı”, Bəxtiyar Ağayar oğlunun “Ya Əli” rədifli qəzəli gəlir. Hacı Soltan yazır:

Kim nə yolu gedir, getsin, işim yox,
Mən vermişəm canı Əli yolunda.
Bu yol həm evimdir, həm məzarımdır,
Axıdaram qanı Əli yolunda...

Qədəmgahın tarixindən bəhs açan müəllif yazır: “Azərbaycanda çar üsul-idarəsinin hökm sürdüyü bir dövrdə qədəmgahın müqəddəsliyini hiss edən çar canişinliyi 10 nəfər ruhaninin şahidliyi ilə 1861-ci ildə 12677 saylı siyahı nömrəsi ilə onu rəsmi qeydə almışdır. Qədəmgaha dini xidmət göstərmək və ona şeyxlik etmək Kərbəlayi Əliyarın oğlu Şeyx Hacı Hüseynəliyə vəkalətnamə ilə tapşırılmışdır”. Müəllif həmin sənədin surətini də kitaba daxil etmiş və yazısında Azərbaycan Respublikasının prezidenti Heydər Əliyevin, Seyyid Mahmud Mərəşi Nəcəfinin, Seyyid Rəzi Vəhidi ağanın, Hacı Əbdürrəhman Yusifpurun ürək sözlərindən sitatlar vermişdir. Hacı Soltan yazını “Əli ayağı” şeiri ilə yekunlaşdırmış və ədəbiyyat siyahısını təqdim etmişdir.

Materiallar bir neçə bölümdə verilmişdir:

I bölümdə Azərbaycan dilində olan rəylər, arzular verilmişdir ki, bu ən böyük hissədir. Burada vəzifəli şəxslərdən tutmuş kənd sakinlərinə qədər müxtəlif peşə adamlarının, o

cümlədən, dövlət adamlarının, din xadimlərinin, alimlərin, şairlərin, incəsən adamlarının yazılarına rast gəlmək olur. Yazılar içərisində rast olunan Buzovna kənd sakini Qədirov Balahüseyn Lütfəli oğlunun, Hacı Sara Zairin, Quliyev Namiq Şahab oğlunun, Y.İsmayılın və Hacı Soltanın şeirləri də maraq doğurur.

II bölümdə rus dilində olan rəylərin azərbaycanca tərcüməsi verilmişdir. Burada Belorusiyadan Tatyana Kuzmeniçna, Mixail Vasilyeviç, ArkadiyYefimoviç, Rusiyadan Novosibirskidən Vyaçeslav, Özbəkistandan Kalonov Abdulvasim, Şimali Qafqaz türkdilli xalqları Şurasının və Mədəniyyət mərkəzinin sədri Həmzət Maqomedoviç Qastamirov və başqa bu kimi ziyalıların rəyləri olduqca maraqlıdır. Rəylərdə qədəmgahın rəhbəri Şeyx Hacı Arifə ünvanlanan ürək sözləri adamı həyəcana gətirir. Onlardan birini qeyd edirəm: “Mən Dmitriy Kramarenko və mənim dostlarım Elşən, Arif, Kamal, Novruz, Müsəlmanlığı qəbul etməkdə mənə kömək edən Şeyx Arifə minnətdarlığımı bildirirəm. Arzu edirəm ki, bütün gənclər öz müqəddəs yolunu tapsınlar. Axı, Allah birdir”.

III bölümdə ingilis dilindən tərcümə edilmiş rəylər verilmişdir. Burada Britaniya jurnalisti Edvard Lukas, Pakistan səfirliyinin meneceri Şamqon Əli, Norveçdən Eva İ.Helgesen, Dubaydan gəlmiş pakistanlı Hacı Dilauer Lean, İslamabaddan Nanzur Hüseyn, Hamburqdan Marc Tornan, Yan Zoxer, ABŞ səfirliyindən Zif Bennet kimi zəvvarların dərin hörmət və rəğbətlə yazdıqları səmimi ürək sözləri insanı heyrətə salır.

Bütün bunlardan sonra avtoqraflar verilmişdir ki, bunların arasında ərəb, kiril və latın əlifbasında müxtəlif dillərdə yazılar vardır.

Kitabın sonunda görüşlərdən şəkillər təqdim olunmuşdur.

Yazımızı Ənvər Nəzərlinin Hacı Soltana həsr etdiyi qəzəl ilə bitiririk:

Nuri-hüsnündür salan can mülkünə, ey məh, ziya,
Qoy batım zülmata, varsa zərrə eşqimdə riya.

Asitanından səva yox aşiyani aşiqin,
Etmə kuyindən cüda, olsun sənə canım fəda.

Salmısan müddətdi ki, gözdən, könüldən dostunu,
Aşinayə aşina bunca cəfa görməz rəva.

Vursa düşmən sinəmə min yarə həm, bir dərd deyil,
Dərd odur ki, sormaya əhvalını dost-aşina!

Almaz əsla cam ələ, üz döndərər meyxanədən,
Cami-mey olmazsa gər ariflərə aləmnüma.

Parə-parə eyləyib hicran bu xəstə canımı,
Qılmaz, ey Soltan, ona səndən səva heç kim dəva.

Vəsf feyzindən məni-nalanı məhrum eyləmə,
Eylər Ənvər binəva, ey dust, səndən iltica.

## 30.MAZANDARAN PƏLƏNGİ İMAMƏLİ HƏBİBİ

Hacı Soltanın otuzuncu kitabı olan “Mazandaran pələngi İmaməli Həbibi” 2012-ci idə ADMİU-nun mətbəəsində çap olunmuşdur. Kitabın redaktoru Hacı Arif Buzovnalı, elmi məsləhətçiləri idman ustası, beynəlxalq dərəcəli hakim Qəhrəman Cəbrayılov və şair, publisist Rüstəm Tofiq, mütərcim Hacı Vasif Arif oğlu, xəttat Kərbəlayti Cavanşir Lahıclıdır.

Kitabın əvvəlində mündəricat, ondan sonra İmaməli Həbibinin şəkli verilmişdir. “Pəhləvanların güclüsü” adlı yazının əvvəlində Məhəmməd peyğəmbərin (s), İmam Əlinin (ə) hikmətli sözlərini və Şah İsmayıl Xətainin iki beytini təqdim edən müəllif giriş sözünə belə başlayır: “Gənclik illərindən yaddaşımda şirin xatirələr yaşamaqdadır. Həyatım dinə bağlı olub. Tarixə, ədəbiyyata, mədəniyyət və incəsənətə marağım elə o illərdən məndə idmana da həvəs oyatmışdı...” (səh. 8).

Hacı Soltanın “Mazandaran pələngi İmaməli Həbibi” kitabı nəşr olunanda təkcə Azərbaycanda deyil, xaricdə də böyük marağa səbəb olmuşdu. “Nəbz” qəzetində Nərimanın “Pəhləvanların ən güclüsü” adlı məqaləsi dərc edilmişdir. Məqalədə kitabın məziyyətləri haqqında söhbət açan, müəllifin dəyərli fikirlərini oxuculara çatdıran, öz təəssüratını da oxucularla bölüşən müəllif sözünə belə başlayır: “Qafqaz Müsəlmanları İdarəsinin Qazisi, Buzovna Cümə məscidinin axundu Hacı Soltan Əlizadənin imzası Azərbaycan oxucularına yaxşı tanışdır. Əsasən, dini mövzuda yazan Hacı Soltanın 30-dan artıq kitabı nəşr olunub. Həmin nəşrlər içərisində idmanla bağlı kitablar da var. Məsələn 1996-cı ildə islamda idman mövzusunda qələmə alınan “İslamda idman və

boks şahı Məhəmməd Əli", 1999-cu ildə işıq üzü görən "İslam idman antologiyası" bu qəbildəndir. Bu yaxınlarda isə Hacı Soltan Hüseynqulu oğlu Əlizadənin "Mazandaran pələngi" adlı yeni kitabı çapdan çıxıb" (09.05.2012, səh. 12).

Kitabda Hacı Soltan "Mazandaran pələngi" filmindən söz açır, filmdən bir epizodu oxuculara xatırladır və İmaməli Həbibini məhz buna görə sevdiyini vurğulayır. Müəllif "Sportsmen" jurnalına verdiyi müsahibəsində də filmlə bağlı bir epizodu qeyd edir ki, Mazandaran pələngi İmam Rzanın hərəmində dua edərkən, səhərisi gün güləşəcəyi adamın anasının ağlaya-ağlaya dua etdiyini görür. Niyə ağladığını soruşur, ana dərdini deyir. İmaməli onu sakitləşdirib deyir ki, narahat olmasın, sabah oğlu qalib gələcək. Ana tərəf-müqabilin Mazandaran pələngi olduğunu deyir, ona qalib gəlməyin qeyri-mümkünlüyünü, amma qalib gəlməsə, oğlunun sevdiyi qızı ona verməyəcəklərini, bunun üçün İmam Rzadan kömək istədiyini bildirir. Səhərisi gün meydanda ana ona söz verən adamın İmaməli olduğunu anlayır. Hacı Soltan müsahibəsində deyir: Filmdəki bu səhnə mənə o qədər təsir elədi ki, "Mazandaran pələngi İmaməli Həbibi" kitabını yazmağı özümə borc bildim" (müs. Saleh Salahzadə, Sevinc Quliyeva).

"Ədalət" qəzetində Etibar Cəbrayıloğlunun geniş məqaləsi çap olunmuşdu ki, burada müəllif həm İmaməli Həbibidən, həm "Mazandaran pələngi" filmindən, həm də Hacı Soltan Əlizadənin yaradıcılığından bəhs etmişdir. Müəllif yazır: "...Dünya idmanının əfsanəvi adlarından biri iranlı güləşçi imaməli Həbibi də olimpiadalar tarixinə düşənlərdəndir. Yaşlı azarkeşlər "Mazandaran pələngi"ni – İmaməli Həbibini hələ də yaxşı xatırlayırlar. Azərbaycanda isə bu ad çəkiləndə daha bir məsələ yada düşür. Söhbət bir zamanlar bizim

kinoteatrlarda ən çox izlənilən "Mazandaran pələngi" filmindən gedir. İran kinematoqrafçılarının lentə aldığı bu ekran əsərində baş rolda əfsanəvi güləşçi İmaməli Həbibinin çəkilməsi filmi daha da baxımlı etmişdi. Təsadüfi deyil ki, "Mazandaran pələngi" Azərbaycan da daxil olmaqla bir çox ölkələrdə müasir dillə desək, reytinqlər qırdı. Filmdən kitaba. Tanınmış din xadimi, Buzovna Cümə məscidinin axundu, Qafqaz Müsəlmanları İdarəsi Qazilər Şurasının üzvü Hacı Soltan Əlizadə də bir zamanlar "Mazandaran pələngi"nə dəfələrlə tamaşa edib və bu əfsanəvi idmançının həyatı ilə yaxından maraqlanıb. Onun yazdığı və ötən il Bakıda nəfis şəkildə çap olunan "Mazandaran pələngi İmaməli Həbibi" kitabı dünya şöhrətli güləşçiyə ehtiramın nişanəsidir. Hacı Soltan Əlizadə ədəbi ictimaiyyətin diqqətini çəkən bir neçə kitabın müəllifidir..." ("Ədalət" qəzeti, 2013).

Müəllif həmçinin kitabı yazarkən əsərlərindən istifadə etdiyi müəllifləri xüsusi ehtiramla yad edir və Hacı Zeynalabidin Şirvaninin "Bustanus-siyahə" əsərinin Dibaçəsindən bir hissəni verir. Qeyd edək ki, "Nəbz" qəzetinin 21.06.2012-ci il tarixli sayında Hacı Soltanın "Bustanüs-siyahə"nin tərcüməsi tapıldı" adlı bir səhifəlik məqaləsi dərc olunmuşdur.

Hacı Soltan kitabdakı "Qurani-Kərimə görə idman" adlı yazını Quran ayələri, Həzrəti-Mühəmmədin (s), Həzrəti-Əlinin (ə) hədisləri və İmam Xomeyninin idmanla bağlı fikirləri ilə başlayır: "İdmançıların iki vəzifəsi var: biri bədən tərbiyəsidir ki, qüvvə və qüdrət meydana gətirir. İnsanda cismi qüdrət meydana gəlsə öz məmləkətini müdafiə etməyi bacarar və ona həmlə edən müxaliflərdən özünü müdafiə edər. Biri də ruhi bəslənmədir. Əgər ruhi bəslənmə insanda meydana gəlsə, bu onun cismi qüdrətinə əlavə olar. İdmançılar

həmişə salim ruhda olublar. Buna görə də şəhvətlərə, ləzzətlərə yönəlməyiblər. Ancaq cismani fəaliyyətə fikir veriblər ki, salim ağıl salim bədəndədir. Əgər siz diqqət etsəniz görərsiniz ki, cəmiyyətin müəyyən hissəsi; cavanlar eyş-işrətlə vaxt keçirirlər. Bu həqiqi eyş-işrət deyil. Bədənləri saralmış, ruhları solmuş və tənbəllik başdan-ayağa onları bürümüşdür. Əgər iki saat eyş-işrətlə məşğul olurlarsa iyirmi iki saat onun narahatçılığını çəkirlər. O kəslər ki, Allah əhlidirlər, Allaha yönələrlər, cismi və ruhu tərbiyə edərlər. Onlar elə adamlardır ki, heç vaxt bənizlərində solğunluq görməzsən. Bu da Allahın bir nemətidir. Allah-təala hamıya nəsib etsin" (səh. 19).

Kitabda Zeynəb Soltan qızının "Azərbaycan müsəlmanları və idman" kitabından "Talutun qüvvəsi", "Hz.Yusif qissəsində qüvvətlilik", "Həzrəti-Musa qüssəsində qüvvətlilik" adlı yazılar, Harun Yəhyanın İstanbulda çap olunmuş "Quran möcüzələri" kitabından bir hissə və Hüseyn Səmədinin İranda nəşr edilmiş "Düyü tarlasının övladı" kitabından "İmaməli Həbibi haqqında" adlı yazı da təqdim edilmişdir.

"İmaməli Həbibinin xatirələrindən" adlı yazı bu xatirə ilə başlayır: "Mən kənddə doğulmuş cavan bir oğlan idim ki, uzun illər öz cavanlığımı kəndlərdə keçirmiş, mədəniyyət və onun qayda-qanunlarına bağlı olmayıb, şəhərdə yaşayanların da riya, hiylə və kələklərindən də xəbərim yox idi. Ancaq pak bir qəlbim var idi ki, o da şimalda yerləşən düyü tarlalarının məhəbbəti ilə döyünürdü. Bütün fikrim abadlıq və düyü əkən insanların xoşbəxtliyi olub, tam vücudumla bu böyük insanların səfa və səmimiyyətinin vurğunu idim".

Oxuculara güləşçi haqqında onun öz dili ilə maraqlı məlumatlar verən müəllif, nailiyyətlərini də təqdim edir:

1.1956-cı il Olimpiya oyularında “Qızıl medal” – Melburn, Avstraliya (67 kq)

2.1958-ci il Asiya Oyunlarında “Qızıl medal” – Tokio, Yaponiya (67kq)

3.1959-cu il Dünya Kuboku uğrunda Çempionatda “Qızıl medal” – Tehran, İran (73kq)

4.1960-cı il Olimpiya Oyunlarında 4-cü yer – Roma, İtaliya (73kq)

5.1961-ci il Dünya Kuboku Çempionatında “Qızıl medal” – Yokohama, Yaponiya (73kq)

6.1962-ci il Dünya Kuboku Çempionatında “Qızıl medal – Toledo, Ohayo, ABŞ (78kq) (səh.41).

Kitabda Həsən Cəbrayılovun yazıları da yer almışdır. Bu yazılarda İmaməli Həbibi ilə yanaşı digər idmançılar, xüsusən də Qulamrza Təxti haqqında da bəhs açılmış, onun görüşləri, təltifləri də oxuculara təqdim edilmişdir.

Kitabda gedən “Mazandaran haqqında qısa məlumat” adlı yazı da maraqlıdır. Müxtəlif mənbələrdən götürülmüş də-yərli məlumatlar oxuculara çox şey verə bilər. Yazıları fars dilindən Hacı Vasif Hacı Arif oğlu çevirmişdir. Hacı Vasif “Əli ayağı” ziyarətgahında mənim müəllimim olub. Olduqca sa-vadlı, həm də imanlı insandır. Ondan çox şey öyrənmişik.

Hacı Soltan Firdovsinin “Şahnamə” əsərindən “Keykavu-sun padşahlığı və onun Mazandaran səfəri”ni, Şah İsmayıl Xətai və Hacı Zeynalabidin Şirvani haqqında məlumatı və Hüseyn Arifin Xətaiyə həsr olunmuş “Yadigar qılınc” şeirini də kitaba daxil etmişdir.

Sonda verilən “İran pəhləvanları” bölümü kitaba sambal gətirmişdir. Belə ki, burada İmaməli Həbininin şəkilləri, “Ma-zandaran pələngi” filmindən kadrlar, başqa idmançılarla

bağlı şəkillər, habelə rəhbərlərin, tarixi şəxsiyyətlərin, şairlərin şəkilləri verilmişdir.

Bayram Afurcalı, Aygün Hüseynli və Qənifə Məmmədovanın hazırladığı “Dostluq məşəli” qəzetindəki iki səhifəlik “Mənəvi dəyərlərin ucalığında” adlı yazıda həm Hacı Soltanın həyat və yaradıcılığından bəhs edilmiş, həm də onunla söhbətdən müəyyən fikirlər təqdim edilmişdir. Məqalədə oxuyuruq: “... Avtobusa oturan kimi dərhal Hacının verdiyi kitabları vərəqləməyə başladım.

Hacının “Mazandaran pələngi İmaməli Həbibi” kitabı məni necə tilsimə saldısa, necə sehirlədisə, yol boyu bütün vaxtımı həmin kitabı oxumaqla, şəkillərə baxmaqla keçirdim” (12.11.2015).

Hacı Soltan Mazandara gedərək soraqlaşmış, məşhur “Mazandaran pələngi”ni axtarıb tapmış, onunla görüşmüşdür. Sonra Mazandaranın İmam Cüməsi Ayətullah Təbərsi və İdman naziri Hacı Soltanı dəvət edərək, Mazandaranda “Mazandaran pələngi İmaməli Həbibi” kitabının təqdimat mərasimini keçirmişlər. “Dünya güləşinin soltanı” sayılan Mazandaran pələngi İmaməli Həbibi öz müsahibələrinin birində belə söyləmişdir: “Mən dünyanın 52 ölkəsində olmuşam və gördüyüm, tanış olduğum çox insanlar olmuşdur. Onların arasında əgər üç nəfər maraqlı insan mənim xatirimdə qalıbsa, o üç nəfərdən biri Azərbaycandan mənim görüşümə gələn və haqqımda kitab yazmış Bakının Buzovna qəsəbəsinin imam-cüməsi Hacı Soltan Əlizadədir. Mən əgər idman aləmində birinci yerə çıxmışamsa, Axund Hacı Soltan insani davranışda, yəni əxlaq aləmində birinci yerə çıxmışdır”.

Yazımızı Saleh Səbatın Hacı Soltana həsr etdiyi müsəddəs ilə yekunlaşdırırıq:

Bədəməl, nəfsinə qul kəslərə ibrətdir əsil,
Vətənə, dininə xidmətdə keçən altmış il.
Rəsulallaha olan sevgisi sözlərdə deyil,
Əməli min dəfə üstündü sözündən Hacının.
Salıb imanı bu dünyanı gözündən Hacının
Ki, mələklər öpə məhşərdə üzündən Hacının.

Ən çox insanlığına aşiq olanlar gördüm,
Elminə valeh olub, ləzzət alanlar gördüm.
Qapısın xeyli döyüb, razı qalanlar gördüm,
Özünü görmədim heç razı özündən Hacının,
Salıb imanı bu dünyanı gözündən Hacının
Ki, mələklər öpə məhşərdə üzündən Hacının.

Onu Allah bizə bir müjdə kimi göndərdi,
Hər səhər açdığı Quran üzünə nur verdi.
İşıq oldu, yolun azmışlara yol göstərdi,
Gedən ardınca xeyir tapdı izindən Hacının.
Salıb imanı bu dünyanı gözündən Hacının
Ki, mələklər öpə məhşərdə üzündən Hacının.

1958-2021

63 il bir Peyğəmbər ömrüdür. Adətən bu yaşı müqəddəs il kimi qeyd edirlər. Hər adam ömrün 63-cü ilində bu müqəddəsliyə layiq ola bilmir. 63 il yaşayıb 63 dəqiqə Peyğəmbər (s) və Ali-Peyğəmbəri (ə.m.) düşünməyənlər də var, ana bətnində ruh ilə birgə bu müqəddəsliyi alanlar, ağlı kəsəndən Əhli-beyt (ə.m.) sevgisi ilə yaşayıb bir ömür bu müqəddəslərin təbliği ilə məşğul olanlar da var. Hacı Soltan ikinci-

lərdəndir.

Uşaq vaxtından dinə, ocaqlara, Allahın evinə marağı onu yetişdirmiş, Əhli-beytə (ə.m.) layiq ömür yaşamasına gətirib çıxarmışdır. Hacı Soltan dini elmləri kitab-kitab öyrənmiş, indiki məqama pillə-pillə gəlib çatmışdır. Uşaqlıqdan doğma Buzovna kəndində yaşadığı mühit, şərait, ətrafındakı insanlar ona kömək etmişsə də, öz içindən gələn duyğu, öz mənindən qaynaqlanan hiss-həyəcan, ruhundan süzülən sevgi onu daha kənar mühitlərə səsləmiş, başqa kəndlərdə olan ziyalıların, din xadimlərinin görüşünə aparmışdır. Maştağa, Nardaran, Kürdəxanı və s. onlarla kəndi, daha sonra Bakını, Azərbaycanın digər bölgələrini gəzib, dindarları, ürəyində Əhli-beyt (ə.m.) sevgisi olan mənəviyyat adamlarını axtarıb tapan, onların danışdıqlarını yazan, sonra öz beyninin məhsulu ilə birgə kitablara səpən Hacı Soltan bu gözəl insanları heç vaxt unutmamışdır. Hacı Soltanın kitablarını oxuduqca, həmin insanların məsum çöhrələri gözümüz önündə canlanır. Hacı Soltan zərrə-zərrə elm yığdığı insanları bizə təqdim etdikcə, bu insanları tanıdıqca, ali təhsil almayan Hacı Soltanın daha ali bir məktəbin məzunu olduğunu anlayırsan. Biz yeri gəldikcə, bu kitabda Hacının həmin insanlar haqqında, onların Hacı Soltan haqqında ürək sözlərini qeyd etmişik. Çünki, o insanlar 63 illik mənalı bir ömrün bir parçasıdırlar.

Hacı Soltanın özündən böyük dostları da, öz yaşıdları da, özündən kiçik dostları da ona olan sevgini, böyük məhəbbəti, hüsn-rəğbəti dönə-dönə öz yazılarında əks etdirmişlər. Hacı Soltanın 40 illik yubileyinə həsr edilmiş jurnalda da, 50 illik yubileyi münasibətilə çap olunmuş “Söz mülkünün Soltanı”

adlı kitabda da, 60 illik yubileyinə ithaf olunan şeirlərdə, məqalələrdə də biz bunu görür, duyuruq.

Hacı Soltanın 50 illik və 60 illik yubileylərində şəxsən iştirak etmişəm. 50 illik yubiley kitabı üçün "Həzrəti-Əli sevgisi" adlı bir məqalə yazmışdım. Böyük bir zalda keçirilən yubiley məclisində  çıxış etmişdim. Elə o vaxt o məclisə gələn ziyalıların çıxışları məndə Hacı Soltan haqqında kitab yazmaq fikrini yaratmışdı. 60 illik yubileyində artıq kitabın yarısını işləmişdim, qəzetlərdə səhifələr çap etdirmişdim.

Hacı Soltanın 60 illik yubileyi Buzovna Mədəniyyət Evində böyük izdihamla keçirilmişdir. Haqqında "Söz" jurnalının yanvar-mart 2019 tarixli sayında  jurnalın baş redaktoru Sevda Əlibəylinin "Söz və mərifət Soltanı" adlı geniş məqaləsi çap olunmuşdur. Hacı Soltanın ömür yoluna güzgü tutaraq, onun dinə, ədəbiyyata bağlılığından, mədrəsə açmağından, 200 nəfər tələbəyə təmənnasız dərs deməyindən, xeyriyyəçilik işlərindən, kitablarından, o cümlədən Məhəmməd Əli və İmaməli Həbibi haqqında yazdığı kitablardan bəhs edən müəllif, sözü gətirib yubileyə çıxarır və orada iştirak edən Qafqazın şeyxi Allahşükür Paşazadənin, akademik Vasim Məmmədəliyevin, akademik Rafael Hüseynovun, millət vəkili, tibb elmləri doktoru, professor, ürək cərrahı Rəşad Mahmudovun, Milli Dədə Qorqud Fondunun prezidenti Eldar İsmayılovun çıxışlarından nüansları oxuculara çatdırmış, digər çıxışçıların və xanəndələrin adlarını qeyd etmiş və sözünü belə yekunlaşdırmışdır: "...Hacı Soltan Əlizadə onu təbrikə gələnlərin hamısına minnətdarlıq etdi. 60 illik ömür yoluna çatdığına görə Allah-təalaya şükr etdi. Haqqında

deyilən xoş sözləri məsuliyyət kimi qəbul etdiyini bildirdi. Qalan ömrünü də dinə, yazıb-yaratmağa, xeyirxahlığa həsr edəcəyini söylədi". Bəli, Hacı Soltan ömrü davam edir. Oxucular ondan hələ yeni-yeni əsərlər gözləyirlər.

Biz də bu kitabı yazarkən, Hacı Soltanın şərəflə yaşadığı mənalı ömür yolunu, min bir zəhmətlə ərsəyə gəirdiyi kitablarını və haqqında yazılmış məqalələri, şeirləri incələdik, bir Allah adamının, bir Əhli-beyt (ə.m.) aşiqinin, bir din xadiminin, bir şairin, bir tədqiqatçının obrazını yaratmağa, Hacı Soltanın bütün yazdıqlarını, Hacı haqqında bütün yazılanları əhatə etməyə çalışdıq. Nə qədər nail ola bildik, onu oxucular bilər.

## "MÜASİRLƏRİM" SERİYASINDAN OLAN KİTABLAR

| № | Kitabın Adı | Yazıldığı tarix | Çap tarixi |
|---|---|---|---|
| 1 | Mailin ünvanı vətəndir | 1995 | 1995 |
| 2 | Rəsul Rza (yaradıcılığı əsasında) | 2001 | 2003 |
| 3 | Anlanılmamaq dərdi (Anarın yaradıcılığı əsasında) | 2003 | 2003 |
| 4 | Cabir Novruz (yaradıcılığı əsasında) | 2003 | 2004 |
| 5 | Dünya mənim, dünya sənin, dünya heç kimin (Məmməd Araz yaradıcılığı əsasında) | 2003 | 2003 |
| 6 | Nigar Rəfibəyli (yaradıcılığı əsasında) | 2003 | 2003 |
| 7 | Elçin (yaradıcılığı əsasında) | 2003-2004 | 2006 |
| 8 | Əli Tudə (yaradıcılığı əsasında) | 2004 | 2011 |
| 9 | Çingiz Əlioğlu (yaradıcılığı əsasında) | 2004 | 2004 |
| 10 | Zeynal Xəlil (yaradıcılığı əsasında) | 2004 | 2010 |
| 11 | Vaqif Səmədoğlu (yaradıcılığı əsasında) | 2004-2005 | 2006 |
| 12 | Füzuli Ədəbi məclisi və Hacı Mail | 2004-2005 | 2005 |
| 13 | Fikrət Qoca (yaradıcılığı əsasında) | 2005 | 2006 |

| | | | |
|---|---|---|---|
| 14 | Adil Babayev (yaradıcılığı əsasında) | 2005 | 2012 |
| 15 | Qabil (yaradıcılığı əsasında) | 2005 | 2006 |
| 16 | Vahid Əziz (yaradıcılığı əsasında) | 2005-2006 | 2010 |
| 17 | Əli Kərim (yaradıcılığı əsasında) | 2006 | 2011 |
| 18 | Həriman Həsənzadə (yaradıcılığı əsasında) | 2007 | – |
| 19 | Samət Əlizadə (yaradıcılığı əsasında) | 2006-2008 | 2008 |
| 20 | Vahid Həbibullayev | 2009-2010 | – |
| 21 | Sabir Rüstəmxanlı (yaradıcılığı əsasında) | 2006-2007 | 2012 |
| 22 | Musa Ələkbərli (yaradıcılığı əsasında) | 2010-2012 | 2013 |
| 23 | Alməmməd İsgəndərli (yaradıcılığı əsasında) | 2011-2012 | 2012 |
| 24 | Rüzgar Əfəndiyeva (yaradıcılığı əsasında) | 2012 | 2012 |
| 25 | Hacı Soltan Əlizadə (həyat və yaradıcılığı əsasında) | 2018-2020 | 2021 |

# MÜNDƏRİCAT

